# AZƏRBAYCAN KLASSİK ƏDƏBİYYATINDAN SEÇMƏLƏR

ÜÇ CİLDDƏ

I CİLD

**VII-XII ƏSRLƏR AZƏRBAYCAN ŞERİ**

"ŞƏRQ-QƏRB"
BAKI-2005

*Bu kitab “Azərbaycan klassik ədəbiyyatı kitabxanası.*
*VII-XII əsrlər Azərbaycan şeri. İyirmi cilddə. II cild”*
(*Bakı, Elm, 1989*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edənlər: **Əziz Mirəhmədov**
**Səfiyyə Xanbabayeva**

İzah və qeydlərin müəllifləri: **Teymur Kərimli**
**İmamverdi Həmidov**

Redaktoru: **Azadə Rüstəm**

Mənzum tərcümələrin redaktoru: **Xəlil Rza**

**- dc 21**
**AZE**

**Azərbaycan klassik ədəbiyyatından seçmələr. VII-XII əsrlər Azərbaycan şeri.** Üç cilddə. I cild. Bakı, “Şərq-Qərb”, 2005, 424 səh.

Kitabda Azərbaycan klassik poeziyasının 500 illik bir dövrünü əhatə edən poetik əsərlərdən nümunələr toplanmışdır. Əsasən lirik və ictimai-siyasi şeirlərdən ibarət olan bu əsərlər ərəb və fars dillərindən tərcümə edilmişdir. Nümunələr seçilərkən bu dövr Azərbaycan poeziya məktəbini fərqləndirən xüsusiyyətləri özündə birləşdirən şeir parçlarına üstünlük verilmişdir. Təqdim olunan nümunələrə yüksək estetik meyarla yanaşı, dərin humanizm və ictimsai pafos da xasdır.

XI-XII əsrlərin fəlsəfi lirikasını yaratmış Qətran Təbrizi, Fələki Şirvani, Mücirəddin Beyləqani, Məhsəti Gəncəvi, Xaqani Şirvani, Nizami Gəncəvi və b. yaradıcılığından verilən tərcümələr cildi zənginləşdirir, ona əlvanlıq qazandırır.

**ISBN 9952-418-52-0**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## VII-XII ƏSRLƏRDƏ AZƏRBAYCAN ŞERİ

VII əsrin 40-cı illərindən Azərbaycan üzərinə müntəzəm hərbi yürüşlər təşkil edən ərəb xilafəti VIII əsrin 30-cu illərində bu ölkəni tamamilə öz hökmranlığı altına aldı. Öz hakimiyyətlərini möhkəmlətmək üçün yeni dini ideologiya gətirmiş ərəblər Azərbaycanın müxtəlif dinli əhalisinə islamı qəbul etdirməklə, bir növ əhalinin etnik birliyinin sürətlənməsinə və möhkəmlənməsinə şərait yaratmış oldular. Vahid, güclü imperiya tərkibində feodal çəkişmələrindən və digər xarici müdaxilələrdən, müvəqqəti də olsa, yaxa qurtarmış Azərbaycanda ictimai həyatın başqa sahələri ilə yanaşı, mədəniyyətin və ədəbiyyatın inkişafı üçün də müəyyən imkanlar yarandı. VII-XI əsrlərdə yaşayan Azərbaycan şair və mütəfəkkirləri ümumi islam mədəniyyəti daxilində ərəbcə yazıb-yaratsalar da, bu, Azərbaycan ədəbiyyatının gələcək inkişafı üçün təsirsiz qalmadı.

VII-IX əsrlərdə baş vermiş arasıkəsilməz üsyanlar, xüsusən məşhur Babək hərəkatı nəticəsində zəifləyib laxlamış islam imperiyası IX əsrin sonlarından etibarən get-gedə Azərbaycanda ancaq öz nominal hakimiyyətini saxlaya bilir. Bu dövr Azərbaycanında Məzyədilər (861-1027), Sacilər (879-930), Salarilər (X-XI əsrlər), Rəvvadilər (979-1054), Şəddadilər (971-1086) kimi əslində müstəqil olan feodal dövlətləri meydana çıxır. Bütün bunlar mədəniyyət və ədəbiyyatın da başqa, əvvəlkindən fərqlənən yolla inkişaf etməsinə imkan yaradır.

1054-cü ildə Azərbaycanın Səlcuqilər dövləti tərkibinə daxil olması elmin, incəsənətin və ədəbiyyatın inkişafına təkan verərək bir sıra görkəmli sənətkarların meydana çıxmasına şərait yaratdı. Bu işdə Azərbaycan atabəylər dövlətinin (1136-1225) müstəsna rolunu da unutmaq olmaz.

Əlverişli coğrafi mövqeyinə görə dünyanın bir çox ölkələrinin iqtisadi-ticarət əlaqələrinin kəsişmə nöqtəsində duran Azərbaycan eyni zamanda əsrlərdən bəri dürlü mədəniyyətlərin, ədəbiyyatların qovuşma nöqtəsi olmuşdur. Təsadüfi deyil ki, zəngin folklor ənənələri ilə seçilən bu ölkə X əsrin sonu, XI əsrin əvvəlindən başlayaraq yazılı ədəbiyyat sahəsində də Yaxın və Orta Şərq regionunda mərkəzi yerlərdən birini tutmağa, öz orijinal ideya-bədii xüsusiyyətlərini başqa ədəbiyyatlara təlqin etməyə başlamışdı. XII əsrdə həmin təkamülün təbii nəticəsi kimi Nizaminin bədii dühası yarandı və sonrakı ədəbi inkişafa əsrlər boyu qüvvətli müsbət təsir göstərdi.

XI-XII əsrlər Azərbaycanındakı ədəbi yüksəlişi çox mürəkkəb iqtisadi-ictimai və mədəni şərait, klassik şəxsiyyətlər yaratmışdı. “Azərbaycan poeziya

məktəbi” adı ilə məşhur olan bu dövr ədəbiyyatının formalaşması və inkişafını Qətran Təbrizi, Məhsəti Gəncəvi, Xaqani Şirvani, Fələki Şirvani, Mücirəddin Beyləqani və nəhayət, Nizami Gəncəvi kimi klassiklər müəyyən etmişlər.

Bu poeziya məktəbi əsrlər boyu Azərbaycanda ana dilində yaranmış zəngin şifahi xalq ədəbiyyatına, Yaxın və Orta Şərq ədəbiyyatına, habelə antik ədəbiyyat ənənələrinə əsaslanırdı. VII-VIII əsrlərdə yaranmış və ənənələri XII əsrə qədər gəlib çıxmış ərəbdilli Azərbaycan ədəbiyyatının da nüfuzu böyük idi.

Məlumdur ki, ərəblər istila etdikləri xalqların yazılı abidələrini saf-çürük edir, əsasən tarixi xronikaları öz dillərinə çevirir, qalanlarını isə məhv edirdilər. Məsələn, məşhur sasani xronikası “Xudaynamə”nin başına məhz belə bir iş gəlmişdi. Ərəb dilinə tərcümə ediləndən sonra əsərin orijinalı yandırılmışdı. Bədii əsərlərə gəlincə, ərəblər onlara o qədər də meyl göstərmirdilər. Maraqlıdır ki, yunan fəlsəfəsinə aid çoxlu əsərlər ərəb dilinə tərcümə edildiyi halda zəngin yunan bədii ədəbiyyatından bir nümunə belə çevrilməmişdi.

Güman etmək olar ki, ərəb istilasına qədər Azərbaycan yazılı ədəbiyyatının da müəyyən abidələri olmuş, lakin onlar məhv edilərək bizə gəlib çatmamışdır. Hər halda azərbaycanlı şairlərin ərəb dilində yazdıqları ilk şeirlərə VII əsrin sonu, VIII əsrin əvvəllərindən etibarən təsadüf etmək olur. Müxtəlif ərəb qəbilələrinin mavlası (azad əsiri) olan və “Əl-Azərbaycani” nisbəsi ilə yazıb-yaradan bu şairlərin əsərlərindən bəzi örnəklər məcmuələrdə dövrümüzə gəlib çatmışdır.

VII-VIII əsrlərdə Mədinədə və Məkkədə yaşayıb-yaratmış Azərbaycan şairlərindən Əbu Məhəmməd ibn Bəşşar, Musa Şəhəvat və İsmayıl ibn Yəsarın şeirləri mübariz, tənqidi ruhu, orijinal sənətkarlıq xüsusiyyətləri ilə o dövr ərəb poeziyasından müəyyən dərəcədə seçilir. Bunu mütəxəssislər də təsdiq edirlər: “VII-VIII əsrlərdə yaşayıb-yaratmış və məvali şairlər adı altında ədəbiyyat tarixinə daxil olmuş Musa Şəhəvat, İsmayıl ibn Yəsar və Əbül-Abbas əl-Əma kimi azərbaycanlı şairlər ərəbdilli poeziyanın inkişafına xeyli kömək etmişlər. Bununla yanaşı onlar öz xalqlarının bədii və fəlsəfi təfəkkürü ilə bağlı olmuşlar. Onların yaradıcılığı sübut edir ki, Azərbaycan xalqının həmin dövrdəki bədii təfəkkürü digər müsəlman xalqlarının mədəni səviyyəsindən heç də geri qalmamış, bir çox millətlərin birgə səyi nəticəsində meydana gəlmiş ərəbdilli poeziyanın yeni keyfiyyətlər kəsb etməsində, forma və məzmunca dərinləşməsində, ictimai və siyasi həyata dərindən nüfuz etməsində öz faydasını əsirgəməmişdir. Azərbaycanlı ruhu, azərbaycanlı təfəkkürü, azərbaycanlı zövqü ərəbdilli ədəbiyyata daxil olaraq bu ədəbiyyatın mövzuca genişlənməsinin əsas amillərindən birinə çevrilmişdir”[1].

---

[1] Mahmudov M. VII-XII əsrlərdə ərəbcə yazmış Azərbaycan şairləri. Bakı, Elm, 1983, s.76.

Ərəb dilində bədii əsərlər yazmaq ənənəsi Azərbaycan şairləri arasında XI əsrə qədər, yəni Qətran Təbrizinin yaradıcılığa başladığı dövrədək davam etmişdir. X-XII əsrlərdə Azərbaycan ədəbiyyatında bu poeziyanı Bərakəveyh Zəncani, İskafi Zəncani, Xəttat Nizami Təbrizi, Əbu Nəsr Mənsur Təbrizi, Xətib Təbrizi, Məsud ibn Namdar, Ömər Gənci kimi şairlər təmsil etmişlər. Həmin Azərbaycan şairləri klassik ərəb poeziyasına xas olan məcazlar sistemini işlətməklə yanaşı, yeri düşdükcə doğma vətənlərinin rəngarəng təbiətini, mərd, yenilməz insanlarını da təsvir etmişlər ki, bu da onların əsərlərinə müəyyən milli kolorit gətirmişdir.

Çoxu Mədinə, Bağdad və b. şəhərlərdə yaşayıb-yaratmış Azərbaycan şairlərinin yaradıcılığında əsas motivlərdən biri vətən həsrəti olmuşdur. XII əsr şairi Ömər Gəncinin yazdığı aşağıdakı parça bunun səciyyəvi nümunəsidir:

Sürüb dəvələrini mənim yurduma çatsan,
Dostlarıma, unutma, məndən yetir bir salam.
Bu dərdə dözməyimdən, ayrılıq əzabından –
Danış bir-bir onlara, mən necə xəstəhalam.

Söylə ki, onları mən hər yadıma saldıqca –
Gəlib keçir gözümdən bir də o günlər tamam.
Ətirli meh əsdikcə səhər dost diyarından,
Qəlbim yarpaq tək əsir, tapmır bir ləhzə aram.

Qətran Təbrizi yaradıcılığı ilə Azərbaycan poeziya məktəbi yeni inkişaf mərhələsinə qədəm qoydu. Bu mütəfəkkir şair farsdilli Azərbaycan poeziyasının ilk görkəmli nümayəndəsidir.

Farsdilli Azərbaycan poeziyası dedikdə, sadəcə olaraq, coğrafi sərhədlərlə məhdudlaşan bir ədəbi hadisə yox, öz ideya-estetik əsası və təkraredilməz xüsusiyyətləri ilə seçilən müstəqil, orijinal ədəbi məktəb nəzərdə tutulur.

Təbriz yaxınlığındakı Şadiabad qəsəbəsində mülkədar ailəsində anadan olmuş Qətran gənc yaşlarında şairliyə başlamış, az bir zamanda istedadlı sənətkar kimi məşhurlaşaraq saraya dəvət edilmişdir. Müxtəlif hökmdarların mədhinə həsr olunmuş qəsidələr Qətran divanının əsas hissəsini təşkil edir. Lakin bu onun bədii-estetik dəyərini heç bir şəkildə azaltmır. Xüsusilə ona görə ki, divanda Qətranın yaşayıb-yaratdığı tarixi dövrün bir sıra ictimai-siyasi hadisələri çox dəqiq əksini tapmışdır. Şairin iki Azərbaycan hökmdarı – Əbül Həsən Ləşkəri və Əmir Cəfər arasında barışıq münasibəti ilə yazdığı qəsidə bu cəhətdən çox səciyyəvidir. Bu əsərlərdə Qətranın vətənsevər düşüncələri və yüksək hissləri diqqəti cəlb edir. Qətran xarici müdaxiləçilərə layiqli cavab verə biləcək, vahid, güclü Azərbaycan arzusundadır, buna görə də əmirlər arasındakı adi bir saziş, barışıq belə onu sevindirir, ümidlərini qüvvətləndirir.

Qəsidələrin nəsib (giriş) hissəsində Qətran sənətkarlığı daha parlaq şəkildə meydana çıxır. Əsasən baharın təsvirinə aid olan bu hissələrdə şair hər dəfə yeni-yeni bədii təsvir vasitələri tapır, dar bir mövzu çərçivəsində vurduğu təkrarsız naxışlarla oxucunu heyran qoyur. Qətran vəsfdən müxtəlif hadisə və məfhumların geniş təsvirində istifadə edir. Bu cəhətdən baharın mozaika təsiri bağışlayan rəngarəng təsviri xüsusilə seçilir:

Eyləyir dünyaya fərvərdin[1] yeli hər dəm səfər,
Eylədikcə hər səfər dünyaya o çalmış zəfər.

Eyləyir bülbül fəğan gülşəndə hər saət yenə,
Nazlanır güllər baxıb gördükcə hər dəm nalələr.

Tutiyə bənzər şəqayiq dimdiyində qır tutub,
Suri zərdir, üstünü qıpqırmızı tozlar bəzər.

İldırım şimşək çaxar daim buludlar oynaşar,
Sanki zənci ordusu tatar görüb xəncər çəkər.

Bənzəyir bağlarda nərgiz bütlərin əllərinə,
Qol-bilək mina tamam, ovcu hənadır sərbəsər.

Göl külək əsdikcə bənzər köksünə şahinlərin,
Sanki tovuzdur, qızılgül, bağda açmış balü pər.

Qətran Təbrizinin rubailərində məhəbbət lirikası daha qüvvətlidir. Maraqlıdır ki, bu rübailərdə bədii zəmin kimi ondan əvvəlki fars poeziyasından daha çox Azərbaycan şifahi xalq ədəbiyyatının təsiri nəzərə çarpır. Qətran divanındakı rübailərdə aparıcı meyl fəlsəfi asketizm deyildir. Bu əsərlər vəzninə və bədii təsvir vasitələrinə görə rübai adlansalar da, ideya və sənətkarlıq cəhətdən bizim bayatılara daha yaxındır. Bayatılarda olduğu kimi, bu rübailərin çoxunda da əsas poetik fikir son iki misrada verilir.

Ey hüsnü gözəllər qibləsi olan,
Ürəyin ürəyi, ruha, cana can.
Dedim ürək verib almışam səni –
Yox, canımı versəm, yenə ucuzsan.

Azərbaycan xalqının təfəkkür tərzi Qətranın əsərlərində silinməz izlər buraxmış, şair yeri gəldikcə çoxlu türk sözləri işlətmişdir. “Çuval”, “cinağ”, “bəkməz”, “tağ”, “yun”, “dağ”, “ayaq” və s. türk sözləri Qətranın bədii

[1] Fərvərdin – İran günəş təqviminin birinci ayı (21 mart – 20 aprel).

leksikonunda xüsusi diqqəti cəlb edir. Şair bəzən ərəb və fars dillərində lazım olan qafiyəni tapmaqda çətinlik çəkərkən öz ana dilinə müraciət edir. Mübaliğəsiz demək mümkündür ki, Qətran poeziyasının spesifik dili azərbaycanca düşünüb farsca yazan bir sənətkarın dilidir. Bu xüsusiyyət, ümumiyyətlə, farsdilli Azərbaycan poeziyası üçün səciyyəvidir.

XI əsrdə Azərbaycanda yaşayıb-yaratmış ərəbdilli Azərbaycan şairləri haqqında az məlumat qalmış, onların əsərlərindən yalnız ayrı-ayrı nümunələr Əbül-Həsən əl-Baxərzinin "Dumyat əl-qəsr və usrat əhləl-əsr" məcmuəsində qorunub saxlanmışdır[1].

XI əsrin ikinci yarısından etibarən Zaqafqaziyanı fəth edən səlcuqilər farsdilli poeziyanın inkişafı üçün yeni şərait yaradırlar. "İlk baxışda nə qədər təəccüblü görünsə də, səlcuqların gəlişi fars ədəbi dilinin Zaqafqaziyada yayılmasına kömək göstərirdi"[2]. Y.E. Bertels bu hadisəni onunla izah edir ki, səlcuq hökmdarlarının öz dövlət aparatları olmadığına görə, işğal etdikləri ölkənin dövlət aparatını və bütövlükdə saray adət-ənənəsini qoruyub saxlamağa məcbur olmuşdular. Saray şairləri və saray ədəbiyyatı da bu ənənənin ayrılmaz hissələrindən biri idi.

XII əsrdə Azərbaycan ədəbi məktəbinin bir sıra parlaq siması yetişir. Bunların sırasında Şihabəddin Sührəvərdi və Eyn-əl-Quzat Miyanəci kimi sufi şairlər, Əbül-üla Gəncəvi, Məhsəti Gəncəvi, Fələki Şirvani, İzzəddin Şirvani, Mücirəddin Beyləqani, Qivami Mütərrizi, Xaqani Şirvani kimi saray şairləri və azad sənətkarlar var idi.

Əlbəttə, birinci iki şairin sufi adlandırılması heç də qalanlarının sufizmdən büsbütün kənar olduqları demək deyil. O dövrdə sufizm o qədər qüvvətli fəlsəfi-estetik cərəyan idi ki, sənətkarların çoxu bu və ya digər dərəcədə onun təsirinə qapılırdılar. Həm də nəzərə alınmalıdır ki, bizim çox vaxt düşündüyümüz kimi, sufizm yalnız tərkidünyalıq və mütilik təbliğ edən dini-mistik cərəyan deyildi – bu əlamətlər çox vaxt sufizmin ayrı-ayrı mütərəqqi qolları üçün zahiri, formal pərdə rolunu oynayırdı.

Qaba yun paltar – kəpənək geyib asketik həyat sürən və asketik görüşlər təbliğ edən sufilərdən başqa bir də fikir sufiləri – filosof şairlər var idi. Bəzən ən mütərəqqi fikirlər sufizm məcazları, rəmzləri vasitəsilə təmsil edilirdi. Təsadüfi deyil ki, mütərəqqi sufizm həmişə ortodoks islamla müxalifətdə olmuş, mürtəce, mühafizəkar ruhanilər imkan düşdükcə mütərəqqi görüşlü sufilərə divan tutmuşlar. Buradan belə bir məntiqi nəticə çıxır ki, sufizmin mütərəqqi qoluna mənsub olanlar eyni zamanda hakim siniflərlə də müxalifətdə olmuşlar. Azərbaycan filosofu və şairi Eyn əl-Quzat Miyanəci də məhz öz kəskin sufiyanə çıxışlarının qurbanı olmuş, 32 yaşında vəhşicə-

---

[1] Mahmudov M. Göstərilən əsəri, s.84-85.

[2] Бертельс Е.Э. Низами и Физули. – М., 1962, с.34.

sinə öldürülmüşdür. Zəmanəsinin görkəmli filosoflarından biri kimi tanınan Eyn əl-Quzatın həm də yüksək şairlik istedadı olmuş, şeir texnikasında, məcazların işlənməsində, lirik hisslərin və təbiət lövhələrinin təsvir və tərənnümündə öz müasirlərindən xeyli seçilmişdir.

XII əsr Azərbaycan poeziya məktəbinin güclü bir qolu Şirvanşahlar sarayında yaranıb, Xaqani kimi böyük sənətkar yetirmişdir. Bu qolun əsasını qoyanlardan biri Əbül-Üla Gəncəvidir.

Əbül-Üla gözəl şair olmaqla yanaşı, bacarıqlı ustad – müəllim kimi bir çox istedadlı sənətkarların yetişib boya-başa çatmasına şərait yaratmışdır. Şirvanşahlar sarayının "məliküşşüəra"sı (şairlər padşahı) vəzifəsinə qədər yüksəlmiş Əbül-Üla Gəncəvinin divanı bizə gəlib çatmasa da, əldə olan nümunələrə əsasən onun şeir sənətində yüksək məharət göstərdiyini təsdiq edə bilərik.

Müxtəlif məxəzlərdə bizə natamam bir qəsidəsi və bir rübaisi gəlib çatmış şairlərdən biri də İzzəddin Şirvanidir. Qəsidədən göründüyü kimi, İzzəddin təbiət lövhələri yaratmaqda, orijinal poetik məcazlar tapmaqda müasirlərindən geri qalmamışdır. İzzəddin Şirvaninin şeri sənətkarlıq cəhətdən, gözlənilməz bədii fikir söyləmək baxımından daha maraqlıdr:

Kuyində fələk dün gecə görcək məni sordu:
"Kim saldı səni bu hala? Dur bir mənə göstər".
"Yarın o xumar gözləri" – dindim. Dedi: "Heyhat!
Pis sərxoş olublar, səni, qaç, öldürəcəklər".

XII əsr Azərbaycan poeziya məktəbinin Şirvan ədəbi birliyinə (əgər belə demək mümkünsə) daxil olan istedadlı şairlərdən biri də Fələki Şirvanidir. Xaqani ilə təxminən yaşıd olsalar da, sənətdə onun şagirdi olmuşdur. Bunu Xaqani özü Fələkinin ölümünə yazdığı mərsiyədə qeyd edir.

Əbül-Üla Gəncəvidən və İzzəddin Şirvanidən fərqli olaraq, Fələki irsindən daha çox bədii nümunə bizə gəlib çatmış, onun "Divan"ı Londonda və Tehranda nəşr edilmişdir. Şirvan sarayında yaşayıb-yaradan şairlərdən çoxunun acı qisməti – həbsxana Fələkini də bir müddət öz qoynunda "bəsləmiş", bir sıra qəmli şeirlərin meydana çıxmasına səbəb olmuşdur. Şairin həbsxanada əzab-əziyyət çəkdiyi "Nist" ("Deyil") rədifli şerindən də bu aşkar görünür.

Ümumiyyətlə, Şirvan sarayında yaranmış şikayətnamələri nəzərdən keçirdikdə belə qənaətə gəlmək olur ki, burada sənətin inkişafı və sənətkarın əmin-amanlığı üçün o qədər də sağlam mühit olmamışdır. Əlbəttə, bunu, mütəxəssislərin çox vaxt izah etdikləri kimi, yalnız şairlərin bir-birinə qarşı həsəd və paxıllığı ilə aydınlaşdırmaq doğru olmazdı. Güman ki, şairlərin əzab və məhrumiyyətlərə məruz qalmasının əsas səbəbi yüksək mənsəbli feodal ağalar imiş. Onların başında vəzir olması da ağlabatandır (Nizaminin "Yeddi

gözəl" poemasındakı məşhur Rast-Rövşəni yada salaq). Hər halda Fələkinin və Xaqaninin həbs olunmaları, Əbül-Ülanın isə belə bir təhlükəyə məruz qalması feodal sarayları üçün səciyyəvi hadisə idi və təzkirələrin yazdığına görə, belə bir "şərəfə nail olmaq" qorxusunu vaxtilə Məhsəti xanım da keçirmişdi.

Təzkirələr Məhsəti Gəncəvinin Sultan Səncər (1118-1157) sarayında yaşayıb-yaratdığını göstərirlər. Lakin indinin özündə belə, bu şair haqqında bioqrafik məlumatlar yox dərəcəsindədir. Məhsəti Gəncəvinin rübailərində orta əsrlərin qabaqcıl bədii təfəkkürü səviyyəsində bir sıra fəlsəfi fikirlər və intim hisslər incə bir sənətkarlıqla öz əksini tapmışdır. Bəzən Məhsəti Gəncəvinin rübailərini Şərqin nəhəng simalarından biri olan Ömər Xəyyamın eyni janrda yazılmış əsərləri ilə müqayisə edirlər. Doğrudur, Məhsəti yaradıcılığında bu ruhda bir neçə rübai vardır, lakin onların əsas hissəsi Qətran Təbrizinin və İzzəddin Şirvaninin yuxarıda nəzərdən keçirdiyimiz rübaisi ilə həmahəngdir və XII əsr Azərbaycan poeziya məktəbinin aydın seçilən möhrünü öz üzərində gəzdirir.

Mücirəddin Beyləqani Eldəgizlər sarayında yaşamış, öz qəsidə, qəzəl və rübailərini bu sarayın hökmdarlarına həsr etmişdir. Şirvanşahlar sarayından fərqli olaraq, bu saraydakı şairlər nisbətən sakit ömür sürmüş, hətta Nizaminin yazdığı kimi, "Gecədə yüz xəzinə" almışlar. Buna baxmayaraq, Eldəgizlər sarayında Mücirəddin Beyləqani kimi bir şairə də böhtan atılmış, onu dövlət sirrini açmaqda təqsirləndirmişlər. Şairin aşağıdakı beytləri bu hadisəyə işarə edir:

Məni cahan tanıdı xidmətində, ey şahım!
Ağıllılar arasında adım olub əzbər.
...Mən olmadımsa əgər xidmətində bir neçə vaxt, –
Demək deyildi ki, ruhum dəxi uzaqda gəzər.
Uzaq atan məni şahın soyuqluğu oldu,
O nazənin ürəyin, var güman, yenə isinər.

Xoşbəxtlikdən məsələ tez aydınlaşdırılmış, həbsiyyə şeirləri yazmağa ehtiyac qalmamışdır.

Mücirəddin Beyləqani "Divan"ı, demək olar ki, tam şəkildə dövrümüzə qədər gəlib çatmış, əsərin tənqidi mətni 1979-cu ildə bir neçə əlyazma nüsxəsi əsasında Təbrizdə nəşr edilmişdir.

XII əsr Azərbaycan poeziya məktəbinin nümayəndələrinə xas olan yüksək şair professionallığı, sözün poetik imkanlarından maksimum istifadə, poetik vahidlərdə özünə möhkəm yer tutmuş fikir çoxmənalılığı və b. k. xüsusiyyətlər Mücirəddin Beyləqani yaradıcılığına da yad deyildir. Bu məktəbin əlamətlərindən biri də xalq sənətinə, folklor surətləri və ifadələrinə, aforizimlərə güclü meyldir. Saysız-hesabsız nümunələrlə təsdiq oluna

biləcək bu fikri Mücirəddin Beyləqani yaradıcılığından gətirdiyimiz bir beytlə əyanilәşdirmək olar:

Diləklə bir kəsə vəslin sənin nəsib olmaz –
Olarmı ağzı şirin, kim ki, hey şəkər düşünə?

Öz müasirləri kimi Mücirəddin Beyləqani də incə poetik tapıntı – nüktə yaratmağın ustasıdır. Şairin "Divan"ı başdan-başa belə nümunələrlə doludur.

Klassik ədəbiyyatda əsrlər boyu istifadə olunan ənənəvi poetik obrazlar Mücirəddin yaradıcılığında hər dəfə yeni rəngdə, yeni çalarda çıxış edir, yeni baxımdan mənalandırılır, buna görə də həmişə təzə, canlı görünür. Bu cəhət ümumiyyətlə, XII əsr Azərbaycan ədəbi məktəbinə xasdır.

Zəmanədən, dünyadan şikayət, qeyri-müəyyən gələcək qarşısında çaşqınlıq hissindən doğan bədbinlik bu dövr şairlərinin yaradıcılığında özünü göstərən motivlərdəndir. Məhz bu motivin təsiri ilə böyük Nizami bir az sonra "Ölmüşlərlə doğulmamışları" zəmanənin ən xoşbəxt adamları hesab edəcək.

Hər cür şərin banisi olan fələk obrazı Mücirəddin şeirlərində xüsusi parlaq boyalarla təsvir edilir: Ulduzları bir çıraq kimi əlində tutub hər yeri dolaşan, azacıq xoşbəxtlik əlaməti gördüyü hər bir yeri xarabazara döndərən bu qoca yalquzaq hələ heç kimə kamınca yaşamaq səadəti nəsib etməmişdir. Ondan belə bir payı ummaq da sadəlövhlük, ağılsızlıq əlamətidir.

Xaqani yaradıcılığı XII əsr Azərbaycan ədəbi məktəbinin zirvələrindən biridir. Xaqani poeziyası lirik-fəlsəfi şerin nailiyyətlərinin yekunu, Nizami dühasının epik-romantik zirvəsinə keçid mərhələsidir. Bu poeziya həm ideya istiqamətinə, ictimai motivlərinin dərinliyinə, həm də bədii keyfiyyətlərinə görə Nizamiyə qədərki şerin ən yüksək mərhələsini təşkil edir.

Azərbaycanın qədim mədəniyyət mərkəzlərindən biri olan Şamaxıda doğulmuş Əfzələddin Bədil Əli oğlu Xaqani mürəkkəb, ziddiyyətli bir yaradıcılıq yolu keçmişdir. Öz dövrünün görkəmli alimlərindən olan əmisi Kafiəddin Ömər ibn Osmanın rəhbərliyi altında mükəmməl təhsil almış Xaqani çox gənc yaşlarından yaradıcılığa başlamış, əmisinin arzusuna uyğun olaraq Həqayiqi təxəllüsü ilə şeirlər yazmışdır. Müasirləri olan Azərbaycan şairləri kimi Xaqani də poeziyasını Xorasan ədəbi məktəbinin Ünsüri, Sənai kimi nümayəndələrinin yaradıcılığı ilə müqayisə etsə də, əslində bu məktəbdən tamamilə fərqlənən, ideya-estetik xüsusiyyətlərinə görə Yaxın və Orta Şərqdə bənzərsiz bir şeir məktəbinin yaradılmasında fəal iştirak edənlərdən biri idi.

Xaqani yaradıcılığında diqqəti ən çox cəlb edən cəhət hər beytdə, hər misrada özünü göstərən dərin elmilikdir. Həm də bu elmilik quru, yorucu bir dildə yox, şirin, cazibədar poeziya dili ilə təqdim edilir. Dövrünün elmlərini

dərindən bilən Xaqani bəzən incə bir eyhamla elmi dünyagörüşü ilə islam dünyagörüşünü qarşılaşdırır. Azərbaycan ədəbiyyatında ilk poema sayılan "Töhfətül-İraqeyn" əsərində bu cəhət daha əyani şəkildə əksini tapmışdır. Şair Xızrın dili ilə qədim yunan fəlsəfəsinə "münasibətini" bu cür ifadə edir:

De, nə vaxta qədər sən belə heyran
Çürük fəlsəfədən dəm vuracaqsan?
Əslinə baxanda "fəlsəfə" sözü
"Səfeh" kəlməsinə yaxındır düzü:
Ayrı bir mənası olmamış dərin –
Quranın, danılmaz bu hədislərin –
Qabağında yəqin anlayar hər kəs,
Yunan fəlsəfəsi bir yuna dəyməz.

Sonralar eyni ədəbi fəndi Nizami də işlədəcək, mömin Bişrin Qurana istinadən gətirdiyi "təkzibedilməz dəlillərlə" Məlixanın elmi müddəalarını rədd edəcək. Əlbəttə, bu halda Xaqani, yaxud Nizaminin məhz hansı tərəfdə durduqlarını qəti söyləmək çətindir, lakin əsas məsələ bunda deyildir: ondadır ki, hər iki mütəfəkkir axtarır, şübhə edir, sxolastik çərçivəni laxladıb "tozsuz pəncərədən günəşə" (Nizami) tərəf boylanırlar. Elə bu dərin skeptisizm də məntiqi cəhətdən Xaqaninin zəmanədən narazılığını əsaslandırır. Şəxsi həyatındakı uğursuzluğun bu narazılığa müəyyən təsiri olsa da, bunun başlıca motiv olduğunu düşünmək sadəlövhlükdür. Xaqaninin zəmanəyə qarşı dərin məzəmmətlə dolu misralarını oxuduqca istər-istəməz düşünürsən ki, o, Şirvan zindanlarından olmazın əzab-əziyyətlər çəkməsəydi belə, tez-tez əzizlərini itirməsəydi belə, zəmanə ilə "düşmənçiliyindən" əl çəkməyəcəkdi. Yaradıcılığındakı bu motivlərə görə Xaqani mütərəqqi sufilərə çox yaxınlaşır. "Fələyi yıxmaq üçün göylərə nərdivan tapmayan" şair əlacı "başını ayaq edib qaçmaqda", yəni mənəvi asketizmdə görür.

Qəsidə və məsnəvilərində əsasən ictimai ittihamçı olan Xaqani qəzəllərində hər şeydən əvvəl lirikdir. Xaqani həm də qəzəli müstəqil janr kimi formalaşdıran ilk şairlərdən biri sayılır.

Xaqani qəzəllərinin təhlilinə yüksək estetik meyarla yanaşmaq lazımdır. Şair gözlənilməz poetik tapıntılarla, obrazlarla təkraredilməz gözəllik yaradır və bu gözəlliklə də oxucunu heyrətləndirir. Eyni zamanda nəzərə almaq lazımdır ki, bu, yoluxucu heyrətdir – yəni şair özü gözəllikdən heyrətlənmiş və bunu o qədər gözəl təsvir, tərənnüm etmişdir ki, oxucunu da ovsunlayır. Klassik poeziyada "yaralı sinə" obrazı çox işlənib. Lakin Xaqaninin bu obraza yanaşma üsuluna hələ heç kəsdə təsadüf edilməmişdir: yar aşiqin sinəsini öz kirpikləri ilə deşir. Bu işdən onun məqsədi o deyil ki, aşiqin əzab-əziyyətindən zövq alsın, əksinə, o, aşiqini lazımınca yüksək qiymətləndirdiyindən onun sinəsini qiymətli inci hesab edir. İncidə isə, təbiidir ki, deşik açarlar.

Xaqaninin özündən sonrakı Yaxın və Orta Şərq, eləcə də Azərbaycan şairlərinə çox böyük təsiri olmuşdur. Xaqani ideyaları, fikirləri, Xaqani obrazları yaradıcılıqdan yaradıcılığa uzun müddət səyahət etmiş, neçə-neçə sənətkarın yazı üslubunu müəyyənləşdirmişdir. Təkcə onu göstərmək kifayətdir ki, Nizami kimi nəhəng mütəfəkkir-şair belə Xaqani poeziyasının nüfuzedici təsirindən müsbət mənada yaxa qurtara biməmişdir. Bu isə təbii idi. Eyni ədəbi məktəbin nümayəndələri nə qədər orijinal olsalar da, haradasa ümumilik təşkil etməli, hansı bir nöqtədəsə kəsişməli, fikir, obraz işlətmək məqamında səsləşməlidirlər.

Ümumiyyətlə, bu dövr şairlərinin yaradıcılığına xas olan incə yumor, eyham Xaqani poeziyasını da fərqləndirir. Ara-sıra diqqəti cəlb edən bu cizgilər şairin yaradıcılığında özünü müəyyən dərəcədə göstərən bədbinliyin tutqun rənglərini açır, onu bir qədər yumşaldır. Nizami yaradıcılığında olduğu kimi, Xaqani şeirlərindəki yumordan da folklor yumorunun ətri gəlir desək, səhv etmərik. Təsadüfi deyil ki, şair bu məqsədlə atalar sözü və məsəllərdən geniş istifadə edir. Məsələn:

Eşşəyə dedilər: "Buyur toya gəl",
Eşşək qəh-qəh çəkib güldü nəhayət.
Dedi: "Siz istəyən rəqqas deyiləm,
Nə də çalğıçı tək tapmışam şöhrət.
Hamballıq etməyə çağırırsınız,
Su, odun daşımaq lazımdır əlbət".

Təkcə Azərbaycan ədəbiyyatında deyil, eləcə də Yaxın və Orta Şərq regional ədəbiyyatında orijinal hadisə sayılan Xaqani sənətkarlığı XII əsrdən bəri şair və ədəbiyyatşünaslar tərəfindən sevilə-sevilə tədqiq və tərənnüm edilmiş, örnək qaynağı olmuşdur. Avropa şərqşünasları da böyük şairin heyrətamiz sənətkarlığına laqeyd qalmamışlar. XVII əsrin ikinci yarısından etibarən adı Avropa oxucusuna tanış olan Xaqani haqqında ilk elmi monoqrafiya da XIX əsrin ikinci yarısında Avropada yaranmışdır. Hazırda xaqanişünaslıq yeni inkişaf mərhələsinə çatıb müasir ədəbiyyatşünaslıq elminin tələbləri səviyyəsində dursa da, şairin tükənməz sənət xəzinəsində araşdırılmamış hələ çox inci qalıb.

Ayrı-ayrı ədəbi şəxsiyyətlərin yaradıcılığı, XI əsrin birinci yarısından formalaşmağa başlayıb, yüksələn xətlə XIII əsrə qədər gəlib çatan farsdilli Azərbaycan poeziya məktəbinin inkişaf yolu barədə bəsit də olsa, təsəvvür yaratmağa cəhd etdik.

Haqqında danışdığımız sənətkarların çoxu yalnız şair olmaqla qalmamış, yaşadıqları dövrün tələbləri əsasında bir çox elm sahələri ilə maraqlanmış, bir sözlə, sinkretik zəka sahibi olmuşlar. İstər Xaqani, istərsə də Nizami yaradı-

cılığında elə nümunələr tapmaq olar ki, onları oxuyanda düşünürsən: bu misraların müəllifi dövrünün görkəmli alimi olmuş, öz elmi ideyalarını gözəl poetik dillə şərh etmişdir. Eyn Əl-Quzat Miyanəci və Şəhabəddin Sührəvərdi kimi sufi filosoflar üçün isə bu sözləri müstəqim mənada işlətmək olar.

Orta əsr ərəb qəsidələrində olduğu kimi, Azərbaycan şairlərinin də bu janrda yaratdıqları mədhiyyələrin çoxu təbiətin və məşuqənin tərifi ilə başlanır, sonra müəllif əsl mətləbə keçib cəmiyyət məsələlərindən bəhs edir, təmtəraqla dövrünün hökmdarı yaxud başqa bir məşhur şəxs haqqında danışır, ondan səxavət gözləyir.

Müəyyən əlamətlərə malik olması heç də XII əsr Azərbaycan poeziya məktəbini ümumən Azərbaycan ədəbiyyatından ayırmır. Bu məktəblə genetik əlaqələr Həsənoğludan, Qazi Bühranəddindən, Nəsimidən, Füzulidən başlamış bu günə qədər bütün Azərbaycan ədəbiyyatında çox aydın nəzərə çarpır; bu məktəb sonrakı ədəbiyyat üçün ideya-obraz xəzinəsi rolunu oynayır. Onun ən böyük nailiyyəti Xaqani və Nizami yaradıcılığıdır. Bu iki nəhəngsiz isə Azərbaycan ədəbiyyatının sonrakı inkişafını təsəvvür etmək çətindir.

Fələki Şirvani və Mücirəddin Beyləqaninin irsindən azərbaycancaya xeyli şerinin tərcüməsi bu kitabda çap edilir.

XII əsrə aid bir neçə əsərin əvvəlki tərcüməsində bəzi yerləri üslubca redaktə etmək lazım gəlmişdir ki, bu işi də şair Xəlil Rza görmüşdür.

VII-X əsrlər ərəbdilli Azərbaycan şairlərinin əsərlərindən nümunələrin mənzum tərcüməsi isə ərəbşünas professor Malik Mahmudovun "Ərəbcə yazmış azərbaycanlı şair və ədiblər" (Bakı, 1983) kitabındakı filoloji tərcümələr əsasında hazırlanmışdır.

***Teymur Kərimli***

# D Ə V D Ə K

*Azərbaycan xalqının soy-kökündə dayanan albanlar* (*aranlılar*) *V-VIII əsrlərdə yüksək səviyyəyə çatmış bir mədəniyyət yaratmış və hətta Alban dili əsasında əlifba da düzəltmişdilər. VII əsrdə yaranmış zəngin Alban ədəbiyyatından bizə gəlib çatanlarsa Musa Kalankaytuklunun "Alban tarixi" əsərinə daxil edilmiş yalnız bir neçə hekayə, nağıl və şair Dəvdəkin ölkə hökmdarı Cavanşirin* (*616-681*) *xəyanət nəticəsində öldürülməsi münasibətilə yazdığı ağıdır.*

*Dəvdəkin həyatı və yaradıcılığı barədə məlumat azdır. Məlumdur ki, o, Cavanşirin sarayında yaşamışdır. Onun müasiri Musa Kalankaytuklu yazır: "Dəvdək dövrünün bütün elmlərinə bələd müdrik bir filosof, gözəl natiq və ustad şair idi. Cavanşirin ölüm xəbərini eşidən şair hökmdarın cənazəsi önünə gəlib, ona həsr etdiyi ağı – himnini əlifba sırası ilə oxumağa başladı". Otuz iki bənddən ibarət olan bu ağının məzmunundan görünür ki, əsər janr etibarilə qədim yunan, formaca isə akrostixlə* (*müşəvvəş*) *yazılmışdır; orijinalda onun birinci bəndi "a" hərfi ilə başlanır, sonrakı bəndlərdə isə hərf ardıcıllığına riayət olunur. Burada əsər şair Xəlil Rza Ulutürkün tərcüməsində verilir.*

## BÖYÜK HÖKMDAR CAVANŞİR ÜÇÜN AĞI

Ey ilahi kəlamları xəlq eyləyən ulu Tanrı,
Özün nəğmə – ağı söylə, yad et bizim hökmdarı.
Elə nəğmə – ağı qoş ki, bu əvəzsiz itki üçün
Gözümüzdən gecə-gündüz axsın odlu göz yaşları.

Çox böyükdür bu gündoğan ölkəmizi tutan kədər.
Yer üzünü başdan-başa bürümüşdür hönkürtülər.
Zülüm-zülüm qoy ağlasın mənimlə bir bütün bəşər.
Fəryadıma fəryad ilə haray versin qəbilələr.

Özülündən qopub getdi dağ gövdəli bir sal qaya.
Yıxıldı bir lay divar ki, adı divar, özü dünya.
Qüllələri göyə dayaq bir imarət sarsıldı, ah,
Dağıldı bir möhkəm qala, göz yaşımız döndü çaya.

Qara gəldi ağ günümüz, ələm, kədər dövran sürür.
Üstümüzə alay çəkir basqınçılar sürü-sürü.
Heyrət saçan bir dövləti xarabaya döndərdilər,
Möcüzə bir səltənətin çırağını söndürdülər.

Bizim yurda gələn bəla hansı bəla, hansı rüzgar?
İsayya* da qorxudaraq car çəkmişdi bir zamanlar.
Bayramımız yasa döndü,** kölgə düşdü qızıl xaça.
Şadlığımız göz yaşından batıb getdi, ey insanlar!

Geri dönməz itki üçün qazdırdılar dərin məzar.
Şərafətli bir keşişi qəbrə qoyub basdırdılar.
Dəfn etdilər fitnə-fəsad izlərini, cinayəti.
Arifləri azdırmaqçın qabıq qoydu o azğınlar.

Arslan kimi qüdrətliydi, o öz arslan yatağında,
Düşmənləri zağ-zağ əsər, donardılar qabağında.
Zəhmi ağır... ürəklərdə məhəbbəti dərya qədər.
Qüdrətinə baş əyərdi ağsaqqallar, başbilənlər.

Uzaq-uzaq ellərəcən yayılmışdı şan-şöhrəti,
Dünyalara ün salmışdı ləyaqəti, mərifəti.
Bütün cahan vəsf edirdi qüdrətini, əməlini.
Qaranlığa işıq salan ağıl, kamal məşəlini.

Tələsirdi Rum qeysəri, bir də Cənub hökmdarı,
Gələrdilər görmək üçün bizim ulu tacidarı.
Şərafətlə, səxavətlə, ən bahalı zər-zinətlə,
Qarşılardı, salamlardı onlar bizim bayraqları.

Bizi lapdan yaxaladı bu fəlakət, bu qan-qada.
Maymaq olmaq, aciz qalmaq nə yamanmış bu dünyada.
Axı neçin ölgünləşdik? Ulu Tanrı qəzəbləndi.
Böyük, şanlı bir dövləti "uf" demədən məhv elədi.

---

* İsayya – "Tövrat"da adı çəkilən peyğəmbərlərdən biridir, Xristosdan xeyli öncə yaşamışdır.

** "Bayramımız yasa döndü" deyirkən müəllif sentyabrın 6-da keçirilən müqəddəs xaç bayramını nəzərdə tutur. Cavanşir həmin gün öldürülüb.

Hökmdarı sədaqətlə hifz eləyən sadiq mələk
Elə bil ki, küsdü getdi, qəfildən üz döndərərək
Bu qanlı, bu uğursuz gün uzaqlaşdı ulu Yəzdan.
Hiyləgərin caynağında böyük insan tək qaldı, tək.

Öz satqınlıq kamanını düşmən çəkdi gecəyarı.
Fitnə-fəsad qılıncları parıldadı parıl-parıl.
Sanki qalxan bir günəşi yönəltdilər başqa səmtə,
Kimlər? Onun qullarının alçaq, rəzil balaları.

Aldatdılar, apardılar xəlvət yerə, uzaqlara.
Açdılar, tunc sinəsində neçə şırım, neçə yara.
Gecə gizli öldürülən mobidlər tək qətl olundu,
Görün kimlər qaldırdı əl o bahadır tacidara!

Atasından xəbərsiz, bic... zatıqırıq, özü gürzə.
Sürüm-sürüm qoy sürünsün, həsrət qalsın xoş bir üzə.
Qarğışlara, nifrətlərə, lənətlərə dözə-dözə,
Qoy sülənsin bü dünyada, Qabil kimi əsə-əsə.

Qaçmağa yol, riz tapmasın. Rüzgar qırsın inadını.
Başı üstə vəhşi quşlar şaqqıldatsın qanadını.
Dərələrin qarğaları cəmdəyinə daraşsın qoy,
Ağzı qanlı yırtıcılar udsun onun fəryadını.

Cəhənnəm tək od püskürsün qoy İroda* – dəhşətli çar.
Əmr etsin ki, ürəyində yuva salsın soxulcanlar.
Yandıraraq, söndürərək, öldürərək, dirildərək,
Didim-didim didsin onu kor əqrəblər, ac ilanlar.

Sınsın çürük ağac kimi sərkərdəyə qıyan alçaq.
İflic olsun o mərd üzü tapdalayan murdar ayaq.
Zəqqum, zərdab qanını qoy ac güvələr gəlib içsin,
Gəbərsin qoy, vəbalara, cüzamlara rast olaraq.

---

* İroda – İudey çarıdır, eramızdan əvvəl 40-cı illərdə Roma quldarlıq cəmiyyətinin başçılarından olmuşdur. "İroda odladı" dedikdə müəllif cəhənnəm odunu nəzərdə tutur. İroda İncildə "allahsız, xəsis" adlandırılır.

Bir gavalı ağacının seçmiş olsa kölgəsini,
İlan, əqrəb, çayan, hünü bürüsün dörd dövrəsini.
Qart qurbağa zigil atsın, qoca şahmar ağı töksün,
Şiş bürüsün əndamını, xərçəng kəssin nəfəsini.

Bizim üçün qaranlıqda o yeganə mayaq idi,
Tufanları ram eləyən bir sükançı, bir dağ idi.
Yatırardı qiyamını əsarətçi zalımların,
Elə ayıq, sayıqdı ki, yatarkən də oyaq idi.

Bəli mürgü vurarkən də bu dünyanı görərdi o.
Aresin* cəng arabasın ulduzlara sürərdi o.
Qollarına yığsa belə min pəhləvan qüvvətini,
Çiçəkləri asta üzər, gülü ehmal dərərdi o.

Danışarkən göz qalardı o kəlamda, o xoş səsdə.
Əxlaqı saf, ruhu yüksək, könlü odlu bir həvəsdə.
Yuxusundan ayrılarkən qaplan kimi sıçrayardı,
Bölüb isti çörəkləri, paylayardı süfrə üstə.

Həzrət İsa peyğəmbərin qabırğası arasından
Onun dərya ürəyinə damla-damla axmışdı qan.
Ən müqəddəs dualarla Tanrısına tanışdı o,
Ölümsüzlük tapmışdı o, güc alıb öz zəkasından.

Mənim ağlım nə qu quşu, nə də pəri nəğməsidir.
Qatarından ayrı düşən bir durnanın naləsidir.
Yetim qaldı böyük şəhər, başsız qaldı polad qala.
Ömür boyu görməmişdik bu cür matəm, bu cür bəla!

Ey dost, nə cür tapdı səni o qara əl, qanlı bıçaq?
Kaş bataqlıq qurdu kimi quruyaydı o qurumsaq.
Qan qusaydı, gəbərəydi,
Neçin bizi tale əydi?

---

* Ares – yunan əsatirində hərb tanrısıdır.

Sən ki, qızıl günəş kimi nur saçırdın sərin-sərin,
Qürub etdin... qərq olmuşuq zülmətinə gecələrin.
Aramıza bulud girdi, ayrı düşdük günəşdən biz.
Sənin çinar qamətinə həsrət qaldı gözlərimiz.

İllər boyu qan-yaş töküb, ürəyimi didəcəyəm.
Sənsiz yetim qalan təxti kədərlə seyr edəcəyəm.
Sevinc yolu kip bağlanıb. Gözüm, könlüm ah-amanlı.
Sifətimə yaş süzülür bulaq-bulaq, ey qəhrəman,

Bu gün sənə həsrət çəkən doğmaların halı yaman.
Yaddan çıxmaz bu məhəbbət heç bir zaman, heç bir zaman
Kaş ki, bizim sözlərimiz ətir saçan buxur kimi
Alışaydı məzarında, yanaydı son damlayacan.

Başımızın tacı düşdü,
Taxtımız da, baxtımız da yetim qaldı.
Gücümüzün şan-şöhrəti
Səninlə bir basdırıldı.

Fəxr elərdi adın ilə Tiber gölü, Livan dağı.
Dayanardı səni görcək şimal yeli, azğın yağı.
İndi yurdu sənsiz görüb hunlar qapır baltasını,
Solacaqmı təpiklərdə nar cənnəti, nərgiz bağı.

Hanı, hanı qızıl tacın daş-qaşları, ulduzları.
Soldurubdur gəlinləri qəm tozları, dərd tozları.
Balasını itirmiş tək yaxa yırtır, yaş tökürlər.
Solub gedən bənizlərin nə yamandır bu qübarı.

Tac əhli də anlayır ki, tac əbədi bəzək deyil.
Üzərindən atmaq istər ləkələnmiş şöhrəti, bil,
Nələr deyir bu müsibət? Yatma, deyir, ayıl, qəfil!
O ömrün ki, sonu budur, həyat bizə gərək deyil.

Xoşdur mənə bu sözləri deyib yatmaq, susub yanmaq.
Ancaq daha xoş olardı səninlə bir dəfn olunmaq!

## M U S A  Ş Ə H Ə V A T

*VII əsrin ikinci yarısı, VIII əsrin əvvəllərində yaşayıb-yaratmış Azərbaycan şairidir. Ömrünü əsasən Mədinədə keçirsə də, vətəni ilə əlaqəsini kəsməmiş, tez-tez Təbrizə səfər etmişdir.*

*Ərəb dilində yazdığı əsərlərin bir hissəsi dövrümüzədək gəlib çıxmışdır.*

*Orta əsr qaynaqlarında və M. Tərbiyətin "Danişməndani-Azərbaycan" kitabında Musa Şəhəvatdan müxtəsər bəhs edilir. Filoloq İbn Qüteybənin (828-889) və məşhur ərəb tarixçisi Təbərinin (838-923) əsərlərində şeirlərindən nümunələr verilmişdir.*

*Yaradıcılığında sosial satira güclüdür, rüşvətxor qaziləri və zülmkar valiləri, Əməvi xəlifəsi Yəzidi həcv etmişdir. Didaktik şeirlərində yüksək insani keyfiyyətlər tərənnüm olunur. Lirik şeirlər də yazmışdır.*

1

Bilmirəm heç nə üçün yar məni tərk etdi,
Ürəyim də qoşulub yarım ilə bir getdi.

İşvə ilə məni hindu özünə qul elədi,
Ruhumu dünyada min dərd ilə məşğul elədi.

Bu bəlanı mənə Allah özü göndərdi fəqət,
Özü də hifz eləyər, etsə, bəladan, əlbət.

Həmzə öz dövlətini verdi, təşəkkür aldı,
Var gedəndir, ona aləmdə fəqət ad qaldı.

Bir belə bəxşiş edir, fikri onun ehsandır,
Başqa bir məqsədi yox, çünki təmiz insandır.

Ölkədə qıtlıq olarsa, o açar bəxşiş əli,
Var-yoxu getsə də, ac qoymaz, inan ki, bu eli.

Onun əzmilə bəlalər hamısı yox olmuş,
Bəxşişilə hamı o təhlükədən qurtulmuş.

Çöhrəsindən yayılır hər yana ismət nuru,
Heç nə etməz ləkəli böylə təmiz bülluru.

Sən baharsan, yağışın ədl-ədalət olmuş,
Kimdə, bilməm, belə bəxşişlə kəramət olmuş?

2

Babanız Təlhə kimi cana dəyən insan idi,
Onun övladları da xeyr ilə yar olmalıdır.

Sən ki, Teym – Haşiminin nəslinə bağlı qızsan,
Xislətində babalar namusu var olmalıdır.

İstərəm sən əbədi sağlıq ilə yar olasan,
Ədl ilə öz əməlindən sevinib zövq alasan.

3

Doğru hökm eyləsə hakimlər əgər ədl ilə,
O zaman haqq-ədalət olacaqdır bərpa.
Evi abad Səidin ki, sevir o həqqi,
İbn Cürmüz də atır hökmünə dərhal imza.

4

Səndə yox bir elə nöqsan, sənə irad tutalar,
Varlığın xeyr evidir, orda fəqət nemət var.
Özgələrdə görülən eyb hanı səndə, hanı?
Heyif, çox heyif vücudun daha oldu fani!

5

Ey hakim, sən aciz, aravuransan,
Səndən bir qazi tək əl üzmüşəm mən.
Xalqa etdiyin zülm evini yıxsın,
Onu bir də heç vaxt abad görmə sən!

# İSMAYIL İBN YƏSAR

*Qədim Azərbaycan poeziyasının istedadlı nümayəndələrindəndir. VII əsrin sonu, VIII əsrin əvvəlində yaşayıb-yaratmış, "Nisai" təxəllüsü ilə məşhur olmuşdur. Ömrünün əsas hissəsini Mədinədə keçirmişdir. Dövrünün mütərəqqi ideya cərəyanlarından Şüubiyyə* tərəfdar çıxdığından Əməvi xəlifələri tərəfindən təqib olunmuş və Hicaza sürgün edilmişdir. Ərəbdilli poeziyanın inkişafına böyük təsir göstərmişdir.*

*Ədəbiyyat tarixinə kəskin siyasi şeirlər, yanıqlı mərsiyələr, səmimi vəsflər, incə aşiqanə şeirlər müəllifi kimi daxildir. Şeirlərində vətən eşqi və azadlıq ruhu güclüdür.*

1

Əslim şərəflidir, şöhrətim uca,
Qılınc ağzı kimi kəskin dilim var.

2

Mən alanda Əbu Bəkrin qara ölüm xəbərini,
Səbr məni tərk elədi, heç qalmadı canda qərar.
Namərd tale gör bir necə onu məndən ayrı saldı,
Düşmənlərə möhtac etdi, burda məni eylədi xar.
Adamların əllərindən onun qara cənazəsi –
Hər tərəfi boz çöl olan bir quyuya düşdü naçar.
Onda bildim, qismət olmaz bu dünyada həşrə qədər –
Görmək onun ağ üzünü, etmək onunla iftixar.
Az qaldı ki, qəbristanda bədənimdən ala canı –
Ayrılığın acıları, sinəmdəki bu ağrılar.
Mən nə qədər öyüd verdim ürəyimə səbr eləsin,
Heç baxmadı, gözlərimdən qanlı yaşlar hey oldu car.

---

* Şüubiyyə – Şəb (cəmi: şüub) – xalq deməkdir. Ərəb xəlifəliyinə daxil olan xalqların bərabərlik hüququ fikrini irəli sürən ideoloji cərəyan. Öz inkişafında bir neçə mərhələ keçmişdir. Ədəbiyyatda ilk dəfə İsmyıl ibn Yəsarın şeirlərində ifadəsini tapmışdır.

Bizim qara günümüzdə kim eyləyər səni əvəz,
Səndə olan hünər, qardaş, nə məndə, nə özgədə var!
Nicat yoxdur yer üzündə heç ölümdən insanlara,
Əzrayılın pəncəsindən bu dünyada kim qurtarar?

3

Əhvalı nə haldadır Cinabdakı yerlərin,
Bir səhər şəfəqindən biz soruşduq xəbərin.
Söylədi: əsən yellər dəyişdirib halını,
Ötüb keçən buludlar artırıb məlalını.
Hind obası! Görəsən orada keçən günlər,
Bir də Cinab havası nə zaman geri dönər?
Havası pak, yeli də xəfif-xəfif hey əsər,
Nə hicrandan xəbər var, nə vüsaldan bir əsər.

4

Vüsalına imkan ver, ey yar, darıxmışam mən,
Yanmışam, kül olmuşam sənin məhəbbətindən.

Bircə dəfə lütf elə, daha heç nə ummarıq,
Nəvazişindən başqa hər şeyə göz yumarıq.

Böyüklərin nə üçün ayrı saldılar bizi,
Qoymadılar vüsala çatsın bu eşqimizi?

Başınıza dolanan sizə zərər verərmi?
Aşiq sevgi bağından artıq bir gül dərərmi?

5

Ey gözəl, dərd-qəmə sən məni saldın, bil, sən,
Qəlbimi, neyləməli, gizlədirəm mən eldən.

Haqq-nahaq aşiqini danlamağa şaiqsən,
İnsafın varsa, özün böylə sözə layiqsən.

Eşqini gizli tutursan həmişə gözlərdən,
Onu faş eyləməyi indi rəva gördüm mən.

Ya məni rədd elə, ya vəslinə sən qıl layiq,
Ya ümid ver mənə, ya söylə ki, tərk ol, aşiq!

Zərrəcə rəhmin əgər varsa, ümidim qırma,
Könlümün şişəsini hicrin ilə sındırma.

Sən vəfa qılsan inan, heç peşiman olmazsan,
Ey məhəbbətlə, sədaqətlə həmişə ucalan!

Sübhədək nalə çəkib yara şikayət etdim,
Gün ki çıxdı, otağından o nigarın getdim.

6

Şamda qərib məzara tapşırdım bir cavanı,
Allah ona yar olsun, çatdı vida zamanı.

Qəbirlərdən uzaqda, tənha yerdə yatdı o,
Vücudunu bu doymaz torpaqlara qatdı o.

Qəmli-qəmli dayandım, məzarına baş əydim,
Matəmində tək özüm əynimə qara geydim.

Ağladım hönkür-hönkür ayrılırkən mən ondan,
Uzaq-uzaq ellərin qərib düşmüş oğlundan.

Belədir insan ömrü, necə uzun olsa da,
Bir gün ölüm haqlayar, sovuşmaz ondan qada.

# ƏBU NƏSR MƏNSUR
# İBN MÜMKAN TƏBRİZİ

*XI əsrdə yaşamış, ədəbi fəaliyyəti Təbrizdə keçmişdir. Səmimiliyi və real bəşəri hisslərin tərənnümü ilə seçilən qəsidələri və başqa lirik şeirləri öz dövründə Təbrizdə, habelə ərəb ölkələrində geniş yayılmışdır. Həyatı haqqında məlumat yoxdur. Əsərlərinin bir qismi Əl-Baxərzinin "Dümyət əl-qəsr"* (*"Qısa təsvir"*) *antologiyasında toplanmışdır. Bu əsərlərdə Mənsur Təbrizi sənətin sosial qayəsindən, insanın mənəvi saflığından obrazlı şəkildə bəhs edir.*

1

Mərhəmət sahibidir eşqi duyan mərd ağalar,
Onların qəlbi yanar, gözlərisə qan ağlar.

Mürşidəm onlara, şeyxəm, çalışıb xeyli zaman,
Göz yaşım axdı müdam, coşdu sinəmdə həyəcan.

Böylə sövdadə qazancım kədər oldu ancaq,
Dayağım təkcə dözüm... səbr məni qurtaracaq.

Harda olsam da, baş əydim sözünə sevdanın,
Daşları yağdı həmişə başıma hicranın.

İxtiyarı mənim olsa könül ilə gözümün,
Eşqimə bir-bir açardım suçumu mən özümün.

Birləşibdir nə edim ki, gözüm ilə ürəyim,
Heç birindən, inanın, yoxdu nicatım, köməyim:

Gözlərim gördüyünü nəql eləyir qəlbim üçün,
Qəlbim isə götürür hər kədəri, dərdi bütün.

Eşq bizlər yox ikən də var idi dünyada,
O bütün işlərə əvvəlcə olub amadə.

Onun uğrunda günah yapdı, bilirsən Davud,
Qəzəb etdi ona bir böylə günahçün məbud.

Mən də bu yolda əsirəm, ona zəncirli qulam,
Bu əsirlikdə şadam, kaş ona daim qul olam.

2

Dost ilə, düşmənlə daim bir gedir,
Dostu xilas edir, qırır düşməni.

Sənətim gücsüzə cəsarət verir,
İti qılınc edir zəif bədəni.

Deyirlər şerini düzəlt, zəifdir,
Satılan söz pisdir, dinc burax məni.

Tanrı qələm verib ucaldır göyə –
Qələmlə düşməni qırıb tökəni.

Qələm çox düşmənin töküb qanını,
Töküb öz qanını, məhv olub dəni.

Şerim qərib-qərib ölkələr gəzir,
Ruhu sevindirir şeir sevəni.

# XƏTİB TƏBRİZİ

*Əbu Zəkəriyyə Yəhya ibn-Əli Xətib Təbrizi 1030-cu ildə Təbrizdə doğulmuş, ilk təhsilini orada almış, sonra Bağdad, Şam və Misirdə davam etdirmişdir. Məşhur ərəb filosofu Əbül-Üla Məərrinin tələbəsi olmuşdur. Təhsilini tamamlayandan sonra istedadlı alim Bağdaddakı məşhur "Nizamiyyə" mədrəsəsinin müəllimi olmuş, ədəbiyyatşünaslığa dair bir sıra əsərlər yazmışdır. Qədim ərəb poeziyasını şərh edən əsərlərin müəllifidir. Şərhçilik elminin inkişafına böyük təsir göstərmişdir.*

*Orta əsr qaynaqlarında həyatına, ədəbiyyat və dilçilik sahəsindəki fəaliyyətinə geniş yer verilir, əsərlərindən nümunələr gətirilir.*

*Dövrünün ictimai məsələləri ilə dərindən maraqlanmışdır. Şeirləri xilafətdə hökm sürən özbaşınalığa, yaramazlıqlara kəskin etirazdır. Fəlsəfi və aşiqanə lirika sahəsində də qələm işlətmişdir.*

1

Diclə üstündə şərabımda böyük zövqü səfa,
Fərat üstündəki axşam meyi də bambaşqa!

Bu sular üstə üzüm şəhdinə meyl etdim mən,
Bu sular parlaq olub xəznələrin dürründən.

Göylər ilə bu yerin qarşı durubdur qəməri,
Məst edib onları eşq ilə məhəbbət əsəri.

Ləblərindən mey içib, mən də şərab verdim ona.
Yaxşı bax, söylədim ey məh, bu könül vurğununa

Aşinadır, dedi qəlbi o mənə qardaşdır,
Sirlər duymaq üçün sevgili bir sirdaşdır.

2

Yorular seyr ilə insan, mən isə durmaqdan,
Bil ki, təngə gətiribdir bu ətalət canımı.

Hər kimi görmüşəm, ey vay, bu gün Bağdadda,
Nanəcib, zatı qırıq zülmət edib dörd yanımı.

3

Şerimin yox elə imkanı səni mədh eləyə,
Nə bilim, bəlkə də yüzdən birini söyləyirəm.
Sən məni əfv elə qarşında belə təqsir üçün,
Mən sənin fərmanına böylə əməl eyləyirəm.

## MƏSUD İBN NAMDAR

*XI əsrin ikinci yarısında Beyləqanda anadan olmuş, XII əsrin birinci rübündə vəfat etmişdir. Gənc yaşlarından ömrünün sonunadək Beyləqan, Gəncə və Şirvan şəhər idarələrində işləmişdir. Əsərlərində bu şəhərlərdə baş verən tarixi hadisələr təsvir olunur.*

*Özünün verdiyi məlumata görə ərəb, fars və türk dillərində əsərlər yazmışdır. Ərəb dilində hekayələri, məktubları və şeirləri bizə gəlib çatmışdır. 2000 beytdən artıq olan poetik irsi ənənəvi şeir formalarındadır. Bu əsərlərdə xalq yaradıcılığından da çox istifadə olunmuşdur. Bədii irsi XII əsrin axırı və XIII əsrin əvvəllərində Azərbaycan ədəbi həyatının, bədii fikrinin və tarixinin bir sıra məsələlərini öyrənmək üçün ilkin qaynaqlardan biri kimi böyük əhəmiyyətə malikdir. Zəmanədən, xüsusilə taxt-tac sahibi zalım şahlardan şikayət burada əsas mövzulardan biridir. Avtobioqrafik mahiyyətli şeirlərində vüqarlı şairin xain, satqın, hiyləgər adamlara nifrəti ifadə olunmuşdur.*

1

Qardaşım qaldı yetim körpə ikən dünyadə,
Tərbiyə etmək üçün oldum onu amadə.

Saxladım birtəhər, o çatdı iyirmi yaşına,
Tanrı pak qəlb verib, əql qoyubdur başına.

Ötdü artıq bu yaşından, keçib ilk gəncliyini,
Çatdı idrak evinə, atdı daha dincliyini.

Yetdi bir öylə məqamə, həvəsi artdı onun,
Yolçusu oldu daha eşq ilə sevda yolunun.

Qoşdu indi başını dostlar ilə işrət üçün,
Keçdi günlər, əməlindən özü oldu küskün.

Üzü döndü daha dostlarla şərab içməkdən,
Geri qaldı o həvəslərdə ötüb keçməkdən.

Qulaq asmırdı nədənsə deyilən bir sözümə,
Atalıq etməyi fərz etdim onunçün özümə.

Bağlanar, bəndə düşər, söylədim evlənsə əgər,
Düz yola dəvət edər kəc gedəni ailələr.

Dəvət etdim, neçə dost gəldi onun məclisinə,
Səsimi qoşdum onun böylə məqamda səsinə.

Yemək-içmək duası etdi şəhər indi ona,
Beyləqanda hamı gəldi o əzizin toyuna.

Qalmadı kimsə şəhərdə, qonağım oldu hamı,
Gəldilər dəstə ilə xəstələrindən savayı.

Qudalar, qız tərəfindən neçə adil insan –
Oldular böylə əziz gündə mənə bir mehman.

Sayları çoxdu yəqin göydəki ulduzlardan,
Bu yaxında olacaq toy, – dedilər, – çatdı zaman.

Qıza başlıq dedilər ən azı üç min dirhəm,
Qardaşı söylədi ki, mən toyuna toybəyiyəm.

Bir gecə qövl-qərar oldu ki, toy başlansın,
Tanrı hökmüylə iki sevgili alqışlansın.

Arzumuz, istəyimiz yetdi təmamən yerinə,
Oynadı bəylə gəlin... doğdu günəş üzlərinə.

Bağlamayla neçə paltar yola saldım, getdi,
Yaxşı-pis toyla büsat söhbəti artıq bitdi.

Bir çuğul, biədəb, alçaq yanıma gəldi mənim,
Görcəyin surətini əsdi qəzəbdən bədənim.

Özü bir nakəs ikən, özgəyə böhtan atdı,
Yaxşı işlər hamısı şər dənizində batdı.

Dedi: Pis iş yaranıb gizlicə bir gün arada,
Yaramaz böylə əməl, saldı haray ki, burada –

Boşboğazlar mey içib, hərzə ilə küy saldı,
Qəlbimi vəsvəsə sıxdı, canımı dərd aldı.

Eşidib təhqiri mən, qaldım ayıq sübhə kimi,
Çağırdım dadıma, yarəb, görəsən indi kimi?

Üz tutub dostlara fəryad elədim hiddət ilə,
Alışıb yandı ürək ismət ilə, qeyrət ilə.

Pak olan isməti məstlər sözü sanma ki, silə,
Sanma düzlük belə namərdin əlilə əyilə.

Şər atan kəsləri siz rədd eləyin dövrəmdən,
Qoymayın şər toxumun səpsin amansız düşmən.

2

BİR PARA NAKƏSLƏRİ MƏZƏMMƏT
VƏ ÖZ HALIMDAN ŞİKAYƏT

Çalışın, ay insanlar, sevin sülhü, səfanı.
İtirdiniz nə üçün etibarı, imanı?

Özləri bərk azıblar xalqa yol göstərənlər,
Beyləqanda küfr ilə məşğul olur ərənlər.

Alçaqlar gəlib olmuş ucaların əmiri,
İstedadlar, zəkalar nakəslərin əsiri.

Səxavətli görəndə dərisini soyurlar,
İnsanların qanını bulud suyu sanırlar.

Şərəfsizlə şərəfli seçilmir burda məgər?!
Ayrılmayır, əcəbdir, düzlər ilə əyrilər.

Ulduzlar səmalarda işıldayır, hey yanır,
Asimanlar, elə bil, qan rənginə boyanır.

Düşmənlər çinar bilib qabığımı soyurlar,
İblislər hücum edib yaman günə qoyurlar.

Əğyar oldu taleyim, geniş dünya daraldı,
Fikirlər incələşdi, səbrim evi qaraldı.

Oğlanlarım dünyaya bir əsir kimi baxır,
Qızlarımın qəlbimdən qapqara qanlar axır.

Namərdlərin əlində külfətim əsir qaldı,
Qaçıb getdim oğru tək, könlümdən ah ucaldı.

Satdım dəyər-dəyməzə varımı-dövlətimi,
Saxladım vicdanımı, saxladım ismətimi.

Haray, haray, yurdumu axır ki, atıb getdim,
Əziz övladlarımı özümə həsrət etdim.

Haray, yaman ayaqda mənə yaxşı olan dost,
Arxasız çağlarımda dərdlərimə qalan dost!

Eşqim neçün, bilmirəm, belə vəfasız oldu,
Qara, uzun kirpiklər axır səfasız oldu.

Mənim baxar gözlərim döndü axar bulağa,
Başladı könül qanım bir fəvvarə olmağa.

Elə bil dayaq oldu qüssə ilə qəm mənə,
İndi necə dayanım ayrılığın cövrünə?

Yamanlardan əlhəzər, yaxşılardan ayrıldım,
Əridim, çöpə döndüm, bir hind qamışı oldum.

Əmimi qəm çulğadı, qardaşım qara geydi,
Atdığımız bəxt oxu əyildi, daşa dəydi.

Nazımı çəkənlərin qədrini bilməmişəm,
Onlar ilə oturub bir deyib gülməmişəm.

Bu elin alçaqları axır ki, məhv olacaq,
Alçaq daim ucadan cəzasını alacaq.

Pəltəklər Beyləqanda, Şahranda şər qatdılar,
Taleyini yadların ayağına atdılar.

İndi artıq çətindir o yerlərə qayıtmaq,
Qayıdıb nakəslərə bir yerdə addım atmaq.

Baş verən bəlalərdən Tanrı özü saxlasın,
Canilərin yolunu birdəfəlik bağlasın.

Cəhənnəmə layiqdir bu alçaqlar, rəzillər,
Şeytanın nütfəsidir bu yaramaz nəsillər.

Keçi tək özlərinə ölüm axtarır onlar,
Axmaq deyil, alçaqdır bu ağılsız məlunlar!..

Mənə "yox ol" deyənlər qoy özləri batsınlar,
Özüm məhv olsam belə, məzarım vulkan saçar.

Məni alçaltmaq üçün dəridən çıxır onlar,
Qanımı içən zaman elə bil süd sağırlar.

Sözləri etibarsız, vədələri yalandır,
Yüz yol and içsələr də, boş sözləri samandır.

Ruhlarını Tanrımız, yəqin ki, əfv eyləməz,
Türkmənlər hakim olar, onlara aman verməz.

Yeddi arxa dönəni nacins olan nakəslər
Hələ heç doğulmamış səadəti öldürər.

Yaşadım bir guşədə, qayğı əsiri oldum,
Özüm özümə düşmən, qonşu yesiri oldum.

Bezdim münaqişədən, ciddilikdən usandım,
Taleyə ram olmağı nədənsə doğru sandım.

Rəhbər oldu cəhalət, məhv edildi ləyaqət,
Oğul-uşaq qayğısı gətirdi dərd üstə dərd.

Ölüb gedib deyirlər yeddi ay bundan qabaq, –
Qazilər də mülkünü məhv edib talayaraq.

Qanunları zəmanə öz xeyrinə uydurur,
Elin şair oğluna ehtiram məgər budur?

Mənə – Bədiüzzəmandan məgər bumu hədiyyə?
Əydilər peyğəmbərin sözlərini “din” deyə.

Deyin bəs harda qaldı hakimin ədaləti,
Cavabımda söyüşdür şahın sözü, söhbəti.

Varlığım heçə getdi, görün nəymiş qismətim?!
Yarəb, qayıdarmola itib gedən hörmətim?

Ölüb gedərəm, nə qəm, həyat özü fanidir,
Allahın mərhəməti könlümün həyanidir.

Təxt-tac sahibi də karvanıdır bu yolun,
Qoy bilsin, anlasın ki, bəqası yoxdur onun!

Qısnağımda qısmadım, mən xərclədim varımı,
Bədbəxtlik qoşun çəkib dağıtdı ruzgarımı.

Nə qəm, biz də gülərik nakəslərin nəslinə,
Dədələri qayıdar ilk-əvvəlki əslinə.

Müştəri ulduzuyla birləşdirərlər məni,
Əvvəl-axır gül açar taleyimin gülşəni.

Çoxu qəzəb içində olub məğmun, peşiman,
O Süha ulduzunun kinli parıltısından.

Ləyaqətsiz düşmənlə barışmaram heç zaman,
Ləyaqətli olmuşam Aranda göz açandan.

Bəlkə də Allah mənə bu halətlə yar oldu,
O alçaq kimsələrdən yerim uzaqlar oldu.

Könlümdə bir inam var yaşamaq fərmanıdır,
Xainləri bu dünya əvvəl-axır tanıdır.

Onları Tanrı bir gün şəksiz asıb kəsəcək!
Qasırğalar önündə cəsədləri əsəcək.

Harda olsam onlarla vuruşlardayam müdam
Qılıncım bu dilimdir! Sıyrılıb öz qanından!

3

## LEYLƏTÜL-QƏDR GECƏSİNDƏ

"Leylətül-qədr"i Tanrı özü seçib, bəyənib,
Haman gecə işləmir şeytanın əməlləri.
Əgər bilmək istəsən nədir bu "Leylətül-qədr"
Gərək ki, açıq gözlə sən açasan səhəri.

4

Üzüm o Beyləqanın ən şirin nemətidir,
Ağıllılar danlamaz bu sözçün əlbət məni.

Mən sizə xurma payı göndərirəm uzaqdan,
Bizim torpaq olmayıb çünki xurma vətəni.

5

## SÜKUT YATAĞI

Hamı yatmış, uyumuş, hökm eləyir burda sükut!
Cin-şəyatin yox olub, uyquya dalmış mələkut.

Torpağın üstünə düşmür daha yorğın izlər,
O da yatmış kimi dinclikdə səadət gözlər.

Bir sərin yel də əsir, çöhrəmə yelpik vuraraq,
Bir buludsa su səpir yollara sakit duraraq.

Badya ilə elə bil göydən enir yerlərə su,
Məst edir könlümü, Allah, belə torpaq qoxusu!

Şimşəyin məşaləsindən cahana nur saçılır,
Parlayır yer üzü guya ki, sabahım açılır.

Çağlayır göydə bulud, dağ-dərəyə nərə çəkir,
Elə bil ki, yuvasından bağırır zəhm ilə şir.

Ayılarmı yuxudan?.. Ömrü-günü bitmişlər?!
Görə bilsəydi sabahı, ah, ölüb getmişlər!

Bu şəfəqlər, bu haraylar ürəyə nəşə salır,
Göz bu röyanı görəndə yaşamaq zövqü alır!

6

Söyləyin Beyləqanın "layiqli" başçısına,
Mədinətüs-səlamdan şirin sözlər siz ona.

Görüşmək qaydasını unudubdur dönərkən –
Ayrılanda o, "layiq", "şərəfli" hakimindən.

Ərəblərin şöhrətli hökmdarı olmusan,
Sən onların əlindən çox ənamlar almısan.

Ucalıbsan hilal tək mərtəbəli göylərə,
Ucalıbsan, nə yolla sən elə yüksəklərə?

Biganələr işinə, ey daim arxa duran,
Öz işində onlara yenə söykən, arxalan!

Bəs nə üçün oğullar haqqından məhrum oldu,
Onların bu mərdliyi bir kənara qoyuldu?

Tanınmış bir insanam, hamının hörməti var,
Vəzirlərdən yerimi onlar yüksək tuturlar.

Bəs nə üçün unudub cənabi-ali bunu,
Uzaqdan da almadın bir quru səlamımı.

Səfərdən gələnlərlə görüşmək bir adətdir,
İnsanlıqda bu özü ədalət, nəzakətdir.

Unutdun bu adəti, ey adətə yad olan!
Ay özündən bixəbər, ay evi bərbad olan!

Unutdurub sahibin sənə sənin özünü,
Xəbərsizsən özündən, duman tutub gözünü.

Bəlkə cümə axşamı bənd olmusan badəyə,
Unutmusan hamını, məni də, kimdir deyə.

Bəli, sizin "qulunuz" salam deyir uzaqdan,
Buyurun, cavab verin, nə fayda var susmaqdan?

Odla, alovla yazdım bu məktubu mən sizə,
Çox güman ki, sabah da dayanarıq üz-üzə.

7

## İKİ CƏNABIN İSTƏKLİSİ

Bizim gözəl gəncəli Müstövfi Əminülmülk,
Bir də ki, Əbu Cəfər Məhəmməd ibn Hüseyn –

Görüm Tanrı hifz etsin istəyimcə dünyada –
Nə qədər bu aləm var bir yerdə hər ikisin.

Əminülmülk yayıbdır ölkəyə ədaləti,
Yoxsa ki, bu Məsudun artardı fəlakəti.

Duaçıyam mən ona ömrüm boyu hər zaman,
Onun səxavətilə qurtardım möhtaclıqdan.

Onun bu axıb gələn mərhəmət çeşməsindən –
Elə bil ki, dirilik suyunu içmişəm mən.

Tanrı lütf etsin ona, artırsın cəlalını,
Hər bir insan dünyada xoş istər öz halını.

Şərafətli kəslərə ehsanı aşıb daşır,
İltifatı göylərdə ulduzlara yanaşır.

Çırpınır dənizində fəzilətlər dalğası,
Dürdanəylə doludur onun ağıl dəryası.

Qızıl-gümüş, var-dövlət onun gülər üzüdür,
Səmək bürcü bu şəxsin elə bil ki, özüdür.

Sanki qalxır yüksəyə bədirlənmiş qəmərlə,
Xoşbəxtliyi yarışır günəşüzlü səhərlə.

Səmanın şəfəqləri doğur onun üzündə,
Sürəyya işıq saçır onun parlaq gözündə.

İnsanlıq qüdrətilə üfüqləri fəth edir,
İnsanlığı hamıya əməlilə şərh edir.

Kim onun tək yaşayır, ölməz olur dünyada,
Kim ki, ona bənzəmir, həyatı gedir bada.

Kaş, onun günlərini bayram edəydim mən də
Onunla gün keçirən adamların içində.

Ovçular öz ovunu ovlaqda ovlayırlar,
Gözəllər arasında ömrü ömür sayırlar.

Məstliyini gizlədir onlar şərab küpündə,
Xoş olurlar zamanın yaxşı keçən günündə.

Deyirəm, xoşbəxt olsun xoşbəxtlik istəyənlər,
Qoy yaman günə qalsın yamanlıq diləyənlər.

Hasili yoxa çıxmış səhradayam fəqət mən,
Yox adamı bu yerdə adam kimi dindirən

Məgər insandı bunlar? Meymunlar içindəyəm.
Gözləri açıq yatan qoyunlar içindəyəm.

Başçıları başsızdır, özləri ondan betər,
Yol azmış bir yolçunun yolu de, harda bitər?!

Bircə əcəm oğlu var onların arasında,
Başçıları pəltəkdir, yel oynar qafasında.

Nəzarət eyləyirdi işlərinə bir ağa,
Alçaltdı hamısını, düşdü iş dolaşığa.

Hamısı zəlil oldu, hamiləri olmadı,
Hansı yurdun boynuna bunlar kəndir salmadı?

Ayağa zəncir vurub bağladılar qolları,
Cinayətlər yapmaqda ap-açıqdı yolları.

Sədd çəkilib o yerdə həqiqətin nəhrinə,
Xəyanət gəlib qonub sədaqətin yerinə.

Onları tərk eləsən namərdlər sənə gülər,
Hamısının üzündən kin, paxıllıq tökülər.

O qafası qalınlar uda bilmir hirsini,
Çəkəcəkdir bir yana peşmanlıq hərəsini.

Zəkadan qorxur onlar, belə xislətləri var,
Saymayanın əmrinə baxıb tabe olurlar.

Verdikləri sözlərə heç vaxt əməl etməzlər,
Kimsə ilə dost olub, beşcə addım getməzlər.

And içib Yezid kimi Hüseyni aldadarlar,
Belə pis işlərindən haram qazanc dadarlar.

Unudarlar dostluğu vəzifəyə keçəndə,
Heç kimi tanımazlar qəflət meyi içində.

Mənə çox vəd verib unutdular binadan,
Vədəxilaf doğulub bu nakəslər anadan.

Görüm Tanrı məhv etsin yoldan çıxardanları!
Necə düz saymaq olar onlardan olanları?

Heç bilmirəm nə üçün məni görmür gözləri,
Xəyanətdir həmişə söhbətləri, sözləri.

İki qolu qırılmış gənc itirdim arada,
Bircə yaxşı insan var Əmin kimi orada.

Onların qarşısına sədd çəkir, ağıl verir,
Ölməməkçün o mənə hərdən donluq göndərir.

Gəlib şad edir məni göndərdiyi ənamlar,
Təşəkkürə, alqışa layiq olan hələ var.

Bu ənamı bəsimdir, dolanıram birtəhər,
Necə də mən etməyim Əminə təşəkkürlər?

Belə bir mərd adama adam gərək baş əyə,
Onun insanlığından bəhs aça, tərif deyə.

Onun açıq əlinin tərifi sığmır sözə,
İlahi, bu səxavət gəlməsin yaman gözə.

Elə bil ki, mən onun evində doğulmuşam,
Doğma balası kimi mehribanı olmuşam.

Elə bil mərhəməti qismətimdir əzəldən,
Qayıtdım ki, feyz alım belə ülvi gözəldən.

Qayıtdım ki, tanıyım bu səxavət əhlini,
Ürəkdən möhkəm-möhkəm sıxım açıq əlini.

## İSKAFİ ZƏNCANİ

*XI əsr şair İskafi Zəncani haqqında məxəzlərdə verilən məlumat ancaq onun dörd beyt şerindən ibarətdir. Bu beytlər Baxərzinin "Dümyət əl-qəsr" ("Qısa təsvir") təzkirəsində saxlanmışdır. Ayrı-ayrı əsərlərindən seçilmiş bu beytlər şairin dövründən narazılığını əks etdirir.*

1

Gözümün qarəsinə qəmlə düşən ağ ləkəni –
Örtürəm kirpiyim ilə, qorunam cahildən.

Bu cəhalət, bu müsibət çəkəcək həşrə qədər
Sərvət əhlilə dilənçilər əgər olmasa tən.

2

Mən yanar od kimiyəm, sirlərim buz kimidir,
Qorxuram öylə yanam, faş ola min sir bir-bir.

3

Yaylığa layiq olan başda görüb əmmamə,
Deyirəm heyrət ilə: heç yaraşır əqli kəmə?

# XƏTTAT NİZAMİ TƏBRİZİ

*XI əsr şairi Əbül Qasim Əzizan ibn Məhəmməd Xəttat Nizami Təbrizi haqqında "Öz xətti ilə kağızlar torpağında dürr əkirdi" – deyən Baxərzi onun iki rübaisini müəllifin öz dilindən "Dümyət əl-qəsr" şeirlər toplusuna daxil etmişdir. Baxərzi şairi şəxsən tanıdığını, onun şeirlərinə qulaq asdığını da yazır.*

*Rübailəri vətənsevərlik hissi ifadə edir, əxlaqi-nəsihətamiz məzmun daşıyır.*

1

Yalnız yaxşı ad qalar bu vəfasız dünyada,
Hamı bunu dərk edib, anlayıb, bilsin gərək.
Gülər üzlə, açıq əl xeyirə səbəb olar,
Bizim böyük sahibin nəcib əməlləri tək.

2

Vətənə can atıram, öldürür məni qürbət,
Nəfəsim bir udumluq doğma havaya həsrət.
Qaradır gözlərimdə ən işıqlı səhər də.
Mənim qərib günümdən rəng alıb göy də, yer də.

# ÖMƏR GƏNCİ

*Ömər Osman oğlu Gənci 1080–1085-ci illər arasında Gəncədə anadan olmuş, 1155-ci ildə vəfat etmişdir. Təhsilini Gəncədə almış, sonralar Həmədanda, Bağdadda dövrün tanınmış alimlərinin yanında biliyini artırmış, Bəsrədə, Nişapurda və Mərvdə ədəbi yığıncaqlarda iştirak etmişdir.*

*Poetik irsinin az bir hissəsi Yaqut əl-Həməvinin "Möcəmül-büldan"* (*"Ölkələrin əlifba sırası ilə düzülüşü"*) *ensiklopediyasında saxlanmışdır. Lirik şairdir. Real məhəbbət, elinin gözəlliklərinin vəsfi, vətənsevərlik hissi qəsidələrinin aparıcı mövzusudur. Mədhiyyə və elegiyaları məzmunca öz doğma yurdu və dostları ilə bağlıdır.*

Sürüb dəvələrini mənim yurduma çatsan,
Dostlarıma, unutma məndən yetir bir salam.

Bu dərdə dözməyimdən, ayrılıq əzabından –
Danış bir-bir onlara mən necə xəstəhalam.

Söylə ki, onları mən hər yadıma saldıqca –
Gəlir keçir gözümdən bir də o günlər tamam.

Hər axşam göy üzündə ulduzlar görünəndə,
Yanağıma süzülür göz yaşlarım biaram.

Ətirli meh əsdikcə səhər dost diyarından,
Qəlbim yarpaq tək əsir, tutmur bir ləhzə aram.

# QƏTRAN TƏBRİZİ

*Klassik poeziyamızın qüdrətli nümayəndələrindən biri, görkəmli şair Qətran Mənsur oğlu Təbrizi 1012-ci ildə Təbrizin Şadiabad kəndində əkinçi ailəsində anadan olmuşdur. Uşaqlıqdan şerə, sənətə bağlanan Qətran klassik poeziyanı dərindən öyrənmiş, 15-16 yaşlarından şeir yazmağa başlamışdır.*

*Təxminən 20 yaşında Gəncəyə səfər etmiş və burada Şəddadilər sarayına qəbul olunmuşdur. Gəncədə qaldığı dörd-beş il ərzində Azərbaycan təbiətinin əlvan təsvirini verən bir sıra parlaq əsərlər yaratmışdır.*

*Dövrümüzə qədər gəlib çatmış əsərləri əsasən qəsidələrdən ibarətdir. Bir sıra qaynaqlara görə "Qövsnamə" adlı mənzuməsi, "Əttəfasir" adlı izahlı fars lüğəti də olmuşdur.*

*1088-ci ildə Gəncədə vəfat etmiş və burada da dəfn olunmuşdur.*

1

ƏBÜLHƏSƏN ƏLİ LƏŞKƏRİNİN MƏDHİ

Şamil oldu şahlara aləmdə fərmanın sənin,
Şahlara lazım nə varsa, vardır imkanın sənin!

Harda dilbər var, olub saqi və ya dərban sənə,
Harda şah var, ya qulundur, ya ki, mehmanın sənin.

Cürbəcür ordunla bu səhra dönübdür məhşərə,
Rəngbərəng nemətlərinlə ölkə rizvanın sənin.

Mərdlərə üstün gələn ayüzlü saqilər sənin,
Şux mütrüblərlə xoş keçməkdə hər anın sənin.

Dövlətin göylər kimi olmuş həmişə bərqərar,
Süslənib cənnət bağı tək qəsrin, eyvanın sənin!

Hər çətin iş, ağlasığmaz fikr çıxsa qarşına,
Həllini asan edər bəxtin, uca şanın sənin.

Sən girəndə məclisə, məclis deyər: yüz afərin,
Meydana girsən, dolar əhsənlə meydanın sənin.

Çarpışın ordu sənin, tədbirli dostlar səndədir,
Vəsfəgəlməz şövkətin, var ağlın, ürfanın sənin...

Bir zaman İranda əcdadın sürərdi səltənət,
Mülkünə ilhaq olar tezliklə İranın sənin.

Həm Mənuçöhr, həm Ənuşirvan baba olmuş sənə
Var Mənuçöhr, Ənuşirvan, bir cüt oğlanın sənin.

İşləriylə könlünü şad eyləyir hər gün biri,
Digərinin söhbətindən zövq alır canın sənin.

Könlünü naz ilə Qudərz adlı oğlun şad edər,
Ərdəşir can həmdəmin, hər dərdə dərmanın sənin.

Mülkü verdin, ədlini də verməli oğlanlara,
Nəsildən qoy nəslə keçsin şahlıq ünvanın sənin.

Şahlara lazım nə vardırsa, sənə Tanrım verib,
İstər ömrün bitməz olsun bu sənaxanın sənin.

2

ƏBUNƏSR MƏMLANIN MƏDHİ

Açarkən sevgilim bir cüt badamla iki mərcanı,
Bununla könlümü oxşar, onunla incidər canı.

Könüllə canı mən cananla qoyduq, bir bazar açdıq,
Mənə canan könül verdi, mən ol canane bu canı.

Yarılmış nar kimi köksüm, müdam odda yanar canım,
Gözüm tutdu, könül verdim, sevib gülöyşə püstanı.

Çəkəndə iki mərcanı otuz iki dür üstündən,
Verər zinət üzümə gözlərinin dürrü, mərcanı.

Zəhərli bir ox ilə sevgilim qəlbimi deşmiş ki,
Çıxartmaq candan özgə şeylə olmaz, bil o peykanı!

Verib qəlb ilə canı, alsam o mərcanı canandan,
Olardı bəlkə bir gün xəstə bu canın o, dərmanı.

Dalaşmaqla salar dərdə, barışmaqla edər dərman,
Səadət bəxş edər vəsli, qılar pəjmürdə hicranı.

Sanarsan, xalqa qarşı qəlbdə kin bəsləmiş Rizvan,
Behiştdən göndərib xəlqə bəla Rizvan bu cananı.

Olarsa küfrdə iyman, fəqət insanlara qarşı
Qoşa zülfü bəzətmişdir onun küfr ilə iymanı.

Mənim qəlbimdi bir xardal, onun qəlbiysə bir zindan,
Hanı xardalda o taqət, dözə, yumşalda zindanı?

O gündən ki, açıq rüxsarını məndən nihan etdi,
Üzümdə göz yaşım faş eylədi min sirri-pünhanı,

Pərəstiş eylədim büt tək ona, dərdü bəla çəkdim,
Yəqindir – bütpərəstin pis keçər axırda dövranı,

Eyibdir, mərifət əhli pərəstiş etsə bir şəxsə –
Ayırsan pak Yəzdan ilə şahənşah Məmlanı.

Əbunəsrin, o şahlar şahının qeyziylə mehrindən –
Müəyyən eyləmiş Tanrım özü nüsrətlə nisanı.

Qılıncı zərbəsindən mum kimi parə olur zindan,
Səxavətli əliylə döndərər dəryaya səhranı.

Pərişan eyləyər düşmənləri qəhr ilə əl qatsa,
Tapar rövnəq əliylə dostların hali-pərişanı.

Bütün günlər əlində zər, dilənçi axtarar, versin,
Açıqdır ilboyunca süfrəsi, var gündə mehmanı.

Bu məqsədlə ki, daxil olmasın çağrılmamış bir kəs,
Hamı şahlar edər dərbarına məmur dərbanı.

Bunun dərbarına dərban qoyulmuş ki, qonaq gəlsə,
Ona yol göstərə, ta hardadır sultanın eyvanı.

Əgər xoşluqla bir yol yad edə şeytanı Maliklə
Və ya düşmən kimi bir an ana Rizvanla huranı,

Xuda nur bəxş edər, Malik olar Rizvan kimi məqbul,
Verər zinət, edər huri kimi məhbub şeytanı,

Onun bir söhbəti min qəlbi eylər qüssədən azad,
Onun bir həmləsi qəmdə boğar min təbi-xəndanı.

Əgər Xan ilə, Qeysərlə ədavət qəsdi olsaydı,
Yıxardı qeysərin qəsrin, qoyub bixaniman Xanı.

Məsəl var ki, hünərdə olmamış tay ali-Samanə,
Fələk axırda bisaman edibdir ali-Samani.

Əmir əmr etsə, mümkündür, su içrə od alışdırmaq,
Onun bəxtilə mümkündür göyərtmək odda reyhanı.

Qılıncından od axsaydı, yəqin ki çovğun olmazdı,
Udardı bircə gündə sərt qılınc odda o tufanı.

Verilsəydi ona peyğəmbər adı, heç gecikməzdi,
Olardı möcüzü kəskin qılınc, tunc əlsə bürhanı.

Yədi-beyzası Musanın bu bürhandan qalar heyran,
Bu möcüzlə qılar aciz nəfəs çəkməkdə İsanı.

Həyadan, qorxudan divlə pəri olmuş bu gün pünhan,
O divlər ki, itaətlə əzizlərdi Süleymanı.

Təki şahım verə fərman, görünsün bir daha onlar,
Edərlər qul kimi xidmət, olarlar bəndə-fərmanı.

Görər Keyvan ki, şahın hümməti yüksək durur ondan,
Necə ki, xalq baxdıqda, görər yüksəkdə Keyvanı.

Qurar məclis, səxavətdə edər də hatəmi batil,
Onu meydanda kim görsə, unudar Puri-dəstanı!

Sanarsan “lövhi-məhfuz”dur onun həssas olan qəlbi,
Ləkə yoxdur, ola bilməz, fəsad çulğarsa dünyanı.

Pərəstiş vacib olmuşdur ona, kimdə ağıl vardır,
Sədaqətlə sevən şahı, sevər sidq ilə Yəzdanı.

Bərabərdir xudanın əmrinə hər yerdə şah əmri,
Edir həqq əmrini hicra, bilən haqq əmri-sultanı.

Görüm, daim bahar olsun, açılsın rəngbərəng güllər,
Bəzək vursun təbiət, cənnət etsin bağı, bostanı.

Boyu sərvi-sənubər tək, üzü xəndan qızılgül tək,
Əlində mey dolu sağər, gəzə şahım gülüstanı.

3

ƏBÜLXƏLİL CƏFƏRİN MƏDHİ

Yaz gəlib, açdı qızılgül, gülşənə verdi səfa,
Sanki cənnətdən təbiət qapılar açdı bağa.

Yel balış oldu söyüdçün, su təravət sərv üçün,
Bitkiyə şəbnəm qida, lalə yataq oldu quşa.

Gül budağı oldu xəm aşiqlərin qəddi kimi,
Bülbül aşiqdir deyə, fəryad ilə qondu ona.

Gül alışdı şəm kimi, yandırdı bülbül bağrını,
Gül kolundan atəş aldı, bülbül ol güldən nəva,

Qırmızı lalə bizimçün mişk tökdü camına,
Hər sarı gül bir zəbərcəd üstə oldu kəhrəba.

Bağ geyib firuzə bir don, şaxələr yaqut səpər,
Yer zərü ziba geyib, altun, gümüş saçdı səma.

Məclis əlvan bir gülüstan, gül sarı, al-qırmızı,
Mey süzülmüş şehdən ol yaqut və altun camlara.

İkiüz gül bağrıqan aşiq üzün xatırladar,
Ya töküb zərli vərəqlər üstə yaş bir binəva?

Gəncləşər, gül fəsli sübhün camını içsə qoca,
Canlanar, gül ətri çatdırsa ona badi-səba.

Gül açanda hər gecə, bülbül edər ahü fəğan,
Sanki bir aşiqdir, hicran köksünə vurmuş yara.

Mən də bülbül tək çəkib çox ah, fəryad etmişəm,
Onda ki, düşmüşdü can arami-canımdan cüda.

Bir zaman hicran qəmində mən o nazlı dilbərin
Göz-qədəh, gözyaşı – mey, fəryadımı etdim nəva.

Vəslinə çatdım, gərək məclis quram, hər gün o yar,
Üzdən od, ləbdən noğul, zülfündən ətr etsin əta.

Ol gözəllər padişahı məhrəm olcaq canıma,
Oldu canım naz ilə, könlüm fərəhlə aşina.

Can ilə qəlbə çıraq, dilbərlərin mehrabı – ox,
Sorğusuz vurdu ləbindən odlu neştər canıma.

Dövrəsində iki cərgə ox durur badamının,
Yaqut altında iki səf dürrü düzmüş yan-yana.

Nur onun hüsnü önündə zülməti xatırladır,
Saçlarının qarşısında zülmət olmuşdur ziya.

O bizə söhbətlə layiq, biz məhəbbətlə ona,
Layiqə layiqlik ilə eylərik borcu əda.

Hər qədər dünya durursa, mehri məndən dönməsin,
Təndə can varkən, gözümdən getməsin o məhliqa.

Din dövlətdən olan tək, xoşdur ondan ömrümüz,
Canımız ondan tapar, din şahın ədlindən səfa.

Xosrovi-İran igidlər iftixarı Bül-Xəlil,
Padişahlıqda Süleymandır, Xəlil tək parisa.

Sadə ömr eylər, cahan altun ola, qoymaz məhəl,
Bəxşişində yox onun əndazə, fikrində xəta.

Ağlı məddahı, onun fəzli füzuli rədd edər,
Təbi xalidir tamahdan, sözlərində yox riya.

Qorxuram ki, məzhəbindən xalq bütün üz döndərə.
Həm rəiyyət, həm də ümmət tək edə beyət ona.

Mehridir mehri-səadət, kinidir kani-qəzəb,
Ədlidir eyni-səxavət əhdidir rəmzi-vəfa.

Sarsılar ondan simiclik, ver ələ olmuş həyan,
Mal gözündə heç nədir, tərifə etməz etina.

Məclis içrə bir günəşdir, hər sözü şənlikdə Ay,
Rəyi elm ümmanıdır, bəxşiş əli seyli-səxa.

Bəxşişi su olsa, səhrada dəyirman işlədər,
Çəksə meydanda qılınc, vadini qərq eylər qana,

Gördüyü hər yaxşı tədbiri fələk tədbiridir,
Tanrının fərmanı tək baxmaq gərək fərmanına.

Xəznəsində varsa altun, cəhd edə bəxşiş verə,
Qarşısında varsa düşmən, can atar çarpışmağa.

Təbinə yer söyləsən, torpaq səmaya yüksələr,
Helminə göydür desən, istər yerə ensin səma.

Dəhrdə bədbəxt o kəsdir ki, şaha bədxah olur,
Bəxtəvər ol kimsədir ki, xeyirxah olmuş şaha.

Qurtuluş tapmaz cahanda, kim ona kin bəsləsə,
Qurtara bilməz əlindən, kim onunla çarpışa.

Nurlu rüxsarıyla nisbətdə günəş bir zərrədir,
Bir qarışqadır qılıncı qarşısında əjdaha.

Xoşzəban istər ona yaxşı işindən bəhs aça,
Yaxşı bu işlər doğar xoş xasiyyətdən bərməla.

Fəzli yüksək, fərri hədsizdir, səxası çox böyük,
Sinni az, ağlı – düha, keyfiyyətisə – kimya.

Hümməti şahın fələkdə bir yerə yüksəldi ki,
Yüksələ bilməz ora abdal, yüz il etsə dua.

Cəddinin misli cahanda bəllidir, şah olmamış,
Xəlçə yardımda bu öz cəddini qoydu arxada.

İş ona xidmət deyilsə, ləğvdir başdan-başa,
Söz onun vəsfi deyilsə, məncə, dəyməz yazmağa.

Kin-küdurət bəsləyər daim ona düşmənləri,
Bu səmərsiz səylər bir dərd olub, tapmaz dəva.

İlboyu mehrü məhəbbət dostlarına vird olub,
Ehtiyatsız, qorxusuz onlar hamı çatmış kama.

Şah söz söylərsə, mehrindən olar dünya cavan,
Mey içərsə, çöhrəsindən gül düşər qısqanclığa.

Bu əmirin yox səxavət, elmü ürfanda tayı,
Misli yox bir şah üçün asan deyil yazmaq səna.

Varlığıyla ədlü fəzl olmuş cahanda bərqərar,
Nə qədər dünya durur, çıxsın zəfərlər uğruna.

Laləyə döndərdi bir sözlə saralmış üzləri,
“Yox” sözü saillərə çıxmaz dilindən mütləqa!

Heç zaman məzlumlara zülm olmasın qismət deyə,
Olmasın heç vaxt bəlakeşlər bəlaya mübtəla!

Zülmdən bir an da rahət olmasın düşmənləri,
Həmdəm olsun canına bədxahlarının min bəla!

4

ƏBUNƏSR MƏMLANIN MƏDHİ

Hər kəsə canan əzizdirsə, deyirlər can deyil,
Başü can əmma mənimçün dünyada canan deyil.

Söyləyirlər, gəlsə can dərdi, itər canan qəmi,
Məncə, can dərdi nədir? Canan qəmi asan deyil!

Canımın dərmanı, təskini iki mərcan idi,
Can gedir əldən, nəsibi o qoşa mərcan deyil!

Ay üzü zülfündə pünhandı, bulud altında tək,
O bulud ətrafına dönmək bu gün şayan deyil.

Ay buludda gizlənərkən, mən görərdim hər zaman,
Gizlənər məndən bulud da, indi ki, pünhan deyil.

Gülşənə oxşar, keşikçidir ona bir cüt ilan,
Gül camalına cahanda tay heç bustan deyil!

Gül dərərdik bir gülüstandan keşikçi var ikən,
Yox keşikçi, indi gül dərmək bizə asan deyil!

Sünbülüstan, həm gülüstan idi cananın üzü,
Güllə sünbül bəsləyən bir bağçada, bağban deyil?

Yad gözündən saxlamaqçın mən qopardım onları,
İndi nə gül var, nə sünbül, bu məgər hicran deyil?

Dilbərim üz döndərib getdi biyabana tərəf,
Göz yaşımdan bir biyaban varmı ki, ümman deyil?..

Dərdim hicran dərdidir, nalə edərsəm, əfv edin,
Dünyada heç bir aləm hicran kimi suzan deyil?

Gözyaşımdan qorxuram dünyada bir tufan qopa,
Öylə bir od var canımda kim deyər vulkan deyil?

Aşiqin peşman olubdur etdiyindən, ey sənəm!
Vəsldən şad olmasın könlü, əgər peşman deyil!

Mehrini əskiltmədi, çün səndə nöqsan tapmadı,
Mehrini artırdı aşiq, mehr ona nöqsan deyil!

Gül yanağında qoşa zülfün ki, cövlan etməyir,
Od salıbdır canıma eşqin, məgər cövlan deyil?

Səndə cüt çovqan olanda qəlbimi top bilmədin,
İndi qəlbim top olubdur, vurduğun çovqan deyil?

Bir təsəllim var, dözər canım sənin hicranına,
Xidmətindən düşdüyüm ayrı, əmir Məmlan deyil!

Dünyanın həşmətli şahı canlılarçındır günəş,
Yox elə bir fikri ki, məclis, döyüş meydan deyil!

Sayəsində zər ucuzdur, şeir minmiş qiymətə,
Xidmətini can verib alsan, bu can ərzan deyil!

Hümməti yüksəkliyiylə xaliqin fərmanıdır,
Varsa çox qiymətli şey: amma belə fərman deyil!

Varmı bir eylə fəzilət, bilməsin Məmlan onu,
Hansı elmi görmüsən ki, onda şah Loğman deyil!

Mən onu vəsf eyləyərkən, hər nəyi versəm sifət,
Tapmaram öylə sifət ki, min kərə şayan deyil!

Var yeri, mədhində min ifrat ilə böhtan desən,
Fəzlinə baxsan, görərsən, heç biri böhtan deyil!

Hər könüldə var ona qarşı ədavətdən əsər,
Küfr tutmuşdur o qəlbi, məskəni-iyman deyil!

Elmi, idrakı böyükdürsə, qəribə gəlməsin,
Çox da ki, azdır yaşı, ağ saçlı bir piran deyil!

Onda var saillərə mal verməyə öylə həvəs,
Heç xəsis mal yığmağa bir o qədər xahan deyil!

Hər qədər dünya durur, kamınca dövr etsin fələk,
Bəxtinə yar olmasa dövran onun, dövran deyil!

Fəzlinə göylər qədərdir, söyləsəm, ey padişah!
Bəxşişin əndazəsi dünyada heç ehsan deyil!

Nəhsi-Keyvandan elə pak etməsin aləmləri,
Çərxdə Keyvan görən zənn eylər o Keyvan deyil!

İddia etsən əgər, peyğəmbərəm, haqqın da var,
O qılıncınla əlin, yoxsa buna bürhan deyil!

Kim sənə pislik dilərsə, ağlı naqisdir onun,
Kim səni dostu bilərsə, məncə, o, nadan deyil!

Yaxşı adla bir bina qurdun ki, durduqca cahan,
Yel, yağış vursun həmişə, o bina viran deyil!

Rəsmdir, hər ölkədə altun yeri zindan olar,
Tək sənin ölkəndə altun məskəni zindan deyil!

Varmı bir qüdrətli ki, hər əmrinə baş əyməsin?
Varmı bir müflis ki, sayəndə sənin sultan deyil?

Sanma, şahlardır, böyüklərdir qonağın hər gecə,
Bir gecə var ki, evində xəlq bütün mehman deyil?

Qəm yemə, puldan, əgər yoxdur əlində bir girov,
Bir ürək yox ki, girovda şah üçün qurban deyil!

Hansı şair var ki, mədhinlə sənin fəxr eyləməz?
Nemətindən feyz alan kim var, üzü xəndan deyil?

Varmı bir kəs, görməsin min-min kərə ehsanı?
Varmı bir kəs, ağlına, idrakına heyran deyil?

Mən sənə Nuh ömrü, həm mülki-Süleyman istərəm,
Nuh, Süleyman çox böyükdürsə, fəqət Məmlan deyil!..

5

ONUN MƏDHİ

Cahanda yox sənə tay, ey əmir, ədalətdə,
Nə səydə, nə əməldə, nə də səxavətdə!

Şərəf nə varsa, fələklər sənə əta etmiş.
Hünər nə varsa, səni malik o xuda etmiş.

Cahanda qalmadı meydan ki, olmadın onda,
Hələ qalır atının nal izi o meydanda.

Verildi xəlqə bütün, qalmamışdır, ey sərvər, –
Zəmanə şahlarının xəznəsində bir gövhər.

Bünövrədən yıxılıb gürzün ilə çox qalalar,
Deşilməyən oxun ilə, de, harda bir qala var?

Adın cahanda bu gün hər ağızda əzbərdir,
Nə əmrin olsa, xuda əmrinə bərabərdir.

Hanı, sənin kimi məclisdə zər səpən sultan?
Hanı, sənin kimi meydanda ordular dağıdan?

Cahan əmirləri içrə tayın görən yoxdur,
Sənə bərabər olan şah nişan verən yoxdur!

Əsər ki, mədhinə həsr olmadı, əsər olmaz,
Qılıncla nizən işə düşməsə, zəfər olmaz!

O kəs ki xidmətinə sərf qılmamış zəhmət,
Nə haqla xəznədən alsın gərək o da qismət?

Bilikli, varlı adamlar səfər edirsə əgər,
Sənin hüzuruna çatmaq olardı yaxşı səfər.

Nəsibim olmasa da, heç zaman dərgahın.
Cahanda mən kimi yoxdur bu gün də məddahın.

İki əmir mənə vəqf edib kiçik bir kənd –
Ki, məndən özgə əkinçi o kənddə tutmaz bənd.

Bu gün mənimkidir, ancaq sabah mənimki deyil,
Mənə bu neməti də çox görənlər olmuş, bil!

Gəlir bu nahiyəyə hər mübaşir əvvəllər
Deyir ki, kəndinə mən salmaram tamahla nəzər.

Bir az keçir, yerini bərkidir, olur aram,
Deyir: – Bu kəndi kökündən gərək çapıb aparam!

Deyəndə vergi qoyulmur mənə, sən al vergi,
Şərikliyəmsə də, baxma, tamam sal vergi!

Eşitmək istəməyir, etməyir əsər söz ona,
Deyir: – Danışma hədər, sözlərində yoz mənə!

Düşünmüşəm ki, qəmə dözməsəm, qəmim artar,
O pislik eyləyənin arxasında pislər var.

Sənə açıb deyirəm, ey əmir, dərdimi mən,
Zərər toxunmamalı heç kəsə bu sözlərdən.

Ona sənin kimi şahdan ki, bir xətər yetməz,
Mənim kimi qulun halı, yəqin, əsər etməz!

Xeyir xəbərlə açsın qulağını yaradan,
Səxavətində tayın yox bəşərdə, ey Məmlan!

Fələk səni o günə salmasın, cəfa çəkəsən,
Ədalətinlə bütün yer üzündə sən təksən!

6

Bax o rüxsarə, sərv üstə sənə əgər qəmər lazım,
O zülfə bax, sənə ayçın əgər mişkin kəmər lazım!

Ləbiylə dişlərin istər, üzüylə zülfünü istər,
Kimə mərcan içində dürr, gül üstə mişki-tər lazım!

Yanağın, zülfünü iylər, öpər göz, həm dodağından –
Kimə ki, gül ilə şümşad, badam ilə şəkər lazım.

Kim istər zəfəran, gəlsin, mənim rüxsarıma baxsın,
Onun rəngi-ləbin gəzsin, kimə ləlü gövhər lazım.

Düşər eşqinə hər kəs ki, gəzər daim ürək dərdi,
Dalar vəsli-xəyalinə, o kəs ki, dərdi-sər lazım.

Çəkər zülfündəki hər tük, qopardar bir ciyər, bir can,
Mənə zülfü üçün hər gün yeni canla ciyər lazım!

Sən ey aydan gözəl canan! Sənə bir kəs könül versə,
Canına hər gecə on dəfə atəşdən sipər lazım!

Gözün bir baxmaq ilə qəlbimə mütləq zəfər çaldı,
Ləbindən öpməyə bir gün dodağıma zəfər lazım!

Cahanda gün gələr, hər kəs muradına çatar, lakin
Ona Allah verən sağlıqla, ustaddan nəzər lazım!

Sağ olsun Bür-Müəmmər ki, cahanı eyləmiş abad,
Bu gün insanlığa ancaq elə xeyrül-bəşər lazım.

Onun xoş sözlərin dinlər, onun yazdıqların anlar,
O kəs ki sonsuz elmindən bilə bir müxtəsər lazım...

Qılıncından qəmin qorxar, zireh sazlar vəfasından,
Biri qorxarsa aslandan, sənasından sipər lazım.

O şəxsin ki, rəvandır yüz şəhərdə əmri, fərmanı,
Ona hər elmə vaqif bir belə əhli-bəsər lazım.

Ağılla hər sözü bitsin, şəhərlərdə sözü ötsün,
Sözü gövhər olan şəxsə dənizlər tək hünər lazım.

Onun fəzlü kamalından nə zahir eyləsəm, azdır,
Böyüklər barədə yazmaq üçün çoxlu xəbər lazım!

Danışdıqda onu dinlə, sözün dəryasını gör sən,
İşinə sal nəzər, bil ki, fələk qədri qədər lazım!

Fəzilətdə ucalmışdır məqamı, bir yerə çatmış,
Gərək təxti fələk olsun, tacı başda qəmər lazım!

Sən, ey ədlü səxasıyla verən insanlara imdad!
Sənə imdad üçün xaliq özü imdadgər lazım!

Qılıncın yaxşı iş gördü, o bədxah başları kəsdi,
Elə bədxah baş üstündə qılınc şamü səhər lazım!

Ürəkdə yatmağa rağib, həmişə getməyə talib,
Təamı qəlbinin qanı, şərabıysa zəhər lazım!

Mənə hər kəsdən artıq sən edibsən yaxşılıq, indi –
Sənin fəzlin qabaqlardan mənimçin beşbetər lazım!

Mənə hər gün səxavətlə xələtlər bəxş edirsən sən,
Utansam da, deyim, səndən mənə zər bir qədər lazım!

Görüm, bəxtin ağacında zəfərdən bollu bar olsun,
O kəslərdir ki, azadə, yesin, dadlı səmər lazım!

7

Könlümü verdim ona, sandım könül şadan olar,
Candır o, can istəyən yerdə könül qurban olar.

Can ilə könlüm əzizlərsə onu, var illəti,
Dilbərə dil bağlanar, can talibi-canan olar.

Üz-gözü xəndan, dodağı qırmızı lalə ikən,
Hər gülər üz eşqinə düşsə onun, nalan olar.

Toplayar lalə, üzündən qışda da hər istəyən,
Gülsə, məclis bu gülüşdən dürr dolu ümman olar.

Al yanağın əksi düşsə, dürrə ümmanda, yəqin,
Dürr rəngi bu şəfəqdən löleyi-Neman olar.

Dürr yağışdandır, görünsə dişləri cananımın,
Dürr həyasından dönər, bir qətreyi-baran olar!

Zülfünü açsa, işıqlı gün olar zülmət gecə,
Görsə rüxsarın gecə-gündüz kimi taban olar.

Gözlərinə bir nəzər salsa bulud, dürr yağdırar,
Zülfünü öpsə külək, toz mişklə yeksan olar.

Ey gözəl, meydanda aysan, məclis içrə bir günəş,
Bu səbəbdən varlığın, bil, fitneyi-dövran olar.

Dost odur ki, sevdiyi dostdan bezib ayrılmasın,
Gah onunla məclisə, gah varidi-meydan olar.

Kim sənə bağlansa, könlündən kədər, qəm, ayrılar.
Qüssə çəkməz, hər kimi qəmxarı Vəhsudan olar.

Bir elə fərman verən ki, dövrünün hər bir günü,
Tanrını fərmanı ilə əhdi cavidan olar.

Bir kəramət sahibi ki, əhdi pozmuş düşmənə
Gəlsə qalib, şərti ancaq əhdinə peyman olar.

Qəlbi küfr ilə dolar, mömin ona kin bağlasa,
Kafərin könlündə mehri tutsa yer, iyman olar.

Üstün olsa bir neçə gün mülkünün düşmənləri,
Şahla düşmənlikdə üstünlük dönüb nöqsan olar.

Nəqd olar nisyə, bütün yığdıqları əldən gedər,
İncisi çaylaq daşı, lalələri yovşan olar.

Ox, qılınc əldə, ona qarşı çıxarlarsa əgər,
O qılınc əldən düşər, ox ucları peykan olar.

Düşmən ilə harda üzləşsə, vuruşsa hökmdar,
Torpağı, daşı, qumu al qan ilə əlvan olar.

Torpağı mis rəzəsi, tikanı zubinə dönər,
Daşları yaqut kimi, narın qumu mərcan olar.

Atdığı hər ox deşər sindanı yumşaq mum kimi,
Düşmən atsa ox, şahın mumu polad sindan olar.

Bil sənə qarşı ürəkdə yatsa kin, ey padişah!
Bir daha durmaz, mələk də olsa, o, şeytan olar.

Sən topu çovqanla bir gün bəlkə də vurdun deyə,
Gah alar top şəklini, gah Ay dönüb çovqan olar.

Adət üzrə bir fəlakət üz verərsə ölkəyə,
Könlünə salma kədər, düşmən görüb xəndan olar.

Qəlbi qırmaq şahlara layiq deyil, qırdınsa, bil!
Dişsiz aslan, pəncəsi varsa, yenə aslan olar!

Kim şaha qəsd etsə, dünyası onun alt-üst olar!
Canını qəm çulğayar, bu qəsddən peşman olar!

Taleyində hər nə pislik vardı, qaldı arxada,
Dövlətin bundan belə, cənnət, elin rizvan olar!

Yer üzündə sən özün sultan olarsan, mütləqa!
Tezlik ilə hər qulun bir ölkədə sultan olar!

Üz-üzə gəlmişsə də, peşman olubdur düşmənin,
İndi bax, peşmançılıqdan sinəsi büryan olar.

Sən nəsihət verdin, o qorxdu, nəsihət qanmadı,
Ağlıkamil bir kişi qorxsa, dönüb nadan olar.

Yox əmirlərdə o qüdrət ki, görə rüxsarını,
Tək görər onlar ki, qəlbində sənə iyman olar.

Şirdən artıq tülkü həm hiylə və həm də fənd bilər,
Şirlə rastlaşdıqda həm ondan və həm bundan olar.

Uçmağa qalsa, göyərçin şahinə üstün gələr,
Şahini gördükdə amma titrəyər, heyran olar.

Yüz min ulduz var, günəş birdir, saçanda nurunu,
Göydə bir ulduz belə qalmaz, tamam pünhan olar.

Yaxşı baxsan, sən böyüksən, o kiçikdir, rəsm var.
Bir kiçik qorxsa böyükdən, hörmətə şayan olar.

Hər qədər dünya durur, bir an da sənsiz olmasın,
Səndən ayrılsa cahan, başdan-başa viran olar!

8

## ƏBU MƏNSURUN MƏDHİ

Bənövşədən gül üzün, ey sənəm, edibdi süpər.
İki hörük qoşa əfi kimi yanağın öpər...

Gözünlə zülfün arasında qopdu bir qovğa,
O halqa saldı işə, bu oxu ona yeridər.

O qoşa zülfünə bir bax ki, halqalanmışdır,
Bu rəsmdir, basılanlar başı aşağı düşər.

Məqamı sərvin həmişə səfalı bağda olar,
Qamışsa, rəsm budur, batlağın yanında bitər.

Səni o sərv boyun xatirinə istər bağ,
Mənim gözümsə qamış həsrətində yaş çiləyər.

Sənin belinlə mənim cismimin nişanı itib,
Yox indi səndə ağız, məndəsə ürəkdən əsər.

Birindən ah, birindən fəğan məndə qalıb,
Sənin birinə sözündür nişan, birinə kəmər.

Yanağının odunu ənbər ilə örtmüşsən,
Axanda göz yaşın, örtər onu şəkər ləblər.

Nə ənbərin alışar şöləsindən atəşinin,
Nə gözyaşı yağışından o şəkkərin əriyər.

Niyə sığındı sənin zülfün altına ürəyin,
Sevərmi heç de qaranlıq gecəni nilufər?

Həmişə qəsrimi Kəşmirə döndərər çöhrən,
Həmişə sərv boyun bağımı edər Keşmər...

Məgər çatıb sənə də bu ki, pərdədarbaşı,
Mənə nədənsə edir başqa bir göz ilə nəzər?

Cahana, dövlətə candır, əmin Əbu Mənsur,
Bütün sülalə onun varlığıyla fəxr eylər.

Cahan onunla, bədən ruh ilə qərar tutmuş,
Fələk onunla tapar nəzm, nur ilə gözlər.

Başında pis fikir, ağlında bir xəta olmaz,
Nə pis bir ad götürər, nə suda şəkil çəkilər!

Ağıl səninlə, şahım, əql ilə vücud öyünər,
Sədəf gövhərlə əzizdir, səninlə elmü hünər!

Cahan yaratdı səni, sənsən izzətinə səbəb,
Sədəf onunla əzizdir ki, bəsləmiş gövhər,

Sən əmr versən, əməl etməmək olar üsyan,
Sənin əməllərini hər danan olar kafər.

Qılıncını yada saldıqda ruh qanla dolar,
Əlindən ad çəkənin ağzı kimyaya dönər.

Sənin döyüşlərinin vəsfi də igidlikdir,
Səxavətindən açan bəhs, həqqi var, öyünər.

Səxavətin ürəyi, nuru, qəlbisən kərəmin,
Vəfa başında ağılsan, xeyir canında ciyər.

Ədavətində qənimsən, səxavətində kərim,
Qılıncın səddi yarar, bayrağın qurar səflər.

Hər ay birinci gecə aypara, əziz tutular:
Axı o, köhləninin ay nalına çox bənzər.

Eşitsə nizənin haqqında vəsflər xaqan,
Qılıncını çəksən əgər görsə bərqini qeysər.

Birinci, kar quluna, sərvərim, həsəd aparar,
İkinci, kor nökərin Halına min qibtə edər.

Düşərsə əzm işığın hər daşa, edər yaqut.
Əlin nəsimi qara torpağı qılar ənbər.

Cahan xilafınasan elmdə, səxavətdə,
Cahan həmişə olubdursa da xilafi-bəşər...

Sən ey sünurlar açan, düşməni salan bəndə,
Verib də xəznəni bir mədhi eyləyən əzbər.

Əziz idi hamıdan, hansı yerdə olsaydım,
Sənin gözündə nədən olmuşam belə bifər?

İnanmasan sözünə bəndənin, nə çox şair,
Mənimlə azca tutuşdur və mərhəmət göstər!

Əgər biri mənə tay olsa şeir yazmaqda,
Sənə nə ki, demişəm, bil, yalandır, ey sərvər!

Fələk həmişə edir dövr, yaxşısı, pisi var,
Həmişə ulduz ilə üzləşər xeyir, ya şər.

Sənin səadətinin namına fələk dönsün,
Həmişə şahlığını nura çulğasın göylər!

9

## ƏMİR ƏBÜLFƏTİN MƏDHİ

Əgər bəla aramırdı cahanda xəlqə zaman,
Niyə onun üzünü etdi xəlqdən pünhan?

Əgər o, qəlbi yanıq, ağlar istəməzdi məni,
Niyə edirdi onun hüsnünü ürək qoparan?

Əgər deyil ürəyim eşqdə yanar təndir,
Niyə gözümdən axan yaşla qopdu bu tufan?

Əgər belimlə deyil bir nəsəbdən o zülfün,
Niyə belim əriyib, zülfünə olub taban?

Əgər gözüm bulud, hüsnün deyilsə gül, ya çiçək,
Niyə mən ağlar ikən ay üzün olur xəndan?

Əgər sənin qara zülfün deyildi çovqanbaz,
Niyə gümüş topa o, tuşlamış səmən çovqan?

Əgər səni, yaradan yazmamışdı dərdə dəva,
Niyə gözün gətirər dərd, ləbin verər dərman?

Əgər həyat suyu xəlq olmamış dodağında,
Niyə tapır ölülər, bircə busə versən, can?

Əgər deyilsə sözün bir nişanə ağzından,
Niyə sükutun edib qönçə ağzını pünhan?..

Əgər mənimlə gözün istəməzsə cəngü cədəl,
Niyə kamanə qoyub oxları, tutar peykan?..

Əgər bu canıma dərdü bəla deyil arzun,
Niyə o incilər üstünə qoymusan mərcan?

Əgər günah sayılır küfr örtsə iymanı,
Niyə üzündə düşüb küfrün altına iyman?

Əgər o naz ilə qəmzən şahın qılıncı deyil,
Niyə alır o, qılınctək sevən bədəndən can?

Əgər deyilsə Əbülfəth Əmir cahan şahı,
Niyə cahanı edib dövlətiylə şad, abadan?

Əgər o, düşməninin başının bəlası deyil,
Niyə bəladan onun düşməninə yoxdur aman?

Əgər fələklər onun istəyincə dövr etməz,
Niyə hər istəyini əldə eyləyir asan?

Əgər qılıncı deyil, sindan odlayan atəş,
Niyə qılıncı dəyərkən muma dönür sindan?

Əgər demirsə o “peyğəmbərəm zəmanədə mən”,
Niyə qılıncı, əli möcüzə edir elan?

Əgər deyilsə bəla, nizəsi onun küfrə,
Niyə həmişə tutur küfr əhlinə divan?

Əgər qılıncın, ey şəhriyar, deyil atəş,
Niyə dönür külə əynində düşmənin kaftan?

Əgər yaranmamısan məddaha gövhər kanı,
Niyə sənə yazılan mədhlər yaratmış kan?

Əgər deyildi baban şahların böyük sələfi,
Niyə öyübdür onu həqq sözü olan Quran?

Əgər deyil sənin ömrün bütün cahana dayaq,
Niyə tapıb sənin ömrünlə cah-calalı cahan?

Əgər deyil yer üzü düşmənin üçün zindan,
Niyə dodaqlarını çeynəyir dişiylə zaman?

Əgər deyildi sənin elmü mərifət arzun,
Niyə bu ölkə oxunla çıxıb bəlalardan?

Əgər qılınc-qələmində deyil xeyirlə zərər,
Niyə verir qələmin xeyir, qılıncınsa ziyan?

Əgər deyilsə qonaq zər, gövhər xəzinədə,
Niyə cəvahirə xəznəndə yox həmişə məkan?

Əgər fəzilətin hər bir kəsə deyilsə əyan,
Niyə bilir onu asan bir iş mədihə yazan?

Əgər yaranmamısan fəzlin ilə peyğəmbər,
Niyə bilikdə sənin şairin olub Həssan?

Əgər həmişə cahan şahı olmaq istəməmisən,
Niyə fələk sənə vermişdir ömri-cavidan?

Əgər günəşlə bərabər deyil sənin ver əlin,
Niyə verir bütün insanlara əlin ehsan?

Əgər yaranmasa şövkət fəzilətə düşmən,
Niyə yetirdi cəlalın fəzilətə nöqsan?

Əgər deyilsə sözüm doğru, onda söylə mənə,
Niyə məni arayıb tapmayır şəhi-Arran?

10

ŞƏRAFƏDDİN MƏLİK CƏSTANIN MƏDHİ

Əgər könül yerinə canı istəsə canan,
Qəsəm onun canına, etmərəm müzayiqə can!

Deyilsə candan əzizraq cahanda cananım,
Nə üçün ayrılıq etmiş də könlünü giryan?

Fəraqı, vəsli olubdur mənim xeyir, zərərim,
Yolunda daim onun hey çəkərəm ah, fəğan.

Cahanı, canı mən onsuz təsəvvür etməyirəm,
Yanımda hər ikisindən əzizdir canan!

Tutiyadır gözümə ənbər ilə şümşadı,
Mərcanı ney şəkəri, dərdimə olmuş dərman.

Boyu ki sərvi-rəvandır, üzü ki bədri-tamam,
Yaraşar olsa yeri asiman, sərvistan.

Sədəfdir ağzı, iki cərgə dürr ilə doludur,
Dilə gəlib danışanda yağar dürr ağzından.

Ləbinə, dişlərinə hər kimin sataşsa gözü,
Ləbini bəlkə kəsər dişləri heyranlıqdan.

Sözü ki mişk qoxar, zülfü mişk, ənbərdir,
Kiçikdir ağzı onun mişkdan boğazından!

Üzüylə könlüm olar şad, gözlərim rövşən,
Yetəndə vəslinə yarın könül tapar təzə can.

O ağzın açsa, dolar bağ mişk-ənbərlə,
Əgər saçın darasa, ətrə qərq olar bu cahan.

Üzü, saçı, dodağı eyşimə verir rövnəq,
Necə ki, xəlqi edir şadiman Məlik Cəstan!

O şah dinə şərəfdir, məliklərin böyüyü,
Bütün böyüklər onun xidmətindədir hər an.

Onun ətası hələ bilməyir nədir təxir,
Onun sözü hələ ki görməmiş, nədir böhtan!

Gözəl ad ilə, gözəl xasiyət, zövq idrak,
Ağıl, kamal ona miras qalıb ata-babadan!

Qələmi bürcü tutar, şah yıxar qılıncı onun,
Dili mirvari səpəndir, əliysə inci saçan!

Alar qılınc-qələmiylə cahanı düşməndən,
Əli, diliylə edər dostlara cahan ehsan.

Səxavətiylə sənin ərşə yüksəlir başın,
Onun sözüylə canın qurtular da qovğadan.

Əgər deyərsə ki, peyğəmbərəm zəmanədə mən,
Əli, qılıncı olar iddiasına bürhan!

Əlində möcüzü var Məryəm oğlu İsanın,
Qılıncı, möcüzəsi eyni Musiyi-İmran!

Uzun ola Məlikin ömrü Nuhun ömründən,
Cahanı etmiş onun ömrü böylə şad, abadan.

Cahanda görməmişəm bunca rəhmdil bir əmir,
Kərəmdə misli olan şah yetirməmiş dövran.

Səxavətində də, fəzlində də əvəzsizdir,
İnanmasan, əlini sıx, dilini dinlə, inan!

O yaxşılıq hanı ki, qoymamış fələk canına?
O xoş sifət hanı ki, verməmiş ona Yəzdan?

Məgər deyilmi bu zinət ki, Mir Şəmsəddin,
Zəfərlə, düşməni sərkərdə tək edir heyran?

Əbül-Məali, o alinəsəb və alirəy,
Əmirlər ülvisi, ondan bəzək tapır eyvan.

Adamsevərlik, igidlik, ağıl və düzlükdə –
Keçər yüz əsr, fələk mislini verməz də nişan!

Cahanı gəzsən, inan, olmayacaq misli, tayı,
Var ondan özgə məgər dadlı, duzlu, düz danışan?

Kiçiksə yaşda, böyükdür məqamı, şəni onun,
Ağılda qos-qocaman, dövlət işlərində cavan!

Həmişə könlü şən olsun, başı uca, özü şad,
Qəm ilə, qüssə ilə düşməni çürütsün can!

Həmişə dostları olsun sevinc ilə xəndan!
Həmişə düşməni olsun məlal ilə nalan!

Həmişə birgə zühur etməyir əyanla xəbər,
Həmişə eyni səmər verməyir yəqinlə güman.

Yəqindir şahlıq ona, iddiasına yaraşan,
Xəyaldır özgəsinə təxtü tac, onunçün əyan!

Məqamı dostlarının taxt olsun izzətlə,
Kim istəməz onu, tapsın qara qəbirdə məkan!

Həmişə bədxahının naləsi göyə qalxsın!
Ona kim əyri baxarsa, gözünə damsın qan!

11

## BAHARİYYƏ

*Buluda xitab*

İşıqlı çeşmə önündə olan qara pərdə,
Dağın başında dəbilqə, zireh fələklərdə!

Qəzəbli görkəmin insanlara sevinc gətirir,
Qara üzünsə bütün aləmə işıq yetirir!

Fələkdə bir bucağı ey məkan edən şahim,
Günəşlə yoldaş olub göydə bir gedən şahim.

Külək sənə at olar gah, çərx bir meydan,
Yerin də gah ucalıq, gah da çalxanan ümman...

Ağaclara sulu mərcan ilə bəzək verdin,
Bağa, çəmənliyə firuzə don geyindirdin...

Edibsən hər çəməni, bağı yüz nigaristan,
Ağaclar üstə ötər yüz müğənni bir dastan.

Bulud fəzada ki, xatırladır zərif ipəyi,
Səpər bağa, çəmənə zər, gövhər şimal küləyi.

Oturduğun saraya yüz gözəl bəzək vurmuş,
Gəzişdiyin çölü yüz nemət ilə doldurmuş,

Düzəndə ərğavanın qollarına yüz mərcan,
Səpər o yasəmənin qoynuna gövhər neysan.

Nə xoş ki, incilərə bağça-bağ qərq olmuş,
Nə xoş, ipək geyinib şaxələr, bara dolmuş.

Olub çəməndə gülə nərgizin gözü heyran,
Mənim gözüm kimi şuh görsənər ona canan.

O dilbərin ki, fəraqi-qəminə odlanıram,
Ürəkdə ağlayıram, canda od tutub yanıram.

Bəzək verir evimə surəti eşikdə ikən,
Duyuram evdə ikən ətrini eşikdən mən.

Ürəyim eşq evidir – eşqi onun gündür, inan!
Qıfıllasam qapını, nur, işıq saçar bacadan!

Onun camalına bax, istəsən süsən görmək,
Düşübsə sünbülə meylin, əlini zülfünə çək!..

12

## ŞAH ƏBUMƏNSURUN MƏDHİ

Dilbərin rüxsarı tək xəndan olubdur laləzar,
Lalənin eşqində ağlar bərqi-nisan zar-zar!

Yaz nəsimindən tikanlıqlar dönübdür gülşənə,
Gözyaşı tökdü bulud, odlu şoranlıqlar bahar.

Bağ, Xərxizə dönüb, güldü çəmən xərxar tək,
Dağ fələk rəngi alar, səhra behiştə oxşayar.

Sübh vaxtında seçilməz asimandan dağ başı,
Bax, necə gör, birləşibdir asimanla kuhsar.

Vəsl uman aşiq kimi bülbül qılar ahü fəğan,
Gül gözəllər surəti tək görsənər nazlı, xumar.

Susəni tozdan təmizlər xeyrini neysan yuyar
Nərgisi-nəsrin üzündən yel niqabı qaldırar.

Bülbülün fəryadı Sərkəş tək çəməndən yüksələr,
Qumru dönmüş Barbədə, şah bəzmidir şaxi-çinar.

Çöllər al-əlvan geyib, zinət verilmiş dağlara,
Tarlalar firuzə donlu, şaxələr yaqutbar.

Səbirdən qalmaz əsər, eşq atəşi tüğyan edər,
Necə ki günlər uzandıqca, gecə nöqsan tapar.

Kəklik ötdükcə, xatırlar dost səsini dostunun,
Çəngin avazında yar, avazını yarın duyar.

Bağ dönübdür öz büsatıyla şahın dərbarına,
Gaviyan bayrağı tək gövhərlə olmuş meyvədar.

Bar günü axça səpilmiş bəzmə oxşar qönçələr,
Mişk tək arxlar kənarında bənövşə ətri var.

Mişklə dolmuş nəsimindən baharın dağ, dərə,
Dağ-daşa lalə çilər qan, od olub atəş saçar.

Bu, şahın şadlıq günündə bəzminin təsviridir,
O, döyüş vaxtı şahın meydanını xatırladar.

Ver əliylə bir günəşdir şah Əbumənsur kim,
Dosta dünyanı behişt etmiş, rəqibinə hasar.

Bəxşişinin həddi yoxdur, lütfünün əndazəsi,
Olmasın mülkünə sərhəd, ömrü olsun payidar!

Mehri, nazıyla silər o ay üzündən ləkəni,
Bəxşişi qoymaz tamah olsun könüllərdə qubar.

Göy onun pişxidməti olmuş, günəş qulluqçusu,
Həqq ona nüsrətverəndir, yavəridir ruzigar!

Nəzmə düşməz bar, əgər olmazsa təbi mərdlik.
Qatmasa əl, xeyirxahlıq tutmaz aləmdə qərar.

Hər diyardan dəstə-dəstə mülkünə şair gəlir.
Öpməyə astananı amadədir yüz şəhriyar!

Pak qəlbi, düz yolu azmışlara yol göstərir,
Ver əli acgözlərə dünya malından əl tutar.

Tanrı öz nurundan o şahı yaratmışdır, ona –
Dini, elmi, bəxşişi etmiş bu dünyada nisar.

Əql – yerdir, fəzl – dam bəxşiş evində, mütləqa!
Geydiyi hər paltara arğac – xeyir, en – iftixar!

Versə min vədə birinə, heç zaman çıxmaz xilaf,
Min kərə bəxşiş verər, bir dəfə qoymaz intizar.

Ey hüzuruna gələnlər xəznəsindən bar yeyən!
Ey qılıncıyla edən düşmənlərin canın şikar!

Çarəsizlər çarəsi, ey kimsəsizlər kimsəsi!
Əl tutan möhtaclara, qəm əhli üçün qəmküsar!

Harda sən olsan, səxavət də tapar orda məqam,
Harda sən seçsən məqam, orda vəfadır bərqərar!

Ey bilikdə başbilən rəhbərlərə yol göstərən!
Ey tökən mərdlikdə pulsuzlar ayağına dinar!

Harda olsam mən, olub mədhini dilimin əzbəri,
Harda olsam, şükrün olmuş məndən ayrılmaz şüar!

Keçdi aylar, keçdi illər, yetmədim dildarıma,
Həsrətindən getdi canım, ruhum oldu bərqərar!

Çox şükür o ərşi-fərşi xəlq edən Allaha ki, –
Qismət etdi şad görəm rüxsarını, ey şəhriyar!

13

ƏMİR ƏBÜLHƏSƏN VƏ ƏMİR ƏBÜLFƏZİN MƏDHİ

Bahar gəldi, cahan cənnət oldu, bəxt cavan,
Qızılgül örtüyü üzdən atıb, olub xəndan.

Sevindi düşməni küfrün, xəzanı oldu bahar,
Əzildi düşməni dinin, baharı oldu xəzan.

Əzəl səadətinin yox nəhayətindən əsər,
Fələk səadəti vermişsə, yox ona payan!

Ağılla ruh olub indi dostlara sirdaş,
Dili, əli kəsilib düşmənin, düşüb candan.

Ucaltdı Tanrı yenə bayrağını islamın,
Fələk yetirdi yenə küfr qüvvəsinə ziyan.

Pozuldu vəhdəti, oldu zəlil düşmənlər.
Quruldu dostlar arasında doğru bir peyman.

Yarandı əhd iki şahzadənin arasında,
Biri-biriylə görüşdü iki cavan sultan.

Qərar tutdu bu gün yan-yana Ay ilə Günəş,
Veribdir indi əl-ələ pələng ilə aslan.

Qalar muradına həsrət cahanda düşmənlər,
Tapar, yəqin ki, bədxahların canı nöqsan.

Belə deyərmiş o Söhrab-Rüstəmin oğlu,
Turandan ordu ilə İrana olanda rəvan:

"Mənim ki Rüstəm atamdır, mənəm onun oğlu,
Niyə bir özgəsinə tacı bəxş edib dövran?"

Sönükdü taleyi, yatmışdı bəxti Söhrabın,
Fəqət o düz düşünürdü, sözündə yoxdu yalan.

Yarandı vəhdət iki hökmdar arasında,
Muradı oldu o sərkərdənin cahanda əyan.

Veribsə indi iki bəxtiyar şah əl-ələ,
Cahanda başqasının təxtü tacı olmaz, inan!

Əmir Əbülhəsən – o lütfü bəxşişin təməli,
Əmir Əbülfəzl – o din ilə ədalətə kan!

Kərimdir hər iki şəhriyar, həm də əziz,
İkisiylə də edər fəxr yer üzü və zaman.

Biri külək tək əlindən səpər dirəm, dinar,
Biri qılınc buludundan tökər yerə mərcan

Biri səxavətə mədən, biri vəfada mətin,
Birisi nemətə xəznə, biri kəramətə kan.

Biri mey içsə, ona saqilik edər Zöhrə,
Biri top istəsə, vursun, fələk olar meydan.

Biri əliylə edər dostlara gümanı yəqin,
Biri qılıncla qılar düşmənə yəqini güman.

Tutar həmişə onun dövləti bununla qərar,
Bununsa nemətinin qədri yüksələr ondan.

Bunun təlaşına aləmdə yoxdur hədd-hüdud,
Onun səxavəti sahili görünməz ümman.

Fələkdən etməz həzər, hər kimin əmini budur,
Əcəl deyil vecinə, hər kimə o versə aman!..

Biri qılıncla dənizdə yaxar oda balığı,
Biri tikər fələyə Zöhrəni, alarsa nişan,

İti qılıncla edərlər qəzanı avarə,
Əcəl yolundan azar, görsə əllərində kaman.

İki əmir ilə iyman bayrağı ucalar,
İki əmir ilə küfrün evi olar viran.

Bu, dövlətiylə edər fəth bir neçə ölkə,
O, qüdrətiylə alar övc bir neçə qaladan.

Bunun kiçik quluna bəxşişi olar Tiflis,
O, öz kiçik quluna bəxşiş eyləyər Xətəlan.

Günəş gələndə Quzu bürcünə, olanda bahar,
Güləndə yer üzü, zinət tapanda bu dövran.

Görüm, sevinclə günəş ölkənə bəzək versin,
Necə gün altda açar lalə, su verər neysan.

Cəmaətin arasında belə məsəl vardır,
Keçib sınaqdan o, çatmış bizə ata-babadan:

“İki şirin arasında qalarsa bir qoç əgər,
Kələklə təhlükədən çox çətin ki, qurtara can!”

Nəzərdə tut ki, Quzu bürcüdür bu eyvanı,
Məni o bürcdə bir anlığa günəş saysan.

De, hansı çarə ilə qurtarar canın bir qoç,
Meşədə gərçi onu təkləmişsə cüt aslan?

Naz istəyirdi, niyaz verdi düşmənə bu əmir,
Qazanc umub o əmirdən rəqib, tapdı ziyan!
Başı ağır, cilovu boşdu, bilmədi düşmən,
Sevincə çatmaz əli, sarsılar əzabından.

Həmişə bir cürə dövr etməyir bu çərxi-fələk.
Zəmanə zülmünü təkrar eyləməz hər an!

Sənin çətinliyini eyləsin asan göylər,
Fələk tamamlasın, hansı işində var nöqsan!

14

MƏDHİYYƏ

Seyrangahı oldu küləyin bağ, gülüstan,
Oldu Tibetin mişki ilə bağ şəbistan.

Gülzarı söyüd şaxəsi mina şişə etmiş,
Lalə çölə bir mücrü kimi topladı mərcan.

Şişə ətir ilə, mücrü mişk ilə dolmuş,
Bu mişk əyandır, nədən o rayihə pünhan?

At çapdı külək bağda, tatar qarətə keçdi,
Səf çəkdi bulud, qarət olundu bütün ümman!

Ondan nəfəsi tər süsənin mişk ilə doldu,
Lalə ağız açdıqca, dolub dürr ilə bundan.

Qumru oxuyur, bülbül ötür nəğmə dəmadəm,
O, qissə deyil, bu oxuyur ayeyi-Quran.

Dağlar, dərələr, dürr ilə, yaqutla dolubdur.
Mişk-ənbər qərq oldu bütün tarla, biyaban.

Gülzar tutub əldə qədəh, sanki içər mey,
Bülbülsə müğənni tək ötər şövq ilə dastan.

Səhra bəzəyi ağca idi sanki xəzanda,
Dağlar isə tutmuşdu bir ağ örtü kətandan.

Aşiq gözü tək indi bulud yaş tökər hər dəm,
Şimşək, necə cananın üzü, parlayır hər an.

Xəllux gözəlinin qoşadır zülfü, yanağı,
Yaqut ləbi, ağ əndamı var, alma-zənəxdan!

Ənbərdən asıbdır bir aya o, iki zəncir,
Bircə günəşə müşkdən atmış iki çovqan.

Əldə qədəhi tutsa, verər məclisə zinət,
Ox atsa, kaman tutsa, dönər cənnətə meydan.

Pərvin saçar nurunu yaqut arasından,
Açsa ləbini, dişləri görsənsə o canan.

Ey surəti hüsnüylə edən Yusifi batil!
Ey sidqi önündə itirən şənini Səlman!

Həqq kimi mübarək olan, islam kimi ölməz,
Tovhid kimi vacib olan, iyman kimi şayan!

Rizvan sənə zidd olsa, dönüb Malik olar, bil!
Malik səni sevməklə olar cənnətə Rizvan!

Div, cin və pəri, vəhşilər, insan və şəyatin,
Fərmanına tabedi, nə əmr etsə Süleyman!

Qorxundan əgər indi qaçıb gizlənib onlar,
Qul tək baş əyərlər sənə, ver onlara fərman!

Bir gündə sənin payladığın altunu, şahım!
Mədəndən ala bilməz, ömür qoysa da insan!

Çiynində bənövşə ləçəyindən tikan olmuş,
Mehrinlə bənövşə yaranar odlu tikandan.

Məlumdu bu ki, Misrə yağış qətrəsi düşməz,
Olmaz elə bir gün ki, yağışsız qala Gilan.

Meyl etsə səxavət buludun Misrə kərəmlə,
Gilana qəzəb atəşini bir kərə saçsan –

On illər ilə Gilana bir qətrə də düşməz,
Verməz ara günlərlə, yağar Misirdə leysan.

Ey qəmdən ölənlərçin olan İsiyi-Məryəm!
Həqq yoldan azanlarçın olan Musiyi-İmran!

Vermiş sənə Tanrı, nəyi ki arzulamışsan,
Oğluna bərabər olasan ömrü firavan!

15

ƏMİDƏLMÜLK ƏBUNƏSRİN MƏDHİ

Dodaqmı, ya qızılgüldür, o üzdür, ya mədhi-taban?
Gülü mirvarid örtmüşdür, ay olmuş mişkdə pünhan.

Edər cövlan gül üstündə zireh kimi onun zülfü,
İgid xoşdur, zireh geysin, edəndə ərsədə cövlan.

Əgər hər yarpağı peykan nərgis görməmişsən sən,
Gözünə dəyməmiş sünbül ki, hər şaxı ola reyhan.

Onun nərgiz gözü, sünbüllü zülfünə nəzər sal sən,
Görərsən, hüsnü reyhandır, baxışda qəmzəsi peykan.

Əqiqdir ondakıləblər, ipəkdir büllur əndamı,
Əqiqi içrə var inci, ipəksə pərdə sindandan.

Yanaq kafur topdur, zülfü isə mişk çovqandır.
Ona gül yarpağından, saf gümüşdən üzdə var meydan,

Gərək meydan qızılgül yarpağı, xalis gümüş olsun.
O yerdə ki, topu kafurdur, tər mişkdən çovqan.

Xəyalımda onun hüsnü, gecə bağrındakı Aydır,
Qulağımda onun vəsfi şirindir yüz əziz candan.

Qədəm vurduqda kuyində, edər o kuyi bütxanə,
Otursa hücrədə, hücrə olar gülzar, sərvistan!

Gözüdür əql üçün afət, üzündə can olur rahət,
Bəladır qəmzəsi, hər busəsi min dərdədir dərman.

Sataşdıqda gözüm rüxsarına, durmaz gözüm yaşı,
Üzünü görməsəm bir an, qalar bu gözlərim giryan.

Qəmində gözlərim ağlar, gecə-gündüz edib adət,
Nə vəslə taqətim vardır, nə məndə can qoyub hicran.

Əqiqlərdən axar qan-yaş gözüm içrə bəbəklərdən,
Görübsənmi bu aləmdə, bəbək olsun əqiqə kan?

Nə vəslinə əlim çatdı, nə də hicranına canım,
Vüsalı can əritməkdə, deyil kəm heç də hicrandan.

Çox olmuş ki, dözüb dərdə bir aşiq vəslə çatmışdır.
Sevincindən uçub ruhu, uzaqlaşmış vücudundan.

Gərək dözmək onun vəslü fəraqına bacardıqca –
Dözüm əvvəl acı olsa, sonu şirin olar baldan.

Deyil Xacə Əmidən xidməti, yar vəsli, hicranı,
Deyil mümkün uzaq salsın bizi şadlıqla qəm ondan.

Yəhərlətdim elə bir at ki, dağdır zərrə yanında,
Qaçışda sanki aydır o, önündə isə Ay Keyvan!

Əgər hündürlüyü qalsa, belindən göylər alçaqdır,
Geniş bu yer üzü olmuş çadır boyda ona meydan.

Duruşda yer kimi möhkəm, qaçışda od kimi zirək,
Gücündə div kimi güclü, atılmaqda – qara qaplan.

Dənizdə dırnağından gah balıq böyrü əzilmişdir,
Dişindən göydə Xərçəngin döşü olmuş qana qəltan,

Onu görsəydi Rüstəm, heç zaman Rəxşi bəyənməzdi,
Nə də Şəbdizini Pərviz, nə öz Şəbrəngini Neman.

Onu bir yol da çapdım ki, sən özgə səs eşitməzsən,
Uğuldar divlə cadular, çəkər nərə pələng, aslan.

Qızanda torpağı, quşlar yanar göydə havasından,
Yağış torpağın islatsa, fələk çıxmaz o batlaqdan.

Çətin ki, yurd sala bir kəs o yerlərdə, məgər cinlər,
Dayanmaz bir nəfər yolçu, qərar tutmaz, məgər şeytan.

Məşəqqətlə gəlib, bir xacənin dərgahına çatdım –
Ki, almış dinlə dövlət feyz onun fəzlü kamalından,

Əmidəlmülk Bunəsr Mənsurun, ki zəhmindən
İpək paltar olar bədxahı əynində polad suhan.

Verər erkək şirə fərman, itaət gözləyər fildən,
Qaçırsa baş əgər bir gün bu taətdən, o fərmandan.

Çəkər hindi qılınc, əldə tutar möhkəm ağır gürzü,
Qopardar pəncəni ondan, çıxardar dişləri bundan.

Onun dərgahı zəvvardan boş olmaz heç zaman, bil ki,
Hələ yoxdur görən xacə evində olmasın mehman.

Deyərsən, gözlərinə dayə sürmə yox, həya çəkmiş,
Qida vermiş ona südlə deyil, helm ilə püstandan.

Əgər məclisdə gülzarı bir ordugah fərz etsə,
Olar altındakı təxti yəhər, çöl çadıra – eyvan.

Hücumu qorxusundan, beni bişmiş, qanı donmuşdur –
Başında Qeysəri – Rumdu, ürəkdə Çindəki Xaqan.

Cahanda altı ülvidən qalıbdı altı şey miras,
Bu altı xislətə ondan savay sahib deyil insan.

Vəfası İrəcin, fərri Fərudin, hikməti Səlmin,
Zalın nitqi, Samın zəhmi, Əliylə Rüstəmi – Dəstan.

Edər hər ayda qəsrində kərəmlə yüz qulu azad,
Libasıyla onun örtər bədən hər gündə yüz üryan.

Onun dərgahına salsan nəzər, bir qul də görməzsən,
Onun mülkündə bir cındır geyimli şəxs tapmazsan.

Bilik gülzarına fəzli onun tərtazə susəndir,
Adı olmuş həmişə hikmətin mənşuruna ünvan.

Qəzəblənsə, edər viranə bir abad iqlimi,
Gələrsə rəhmə, rəhmiylə olar abad yüz viran.

Qələm xacə əlində bir balıqdı sanki dəryadə,
Əgər olsa balıq altun, o dərya dürr saçan ümman.

Yatarkən xacənin sanki məkanı bir qızıl evdir,
Ayıq olduqda, bir simin fəzanı yer edər heyran.

Həmişə gec gedər yol, zənn edərsən ki, o sərxoşdur,
Tutar əslində rəftarı neçə sərxoşlara divan.

Qarasaqqaldır, var hər sözündə bir işıq məna,
Gəzər zülmətdə İskəndər kimi o, çeşmeyi-heyvan.

Onunla şad olar mömin, onunla qəm çəkər kafir,
Qara saç başını örtmüş, onun qəlbində var iyman.

16

## TƏBRİZ ZƏLZƏLƏSİ VƏ ƏBU MƏNSUR MƏMLANIN MƏDHİ

Olar mahal mənə eyləmək ümidi-məhal,
Cahanın olmayır əhvalı olmayır hər zaman bir hal.

Həmişə aləmin əhvalı, bil ki, boylə olub,
Dolansa, dönsə də daim qalır o bir əhval.

Cahanda başqalaşan bircə sənsən illərlə,
Həmişə sən dəyişirsən, dəyişmir ol məhü sal.

Uçurma boş yerə tale quşu, sən uyma fala,
Zamanla neylər o tale, cahanla neylər o fal?

Əbəscə söyləmə qurtuldu harda bir dindar,
Nahaqca goplama getdi nə yurda bir abdal.

Bu yerdə bəndə olan bəndə haqda söz söylər,
Bu yerdə Tanrı nə yazmışsa, çatmaz əqlü xəyal.

Həmişə Tanrı oyaqdırsa, adəm oğlu yatır,
Həmişə durmada insan, fələklər amma fəal.

Ürəkdir işləyən, etmə giley bu təqdirdən,
Bədəndə arzu, xəyal çoxsa, yadə düşmür əcəl.

Əzab, kədər yada düşmür günün keçəndə şirin,
Həmişə hicri unutdun görəndə dadlı vüsal.

Bu varda, həm də gözəllikdə söylə kim görmüş,
Cahanda Təbrizə tay qeyri yerdə ayrı mahal.

Zəmanə nemətə qərq etmiş əhli-şəhri bütün,
Şəhər tamam dolu insandı, vardı hər cür mal.

Əmir də, bəndə də, sərkərdə, fazil, alim də –
Bir işlə hər biri məşğuldu orda bir minval.

O həqqə taətə dalmış, bu xəlqə xidmət edir,
Bu yankı ad gəzir, amma o yankı gəzmədə mal.

Qəzəllə musiqi dinlər bu yankı, cam gözlər,
O yankı ovlayır ovlaqda itlə vəhşi maral.

Həyat sürər biri mütrüblə hər zaman gündüz,
Bu yanda hər gecə oxşar bir ayrısı qara xal.

Xəyalda hər bir adam fikr edirdi bir tədbir,
Deyirdi hər kəs özüyçün nə yolda sərf ola mal.

Yarımca ah çəkəcək anda qəlbi insanın,
Ağızda söyləməmiş dil yarımca söz, ya sual.

Fənaya uğradı Təbriz qəzanın əmri ilə,
Bir anda yetdi fələkdən bu şəhrə gör nə zaval.

Şəhərdə hər tərəfin döndü altı üst oldu,
Kiçildi qum kimi dağlar, qum oldu dağmisal.

Əyildi, sındı ağaclar, yer oldu dəlmədeşik,
Yerindən oynadı dağlar, su açdı həm pərü bal.

Bu yerdə ərşə çatan çoxlu qəsrlər vardı,
Bu yerdə aydan ötən sərv çəkmiş ayə sığal.

Hamanca sərvlərin qaldı indi bircə yeri,
Hamanca qəsrlərin oldu indi əsli xəyal.

Kim oldu burda xilas nalə adlı afətdən,
Əyildi qaməti qəmlərdən, oldu sanki nal.

Şəhərdə bircə nəfər yoxdu söyləsin, yemə qəm,
Bu yerdə kim deyəcəkdir ki, səbri bir yada sal.

Bu gözlərim mənə göstərdi məhşər əyyamın,
Qabaqda Mehdi gəlir, dalda fitnəkar Dəccal.

Həmişə olsun uzaq qoy camalı bəd gözdən,
Gələrsə bəd gözə hə kim, qalarmı onda camal?

Həmişə mən gecə-gündüz yaşardım işrət ilə,
Yanımda badə, gözəl, nəğməkar əlində qaval.

Edib mənim neçə dilbər camalı könlüm əsir,
Vuruldu qəlbim, əgər gördü hansı dostda kamal.

O dosta mən biliyimlə cavab verdim çox,
O yarə busə dedim var, könüldə, gözdə sual.

Əzildi çoxları, onlar cahanı tərk etdi,
Ölənlər öldü, qalan qaldı çox pərişanhal.

O kəs ki getdi, daha yoxdur ondan əsla xəbər,
O kəs ki qaldı, de rövnəq var onda bir misqal?

Fəlakət ötdü, fəqət rövnəq olmamaq daha pis,
Həmişə aləmi titrətmək üzrə bir zəlzal.

Cahanı titrəmə sarmazdı şahə əysə boyun,
O şah ki təkdi nəcabətdə, oydu yaxşıxisal.

Qılıncı, əlləri parlarsa şah Məmlanın,
Gümüşlə eyni olar saxsı, şir ilə çaqqal.

Nəvaziş etsə, kömür onda dürrə dönməzmi,
Əqiq dönüb kömür olmazmı, etsə kin, dərhal?

Nümunə bildi səxavətdə cümlə comərdlər,
Nümunə saydı igidlər döyüşdə biəmsal.

Səxada əlləri parlar həmişə sanki günəş,
Döyüşdə şöləsaçandır qılıncı bərqmisal.

Kərəmdə aləm onun qarşısında bir zərrə,
Səbatda, səbrdə yer qarşısında bir misqal.

Döyüşdə canına düşmənlərin bəla sənsən,
Kərəmdə dosta deyirsən çəkinmə, bəxşişi al.

Gələrsə səcdənə ta cümlə aləmin şahı,
Rəva olar səni bir qiblə sansa bəxt, iqbal.

Töküldü tükləri dünyayə cismi gəlməzdən,
Əzəldə çünki qılıncın göründü, titrədi Zal.

Qəzəblə baxsan əgər hansı gur yıxan şirə,
Ya kinli olsan əgər bir pələngə bir minval,

Yığışdırar özünü, dişlərini şir o dəm,
Pələng də kinlə çəkər dırnağını tez dərhal.

Həmişə yaxşı ağacdan boy atdı yaxşı fidan,
Həmişə yaxşı ağaclar veribdi yaxşı nihal.

Camalda sanki atansan, deyil bu heç də əcəb,
Yetişmiş irs ona həm bir zaman bu hüsn, camal.

Döyüşdə şahların arxası daim ordu olur,
Vuruşda orduya sən arxa ol da, qeydinə qal.

Əlinlə el bəzəndi, xəncərinlə həm kişilik,
Bəzəndi, sanki gəlinlər geyindi zər, xalxal.

Həmişə böylədir işlər cahanda, ey Tanrı,
Sevinc də, qəm də olar, gah olar qəm pamal.

Unut keçən qəmi artıq, bu dərdi yad etmə,
Düşünmə yersiz, o qəmlər ki, ötdü, verdi vəbal.

Keçən günün qəmi dəyməz bu yolda fikrə, qəmə,
Gələn günün qəmi dəyməz, deyək ki, qeydinə qal.

Həmişə nəğmə, qəzəllər sədası altında –
Mey istə, ərləri bir dəm unutma, xatirə sal.

Həmişə ay kimi nur saç, ətir saçan müşk ol,
Həmişə lalə olub gül, bu sərvlər tək ucal.

17

Bustanın zinətini büsbütün apardı xəzan,
Hava sərt oldu, sular da göyərdi gör nə yaman!

Qarət oldu baharın bağlara sərdiyi ipək,
Rəngini, zinətini gülzarın itirdi cahan.

Nə ətir qaldı, nə rəng saçları üstündə yazın,
Nə əriş qoydu, nə arğac ipəyi üstdə zaman.

Yuxulu nərgiz oyandı, yuxuya getdi çiçək,
Gizli nar aşkara çıxdı, güz özü oldu nihan.

Tərsa çadırı kimi oldu səmanın geyimi,
Oldu yəhudi libası çölün örtüyü haman.

Döyüşüblər, elə bil, alma ilə nar giləsi,
Cızılıb üzləri, vardır bədəndə yarə, aman!

Nar vurub almanın alnını qızıl qan eləyib,
Almanın dərdi ilə narın olub sinəsi qan.

Dilbərin gözləri tək nərgiz açıb göz bağda,
Aşiqin hüsnü kimi xeyrü gülü olmuş əyan.

18

Camaat büründü xəz paltarlara –
Ağaclar üstünə əsdikcə xəzan.

Havalar tutuldu, sular duruldu,
Dünya hiddətləndi, qocaldı cavan.

Almayla, heyvayla, narla doldu bağ,
Boş qaldı lalədən, güldən gülüstan.

Kəklik qaqqıltısı dağdan kəsildi,
Qırqovul sədası gəlmir tarladan.

19

Yerin rəngi soldu, hava soyudu,
Qırmızı şərab iç, al sarı heyva.

Yağış meynələrin yudu tozunu,
Qara buludlara büründü səma.

Bağda gül yerini tutdu od-ocaq,
Bülbülün yerini bir qara qarğa.

Yel sərdi budağa qırmızı ipək,
Sapsarı atlasa büründü səhra.

20

Eyləyir dünyaya fərvərdin yeli hər dəm səfər,
Eylədikcə hər səfər dünyayə o çalmış zəfər.

Bənzəyir bütxanəyə rənginliyindən gülistan,
Oxşayır yaquta dağ, firuzə sərvi-Qatfər.

Eyləyir bülbül fəğan, gülşən də hər saət yenə,
Nazlanır güllər baxıb gördükcə hər dəm nalələr.

Tutiyə bənzər şəqaiq dimdiyində qır tutub,
Suri zərdir, üstünü qıpqırmızı tozlar bəzər.

İldırım, şimşək çaxar, daim buludlar oynaşar,
Sanki zənci ordusu tatar görüb xəncər çəkər.

Ətrə qərq olmuş çəmən Tibet kimi başdan-başa,
Bağ boyanmış cürbəcür rənglərə sanki Şüştər.

Bənzəyir bağlarda nərgiz bütlərin əllərinə,
Qol-bilək mina tamam, ovcu hənadır sərbəsər.

Göl külək əsdikcə bənzər köksünə şahinlərin,
Sanki tavusdur qızılgül, bağda açmış balü pər.

Qaldırır tək-tək bənövşə çaylar üstdə başını,
Yamyaşıl atlas yerə sərmiş göy örtük, sal nəzər.

21

Elə bil kanun ayına şəbixun eylədi neysan,
Səmanı tozla doldurdu, çölü, səhranı tutdu qan.

Əgər qan istəyirsənsə, o çöldə laləyə bir bax,
Əgər toz istəyirsənsə, sal buluda bir bax.

Bahar yelləri ənbərlə yoğurdu torpağı indi,
Budaqlar zərxara geydi tamam nisanda leysandan.

Biri səhrada Qarunun qazıb basdırdığın tapdı,
Biri – Azər nəyi yerdə qazıb etmişdirsə pünhan.

Al-əlvan Çin ipəyiylə bürünmüş çöl, elə bil ki, –
Gəlir Çindən bağa hər gün – gecə bir ayrıca karvan.

Gəlinlər tək gülür çöllər sevinclə bağçada, bağda,
Ona ovsun edər bülbül yaman gözlər xətasından.

Əgər gənci-badavərdə tamahın var, çölə çıx bir,
Dolub gənci-badavərdilə çöllərdə tamam hər yan.

Çəmənlərdə gülür lalə üzü tək Leylinin hər dəm,
Bulud göylərdə qan ağlar gözü tək Məcnunun hər an.

Uçur mərcan üzərində fəqət bağlarda bülbüllər,
Qaçır əlvan ipək üstdə fəqət çöllərdəki ceyran.

22

Bürüyüb yer üzünü bir belə dağlar, dərələr,
Buraxıb köhləninin başını çox çapma, dayan.

Sözü ölçüb-biçərək söylə, ucuzlaşmasın o,
Yolu düz seç ki, sənə vurmaya axırda ziyan.

Ərisəm cövrü məşəqqətdə fəğan eyləmərəm,
Ölərəm, istəmərəm çərxi-fələkdən mən aman.

Gözü kordursa cahanın, hünərin xeyri nədir?
Kardı göylər, sən əbəs eyləmə gəl ahü fəğan!

23

Ey mənim can sirdaşım, ruzum, ilim, ayım mənim,
Ey gözüm nuru, günəşüzlüm, sən ey, Ayım mənim.

Nizə boylum, kirpiyi peykan misallım, dilbərim,
Ey qara zülfü kəməndim, qaşları yayım mənim.

Sərv qamətlim, nədəndir ruhuma biganəlik?
Yoxsa səndən naümidlikdir fəqət payım mənim?

Ol qədər hicrində gördüm mən ziyanlar, indi bax,
Xəstədir məhzun ürək, gözlər – axan çayım mənim.

Varsa inciklik belə, ey canımın sultanı, bil,
Xatirindən çıxdımı haqqım mənim, sayım mənim?

Sən mənə can tək yaxınsan, mən sənə candan yaxın,
Tək şirindillikdə, əfsus, olmadın tayım mənim.

24

Ey zamanın tacdarı, sən ki etdin şad məni,
Tanrı xəlq etmiş, demək, nurdan, səadətdən səni.

Hər gecə-gündüz sözün mərdlik, sədaqətdir müdam,
Xoş əməl, insansevərliklə ucaltdın ölkəni.

Qırqovul, ya kəkliyi şahlar şikar etmişsə də,
Daim Ərmən şahları olmuş ovun, şirsən yəni,

Şanlı ordundan əgər, artıb-azalsa min nəfər,
Zərrəcə fərq eyləməz, hətta dəyişməz nöqtəni.

Günlərin keçsin sevinclə, çox mübarək hər ilin,
Dostların kuyindən öpsün, qəbrə girsin qoy dəni.

25

Ey gözəl, sən hər işi saz elədin,
Köhnə ruzgarımı sən təzələdin.

Səni etdikcə ziyarət məxluq,
Səpərək sərvətini, az elədin.

Sözlərinlə sevinib güldü biri,
Birinin qış gününü yaz elədin.

Mərdliyin gözləri səndən nur alır,
Fərəhi quş kimi pərvaz elədin.

Nuxu altında, – dedin – gəl görüşək,
Bax ki, öz vədinə də naz elədin.

26

Ey könül, çox söylədim, aşiqliyə son qoy dəxi,
Əl götür gəl şux gözəllərdən, sular tək az bulan.

Göyərçin bir nazlı yar göz yum, yanından öt, sovuş,
Yağsa eşqin oxları, əqlü həya olsun qalan.

Almadın məndən nəsihət, bilmədin tale nədir,
Tərsə yozdun fikrimi – hər tində sev bir can alan.

Vardır aşiqlik yolunda, yaxşı bil, min bir xətər,
Dinclik istərsən əgər, nazəndələrdən gen dolan,

Çox dedim, sən az eşitdin, düşdün axır zillətə,
Ey ümidi sərnigun, ey arzusu heç-puç olan!

Yoxdur indi səbrə həcət, yox muradın hasili,
Faydasız çırpınma gəl, azadlığın olmuş yalan!

27

Çölləri şaxta, sazaq sardı, yaman əsdi külək,
Zəfəran tək saralıb soldu gülüstanda çiçək.

Görməmişkən nə boyaqçı, nə də küplərdə boyaq,
Meynə yarpaqları oldu özü sapsarı ləçək.

Gecə dağlarda çaxan qorxulu şimşəklər də –
Göyü kərpic kürəsi etdi, görüb əsdi ürək.

Oturub təxtinə dünya şahı sərbəst, başı dinc –
Kini, yad fikri, təmənnanı könüldən silərək.

Çölün atəşlərinə səpdi o, düşmən qanını,
Üzümün qanı ilə doldu qədəhlər – biz içək.

O, fərəhnak yaşasın, hökmü deyilsin əbədi,
Harda düşmənləri var qəmlə alışsın kürətək.

28

Tale üzünə güldü sənin, taxtını qurdu,
Düşmənlərinin ömrünü dövran başa vurdu.

Allah sənə qız verdisə də, qəm yemə əsla,
Ey şah, o, min oğlan gözünə gün kimi nurdu.

Bir şahın əgər düz iki yüz oğlu da olsa,
Onlardan axı bircəsi taxt-taca uğurdu.

Tarix də bilir, səltənətin zinətidir qız,
İskəndər onun şahlığını haqlı buyurdu.

Dünyanı görübsən, yenə gör, gül, yaşa, şad ol,
Şad ol ki, yanında iki şahzadə oturdu.

Öz nurunu saçmaqda ikən göydə Günəş, Ay,
Ömrün boyu kam al və sevindir ana yurdu.

## MƏSNƏVİ

29

Cəmi bu nökərlər içrə, cəmi bu qulamlar içrə,
Cəmi başçı ərlər içrə, ya uca məqamlar içrə –

O igid Əbülyəsdir bu zəmanəyə süpəhdar,
Yağını oda yaxandır, ürəyilə dosta qəmxar.

O, inan bədəndə ruhdur, bədənə hər an gərəkdir,
Cana çün əql gərəkdir, necə əqlə can gərəkdir,

Özü dürr tökən buluddur, hünəri pələngə təndir,
Bir əli pələngboğansa, bir əli qızılsəpəndir.

Gülərək xəzinəsindən o, qızıl bağışlayar gah,
Yox, əgər qəzəblənərsə, kül olar oduyla bədxah.

Döyüşə açanda meydan – ölüm yağdırar bulud tək,
Yox, əgər açarsa məclis, canını verəndi gerçək.

Sevinər görüş zamanı üzünü görəndə ruhlar,
Təzələr hər hansı əqli danışarsa, onda sirr var.

Üzünə baxarsa düşmən ürəyində kin, ədavət,
Əriyər qəzəb, küdurət, yerini tutar məhəbbət.

Nə qədər sevinsə yoxsul yolun üstə zər tapanda,
Elə şad olur bu comərd zəri paylayan zamanda.

Susaraq danışmaz artıq, danışdıqda yoxsa məzmun,
Nə dinər, nə dinlər əsla, danışıq deyilsə mövzun.

Günəşi özünsən, ey mərd, bu cahanda mərdlərin sən,
Böyüyə pənah duran da, kiçiyə dayaq da sənsən.

Sən özün gözəl bilirsən – ürəyim xeyirxahındır,
Fərəhim gülüşlərindir, yasım isə bir ahındır.

Həmişə səninlə oldum, həmişə səninlə dostam,
Şad olub, ya qəmlənəndə bizə örtük oldu bir dam.

Sən ilə qazandım, ey dost, bu böyük şəhərdə şöhrət,
Şaha təqdim eylədin sən, mənə çatdı ondan hörmət.

Elə gün olubmu heç sən içəsən şərabı mənsiz?
Nə evin olubdu mənsiz, nə də quş olubdu çəmənsiz.

Ulu hökmdar yanında mənə yer veribsən, ey dost,
Uca göylərin qatında pirə döndəribsən, ey dost.

Sənin hörmətinlə mən də alıram əcəb hədiyyə,
Səbəbinlə ol əmir də başıma salıbdı sayə.

Yetirir böyük məhəbbət mənə xatirin üçün şah,
Gah edir qızılla təltif, gah açır məqama şahrah...

Nə edim, coşubdu Təbriz həvəsi könüldə indi,
Elə şöləlǝndi ruhum, ürəyim ud oldu, dindi.

Elə ki, səfər havası başıma salıbdı Təbriz,
Od olub, yaxıb sərasər, canımı alıbdı Təbriz.

Eşidəndə o bu sirri məni dinlədi, danışdı,
Elə xoş, şirin danışdı, mənə bu kəlam tanışdı.

Dedi: “Qal yanımda, şair, bizi qoyma təkcə, yalqız,
İşimiz – könüldən hər gün sənə yaxşılıqdı yalnız!

Əmir ilə məndən, ey dost, qalacaq sözün də razı,
Bu cahan malından olmaz ürəyin min il tamarzı.

Burada adın-sanın var, hədəfə yetən kamın var,
Könül oxşayan, fərəhli səhərin, xoş axşamın var.

Orada nəyin qalıbdır, uşağın, ya arvadınmı?
De, edim nə varsa dərman, de, qalan gözəl qadınmı?

Diləyin nədir, əzizim, kimi axtarıb gəzirsən?
Dolanıb bu gen cahanı niyə əl-ayaq əzirsən?..”

Eşidib, xəcalətimdən qızarıb göyə əl açdım,
Eləyib dua onunçün, dilim ilə şirin saçdım:

Səni ilk səfərdə seçdim, yanaşıb önündə durdum,
Uca bəxtinin əliylə belə ali xeymə qurdum.

Sənin hörmətinlə etmiş mənə etina böyüklər,
Duyaraq sözümdə sehri, eləyib sənə böyüklər.

Ürəyim açıldı, mən də görüb onları sevindim,
Sözünə olub xiridar, şur ilə həvəslə dindim.

Bu sənin əməllərindir, yadıma düşəndə bir-bir,
Ciyərim yanır ahımdan, dolanır başımda təsir.

Gözəl oğlunun camalı elə ki durar gözümdə,
O fərəh verən xəyalı dözümü yorar gözümdə –

Ürəyim bulud tək ağlar, soyuq ahü nalə başlar,
Gah axar alovlu yaşlar, gəhi də sevincli yaşlar.

Ürəyimdə varsa hərgah kədərim dumanlı dağ tək,
Onu görmək ilə bir yol, əriyər kədər də yağ tək.

Bədənim canımla birgə canının fədası olsun,
Yaşayaq ürəklə cantək, əbədi ələm qovulsun.

Mənə lütf edib demişdin – nə ki yaxşıdan, yamandan,
Başına gələn nə varsa de ki, mən çıxım dumandan.

Necə sən buyurdun, ey dost, bu gözüm görən nə varsa,
Danışım səbirlə bir-bir, ürəyin çox intizarsa.

Di eşit, Əmir Əcəllin kərəmi könülaçandır,
Əli pay verən, qılıncı dolu tək ölüm saçandır.

O qədər tutub əlimdən, mənə yaxşılıqlar etmiş,
Sənə söyləsəm, deyərsən – bu kişi nə çox şişirtmiş?

Nəzərincə zirvəyəm mən, şüəra önümdə fərşdir,
Məni qaldırar səmaya, bilinər məqamım ərşdir.

Hələ görməyib o şahdan birisi bu cür məhəbbət,
Nə də ayrısında gördüm belə bir dəniz səxavət.

Onun ol müzəffər oğlu uca, ali qəhrəmandır,
O əmir – o şanlı Fərrux mənə ləl bağışlayandır.

Hələ söyləyim vüqarla, nələr eyləmiş də Məmlan:
Mənə bəxşişi az olsa – təzə bir xələtdi hər an.

Məni saxlayır yanında, dözə bilməyir fərağa,
Elə xoş baxır, vücudum sanıram dönüb çırağa.

Ümid eylərəm ki, torpaq ilə bir də bağışlar,
Qədəhim dolar sevinclə, üzümü sevinc naxışlar.

O Əmir Əbülqasım ki, onu ruh bilir zəriflər –
Danışar nə məclis olsa, adımı çəkər, təriflər.

Nəyi var verər, bağışlar, nəyi var əsirgəməz heç,
Alar hətta çoxlarından mənə çox xələt, deyər – seç.

Hələ sən bir az da dinlə, eşit, ol böyük şahənşah –
Ucalıq, şərəf, böyüklük ki, ona veribdir Allah –

O kişi, o şanlı comərd, qocaman, şir ovlayan şəxs
Nələr eyləmiş mənimçün, edə bilmərəm inan bəhs.

Gəhi bir bəzəkli, yorğa tükü ağ qatır veribdi,
Gəhi zərxara və şaldan neçə top yatır veribdi.

Ya da göndərib şərabı evimə o xalvar ilə,
O qədər veribdi bəxşiş, bu evim dolub var ilə.

Ürəyim coşur sevincdən, mənə ruh verir bu ad-san,
Deyirəm – bu şadlığımda mənə tay olarmı Həssan?

O məni canından artıq, bədənindən artıq istər,
Nə ki insan oğlu olsun, vətənindən artıq istər.

Bu bədən, bu can onundur, bu cana var ixtiyarı,
O da mərdliyində Xosrov kimi şənlədər diyarı.

Canımın səfası üçün iki cür səvab edibdi,
Biri – göstərib səxavət, biri də – söz öyrədibdi...

Sənə söylədiklərimdən daha çox səfa verən var,
Bir-iki nümunədir bu, yazıma sığışmaz onlar.

Hamısı nəcib əmirdir – qanı saf, südü təmizdir,
Tənimə canımdan, ey dost, nücəbalarım əzizdir.

Mənə bəxş edərsə Təbriz nə qədər xəzinə, heyhat,
Səni yad edincə, qəmdən, ola bilmərəm, inan, şad.

Deyirəm – susuz, çörəksiz yenə birtəhər dolannam,
Mənə surətin gərəkdir, onu görmədikcə yannam!

Səni gördüyüm zamanlar ürəyim coşub-daşardı,
Buraxıb məlalı könlüm, necə şadrəvan yaşardı.

O, şəhərlərin ziyası, o, qoşunların cəlalı –
Əli Ləşkəriyçün, ey dost, dediyim sözün camalı –

Elə şux və cilvəkardı, elə xoş şəkərsaçandı,
Nə əzab çəkibsə ruhum – dili incə bəhs açandı.

Mənə gər məhəbbətin var, mənə lütf edirsən hərgah,
Bu könül səninsə, ey mərd, ona sən gəl, ol xeyirxah –

Şaha ver bu şeri, bilsin canımı üzübdü həsrət,
Oxu, qoy sinəmdə görsün necə də coşur sədaqət.

O əgər səxavətindən mənə bir xələt də versə,
Aya yüksələr başım, bil, mənə nuş olar bəhərsə.

İstərəm ki, el yanında o şahın cəlalı artsın,
Nə qədər paxıl, rəzil var – özü öz qanında batsın.

Şəhərə gələndə hər yol o Əbülmüəmmər – ustad,
Sevinər şəhərdə hər kəs, özü şad, xəyalı dilşad.

Ona da yetir duamı, de ki, çox salamı vardır,
Ona tay cahanda yoxdur, nə gözəl kəlamı vardır!

Daha bir vəzir də vardır, özü şux, fərasət əhli,
Hamının çırağıdır o, üzü nur, sədaqət əhli.

Ona da salam-duamı yetirib yüz hörmət ilə,
De ki, var xeyir-duası sənə əlli minnət ilə.

Hələ ol Əbül Fərəc ki, verimi bir asimandır,
Fərəfi hüdudsuz olsun, şərə düşməsin, amandır!

Yetir əvvəla salamı, de ki, yollanıb, ətadır,
Hamının varıyla mülkü, canı da ona fədadır.

Daha bir əziyyətim var – deyəsən Əbu Əliyə –
O bizim şərəfli ustad, o əliaçıq vəliyə –

Ki, qulun duaçın olmuş, sənə baş əyir könüldən,
“Görüm olmasın bu dünya ona dar” – deyir könüldən.

Yenə minnətim budur ki, yetir öz dilinlə, Məmlan –
Eşidib xəbərdar olsun ona alqışım var hər an.

Canımı fəda da etsəm, yeri var o şəhriyara,
O fəda edib xəzinə nə qədər bu bəxtiyara!

Bu da son təmənnam olsun – Əlini öp hər gün, hər an,
O sənin gözəl balandır, onu saxlasın bu dövran.

Sən özun bir alicahsan, sənə min-min alqış olsun,
Nə qədər varınsa düşmən, payı dürlü qarğış olsun.

Qələm al, yazınla ey dost, şüəranı dindir hərdən,
Yaraşıqlı xəttin ilə məni gəl sevindir hərdən.

Çata bilməsəm də cismən görüşüm özünlə, vallah!
Ürəyim gülər fərəhdən, açılar sözünlə, vallah!

Mənə yaz, xəttin gözümə işıq saçandır,
O gözəl yazınla qəlbim gül açan, çiçək açandır.

Mənə yaz, o məktubunla ərisin kədərlə fəryad,
Mənə yaz, sözünlə bir dəm olum hər bəladan azad!

O laləüzlü gözəl telləri ipək o nigar,
Edib bu könlümü eşqiylə min bəlayə düçar.

Vüsalı ilə qılır qəddi kimi könlümü rast,
Fəraqı qəddimi zülfü kimi qırıb qatlar.

Tutub əlində bir ox, qəmzəsində var bir ox,
Əlindəki ox ilə qəmzə oxunu bir atar.

Əliylə qəmzəsi əslində bir hədəf aldı,
Nə o yanıldı; nə bu, könlümü edəndə şikar.

Verər o qəmzə oxu dostuna həmişə əzab,
Əlindəki ox ilə düşməni qoyub ağlar.

## QİTƏLƏR

30

Vəfa quşu, Hüma quşu bu dünyadan qanadlandı,
Uçdu birlik aləmindən, bəs haranı yuva sandı?

Ürəyimin al qanından üfüq elə dalğalandı,
O dalğadan qərbin belə ətəkləri al boyandı.

Yelkənimi dənizlərdə açdı kədər fırtınası,
Qəm boynuna aldı canı... Can viran bir gülüstandı.

31

Mənə o vəfasız dedi bivəfa,
Onun vardır hər bir sözündə cəfa.

Vəfasız görərmi məni dost olan –
Ki, düşmən də məndən görübdür vəfa...

Məgər bir kəsin incidər canını,
O kəs ki, ona könlün etmiş əta?

Mən ondan yamanlıq da görsəm əgər,
Ona yaxşılıqdır əlimdən cəza.

O, könlündəki fikri almış dilə,
Budur fikri – düzgün xəta olsa da!

Həmişə nədən, qarşı çıxmış mənə,
O kəslər ki, dost olmuşam onlara?

Sözüylə işi bir-birin tutmayan,
Salar yaxşı işdən qəzanı yada!

32

Gözəllər firqətindən pis bu aləmdə əzab olmaz,
Mənim tək yar fəraqını görəndə xürdü xab olmaz!

Günahkarlıq nədir, xatırlamazdı kimsə aləmdə,
Desəydin, axirətdə hicrdən bədtər əzab olmaz.

Fəraqı dərdinə mən düşmədən o mahrüxsarın,
Sanardım bunca dərdi çəkməyə qəlbimdə tab olmaz.

Əyildi qamətim, zülfü kimi, yarın fəraqında,
Könüldə həsrəti, boynumda zülfü tək tənab olmaz.

Alıb da səbrimi, aramımı, məndən uzaqlaşdın,
Edirsən bağrımı hicran odunda sən kabab, olmaz!

Üzün rəngində göz yaşım, saçın rəngindədir bəxtim,
Belə qarğa qanadı, öylə hər yerdə şərab olmaz!

33

Apardı könlümü, verdi mənə könlünü bir dilbər,
Mən ondan razıyam, şaddır o da, çox razılıq eylər.

O, mənsiz mey ələ almaz, o məndən ayrı əylənməz,
Həmişə kaş belə olsun, belə keçsin bütün günlər.

Necə yandım fəraqında, salanda yadıma hərdən,
Keçirdi ah ilə, fəryad ilə ömrüm uzun illər.

Mənəm asudə yarımdan, niyə asudə olmaz o?
Məgər bilməz, dönüb dövran, çıxıb yaddaşdan ol qəmlər?

Sən, ey şümşad şaxında açan azadə bir susən!
Sən, ey diba, sədəf içrə olan şahanə bir gövhər!

Səni hər kəs ki doğmuşdur, o doğmuş eşqi qəlbimdə,
Sənə kim qəsd qılmışdır, o vurmuş qəlbimə neştər.

Budur qorxum ki, könüldən mənim eşqim uzaqlaşsın,
Mənim könlüm də, canım da sənindir, ey mələkmənzər!

34

Hər nə istərdi könül, bəxtim mənə etmiş əta,
İndi vaxt çatmış ki, könlüm bu cahanda kam ala.

Keçdi bədbəxtlik dəmi, yar ilə könlüm oldu şad,
Mən şadam, bu vəsldən xoşhal olar o məhliqa!

Şadlığım sonsuzdu – bu, yarın vəfasından gəlir,
Rəsmdir, hər yerdə gözlər xəlq yarından vəfa.

Yer üzündə bir daha şümşad, lalə bitməsə,
O boyu şümşad, üzü lalə bəsimdir dünyada.

Məclisim yarın camalıyla mənim gülzar olub,
Salmaram gülzarı mən ömrüm boyu bir də yada.

Gül üzündən ayrılıq yarın, poladdan bərk idi,
Ah odumda o polad da kül olub getdi bada.

Canıma yetsə belə yüz cövr, yarsız olmasın,
Gəlməsin mənsiz yaralı bir könül də fəryada.

Ayrılıq bəndindən indi mən ki, azad olmuşam,
Bir kəsə yetməz əlimdən bu cahan içrə cəfa.

Qəm yedim, ancaq işim əncam tapdı xeyr ilə,
Kaş həmişə hər çətin iş xeyr ilə əncam tapa!

35

Mənəm ki, həsrət odunda yaxar o nazlı nigar,
Gözüm bahar buludu tək qalıb müdam ağlar.

Ümid bağında ümid ilə bir ağac əkdim,
Dedim ki, naz ola yarpağı, sevinc də ona bar.

Su eşq idi, günəş isə vəfa, nəsim – könül,
Məhəbbət – Ay işığıydı, özüm ona dildar.

Qəzəblə yıxdı kökündən onu fəraq küləyi,
Gözüm yaşını görəndə dəniz çəkildi kənar.

Onun müşk saçan nərgizini yad etsəm,
Qoşa bu nərgizimin lalə rəngli dürrü axar.

Əsən o sünbülünü xatirimə salsam əgər,
Nə can qalar bədənimdə, nə də könüldə qərar.

Qoşa ləbindən onun hər nə qədər mey içsəm,
Mənim qazandığım olmuş həmişə dərdi-xumar.

Onun gül ətri saçan laləsinə üz qoydum,
Fəraq ayırdı o güldən batırdı bağrıma xar.

Mənim qisasımı həqq ol gözəldən almazsa,
Mənə əta eləsin sevgisində səbrü qərar!

## QƏZƏL

36

Hardasan, ey könlümə dinclik verən can, hardasan?
Çox çağırdım, gəlmədin, ey dərdə dərman, hardasan?

Firqətə dözmək çətin, vəslinlə kəsdim ülfəti,
Şadlığı, şeriyyəti məhv etdi hicran, hardasan?

Hər zaman könlüm sorar: nəyçün susub əyləşmisən?
Bir qəmər hicrində könlüm qaldı nalan, hardasan?

Daşla sınsaydı qolu vəslin, tapardım mumiya,
Hicr ilən sınmış qolum, qıl çarə, Loğman, hardasan?

Bir çırağ imiş vüsal, düşdü qəfil tufanlara
Nurumu zülmətmi uddu, ey çirağban, hardasan?

Hicrinin, ya vəslinin xeyri nədir, mənası nə?
Bir qılınc çəkmiş zaman, vəsli tutur qan, hardasan?

Firqətin bir Tanrı hökmü... Sən özün tanrım mənim!
Tanrı hökmündən nə cür mən qurtarım can, hardasan?

## QƏSİDƏ

37

MƏŞUQƏDƏN ŞİKAYƏT

Ey cahanım, sən kimi can istərəm,
Sənsiz olsam, məhvi candan istərəm.

Ey cahanın canı, mənlə olmasan –
Qəlbə şadlıq bəs hayandan istərəm?

Ey pəriçöhrə, mələk xislətli yar,
Sən yad olsan, kimdən ünvan istərəm?

Xoşliqa idin, nədən döndün belə?
Mehriban ol, yarı xəndan istərəm.

Eşqimizdə, sevgilim, mən sabitəm,
Sən dönübsən, şərh et, əyan istərəm.

Bir zamanlar rüşvət aldın qəlbimi,
İndi dersən "canı məccan istərəm".

Bir günahım varmıdır, gəzdin kənar?
Yox günahım, ədlü aman istərəm.

Kinli düşmənlər sənə tən etdilər –
Ki, tələb et – ol dili qan istərəm!

Şanlı dastançı demiş "yox sadiq eşq",
Mənsə, dilbər, doğru peyman istərəm.

Yox əgər bel bağlasan eşqə, de ki:
Məhv ola sözbaz, bədiman istərəm!

Laləüzlüm, soldurubsan rəngimi,
Mən kimi solsun qoy hicran – istərəm.

Pisliyindən gəlməyirsən səmtimə,
Yaxşılıqla bax ki, bir an istərəm.

Uyma şərrə, şeytana, dostun azar,
Qalmasın yolda bir insan – istərəm.

Boşla bədxahı, sözü məndən eşit,
Bəndəyə şadlıq, sənə şan istərəm.

Ol rəqibim söz düzəldən ustasa,
Qəlbi yoxdur, qəlbə meydan istərəm.

Könlümün, ey təşnəsindən bixəbər,
Qan saçan didəmlə üsyan istərəm.

Alsa idim vüslətindən mənfəət,
Feyzin üçün vəsli əlan istərəm.

Bir gülüstandır üzün, çeşmim bulud,
Yağmaq üçün mən gülüstan istərəm.

Daim ağlar gözlərim bir sal yada
Bağçanı yamyaşıl, əlvan istərəm.

Ey üzü bağban tumarı görməmiş,
Çöhrəni, bil, mən də pünhan istərəm.

Surətində gülləri gördüm, aman,
Bülbül oldum, nalə, əfqan istərəm!

Vəslin haqda bəhs edərdim şeir ilə,
Ayrılıqdan indi tufan istərəm.

Söyləyərkən tərifinçin bir qəzəl,
Göz yaşımla bəhsə neysan istərəm.

Mən kiməm ki, eşqi pünhan saxlayam?
Xəstəyəm, aşkarə dərman istərəm!

## RÜBAİLƏR

38

Ey türk, səndə yoxdur insaf, ədalət,
Ədlə yox, zülmə var səndə məhəbbət.
Zülmün ziyanındır qurtarmaq olmaz,
Adil ol, zülmündən əl çək, nəhayət.

39

Ey mərcan dodaqlım, səmən əndamlım,
Sevincim, şadlığım, istəyim, kamım,
Qəlbimə, canıma olsam da bəla,
Yoxdur səndən ayrı səbrim, aramım.

40

Yanımda olsan da, həsrətəm sənə,
Qəlbimdən, canımdan əzizsən mənə.
Qəmzən ürəyimə neştər vursa da,
Qohumdan, qardaşdan doğmasan yenə.

41

Ey innab dodaqlı, gör nələr etdin?
Yubandın gələndə, tezcə də getdin.
Gəldin xəyal kimi, getdin su kimi,
Doyunca görməmiş gözümdən itdin.

42

Eşqinə olmasa könlümdə iman,
Atıb bu şəhəri gedərdim, inan.
Səninlə əksəydim bəla toxumu,
Barını yığardım üzə vurmadan.

43

Ey türk, hardan düşdün Gəncəyə, söylə!
Canımda bir sevinc oyatdın böylə.
Sərxoş olan dəmdə bir busə verdin,
Arzum budur: daim sərxoşluq eylə!

44

Nə qədər sirrimi içə salım mən?
Nə qədər şadlığa həsrət qalım mən?!
Yarın cəfasına nə qədər dözüm?!
Nə qədər pis görüb yaxşı bilim mən?!

45

Öpdüm ayağını yüz dəfə təkrar,
Dedim: – Camalını göstər, ey nigar.
Başqa yerdə idi fikri, baxmadı,
Dilbərin bir qəlbi, yüz xəyalı var.

46

Xəlq edəndən bəri məni yaradan,
Biliyim, iradəm artır anbaan.
Məni yıxa bilsə yaman deyənlər,
Onda yel də dağı uçurar asan.

47

Nə qədər dinləyək acı sözləri,
Nə qədər incitsin əzab bizləri?
Vəfa əvəzində nədir bu cəfa,
Nədir yaxşılığa pislik, ey pəri?

48

Qoşun sındıransan döyüşsən əgər,
Xoş üzün baldırsa, qəzəbin zəhər.
Gündə bir orduya zəfər çalırsan,
İstəsən, dünyaya çalarsan zəfər,

49

İqbalın, muradın, kamranlığın var,
Uca taxtın, tacın, insanlığın var.
Nüsrətdə, cəlalda göylər kimisən,
Bəxtin, ürək kamın, cavanlığın var.

50

Səni mədh etməyə ta geydim paltar,
Dedim – gəl döyüşək, ey çərxi-qəddar.
Xoş bir söz eşitsə səndən bu gələn,
Aslanlar döşündən gedib süd sağar.

51

Əsirin olmasa viranə könlüm,
Batmazdı bu qədər al qanə könlüm.
O könlün könlümə yaxınlaşmasa,
Çatarmı könlünə divanə könlüm?

52

Ey yar, hüsnün məndən uzağa düşdü,
Sevinc ürəyimdən irağa düşdü.
Sən zülmə qurşandın, ayrılıq saldın,
Axdı ürək qanım, yanağa düşdü.

53

Girdi sərv boylum içəri birdən,
Qurtardı qəlbimi qəmdən, kədərdən.
Bir cüt heyvasını, bir cüt narını
Bəxş etdi... ətrindən bihuş oldum mən.

54

Ey qapısı elmə, ürfana ocaq,
Məni qovdu ordan qapıçın nahaq.
Salam vermək idi mənim niyyətim,
İtirdim boş yerə vaxtımı ancaq.

55

Məni qəlbiqara yaman incitdi,
Başdan qara çətri ta kənar etdi.
Tövbəni sındırıb günah etməyə,
Qəsdən sufilərin yanına getdi.

56

Əlim ətəyindən üzülən andan,
Yapışdım dördəlli ahdan, fəğandan,
Ya ahım qəlbinə əsər eyləyər,
Ya ömrüm xərməni yanar hicrandan.

57

Bir kölə olsam da, şah oldum birdən,
Piyada mat qoyur şahları hərdən.
Biryolluq gəlinim olsaydın əgər,
Qəmdən qurtarardım, şad olardım mən.

58

Kəsdi səbrimizi bir büt, ey ürək!
Pərişan eylədi bizi zülfü tək.
Səs səsə ah çəksən, dağlar əriyər,
Daşlar bizə ağlar inildəyərək.

59

Qərqəm gözdən axan al qanə sənsiz,
Yandım od içində hicranə sənsiz.
Sənsiz xəyalın da düşmür yadıma,
Gəl gör nə haldayam divanə sənsiz.

60

Biçarə olmuşam, sərgərdan sənsiz.
Pəjmürdə, nisgilli, pərişan sənsiz.
Sənsiz işim-gücüm ah, fəğan olmuş,
Nəsibim, bax, budur hər zaman sənsiz.

61

Sən ey mələklərin bəlası dildar,
Üzün mey kimidir, gözlərin xumar.
Aşiqə kirpiyin kinlidir müdam,
Turan da görməyib sən kimi xunxar.

62

Nə vaxt saf ürəklə anaram səni,
Sannam candan artıq o gül bədəni.
Mən candan keçərəm, səndən keçmərəm,
Sən yadlar sözüylə atmasan məni.

63

Mən xəstə düşmüşəm, ey dodağı nar,
Heyva bədəninə canım intizar.
Bəxş etsən heyvanı, narını mənə,
Sənə canım kimi bir hədiyyəm var.

64

Məni tora saldı bir gümüş əndam,
Aldım söhbətindən bir dünyalıq kam,
Aparsa başacan bu eşqi dildar,
Hər bir məqamından sevinc taparam.

65

Nəfəsin bahardır, ətrin də nəsrin,
Nə qədər ki, sağam, əmin ol, əmin:
Hüsnünə bənzəyən meydən dönmərəm,
Məsləkim – eşqindir, dinim də – sevgin.

66

Hicran yada düşər, ahdan yatmaram.
Yanımda sən olsan, qəmə batmaram,
Bu gün ayrılsaq da, sabah mənimsən,
Can verib almışam; səni atmaram.

67

Ey dost, gəl indi də özgə yol tutaq,
Bu zülmü, əzabı bir yolluq ataq.
Bərk-bərk qucaqlaşaq nəfəs-nəfəsə,
Ataq incikliyi, bir ülfət qataq.

68

Nakəslər əlindən çox qəmlər yedim,
Şəhəri onlara dedim tərk edim,
Ancaq eşqin, vəfan yadıma düşdü,
Alçaqlar zülmünə qoy dözüm dedim.

69

Varlığım sənindir, inan, ey sənəm,
Xəstəyəm, dərmanım ən yaxın həmdəm.
Sənsiz mən bir heçəm... sən gəlsən əgər,
Yaxın düşə bilməz nə kədər, nə qəm.

70

Mən sənsiz nəyəm ki? Qəmlərə ortaq,
Səninlə hər dərddən, hər qəmdən uzaq.
Səninlə üz-gözüm qızılgül olur,
Sənsiz üz saralır yasəmənsayaq.

71

Bir hindli balası qəlbimi aldı,
Bəla quyusuna apardı saldı.
Əgər çıxarmasa ordan öpüşlə
Mənə bircə dəfə “ah” demək qaldı.

72

Biryolluq eşqindən əl üzdü ürək,
Vəfalı bir yara bağlanmaq gərək.
Sinəmə dözümdən bir daş bağladım,
Benddən xilas oldum təngə gələrək.

73

Nə qədər hicrandan eyləyim fəryad?
Nə qədər ahımla dəlinsin polad?
Sən zülm edəcəksən, mən ah çəkəcəm,
Nə vaxtacan olum xəyalınla şad?!

74

O şümşad boyundan çox qıldım fəryad,
Nə qəm, lalə üzün göstərdi imdad
Heç bilsən könlümə neylədi onlar:
Biri bərbad etdi, o biri abad.

75

Bəhanə olmadan getdin yanımdan,
Özümü səninlə sannam hər zaman.
Vəfan gözlərimi elə tutub ki,
İnan xəyalımdan çıxmırsan bir an.

76

Düşmən tənəsindən, ey bivəfa yar,
Boş sözdən savayı nə hasil olar?
Günəşi palçıqla mümkünsə örtmək,
Tənəylə qəlbim də səndən ayrılar.

77

Haqq nurundan olan bir canan gördüm,
Gözəllər mehrabı bir cavan gördüm,
Üzündə nə qədər oxu, nizəsi...
Hüsnü qəlb döyür, gözü can gördüm.

78

Mir Əcəl cahanı tutdu qələmlə,
Mir Əcəl bəzədi göyü ələmlə,
Mir Əcəl o qədər bəxşiş verdi ki,
Bəxşişi dünyanı örtdü dirəmlə.

79

Mir Əcəl yəhərdə bir aya bənzər,
Mir Əcəl döyüşdə qızmış şiri-nər,
Çini üzük qaşı altına alar,
Bir məktub göndərsə şahına əgər.

80

Qismətim olmamış onun vüsalı,
Uzaqdan güldürür məni camalı.
Həmişə xoş olur, doğrudur, vüsal,
Bəlkə daha xoşdur vəslin xəyalı.

81

Üçünə bir üç də artırmış camal:
Üzə – xətt, zülfə – gül, al yanağa – xal.
Üç şeyə bənzəyir mənim də üçüm,
Ürək – od, gözüm – su, bəbək – xal misal.

82

Məni hərçənd ki incitdi dövran,
Qurtardı, Arana etdi hökmran.
Fəqət mən qulunam, ey başım tacı,
Ey mənim üstümdə ən ulu sultan!

83

Tanrı sənə verdi cahanda dövlət,
Verdi, iqbal ölkə, bir də səadət.
Dünyaya qocalıq, sənə cavanlıq,
Bir də şad yaşamaq hüququ əlbət.

84

Dünyaya gətirdi hərə bir qanun:
Gözəl Mehriqanı böyük Fəridun.
Novruz bayramının gətirdi Cəmşid,
Vəfanı, səxanı, mərdliyi Fəzlun.

85

Bəxtim bəd gətirdi, hirsləndi şəhər,
Düşmən çox, qəmxarım yoxdur bir nəfər.
Hanı mənim kimi bədbəxt bir adam,
Yardan ayrı salsın dövran – bədnəzər?

86

Çox şeylər eşitdim, gördüm bir zaman:
Bəzən peşman oldun, bəzən pərişan.
Axır ki, sən güldün, düşmən ağladı,
Arxan fələk imiş, köməkçin cahan.

87

Kimin onun kimi bir dilbəri var,
Həmişə ürəyi fərəhlə dolar.
Hərdən görüşürük xəlvəti, gizli,
O gün qışımızda bahardır, bahar!

88

Hicrandan baş aça bilməyən gözüm –
Qəlbimə dedi ki, sənə var sözüm:
Bu qədər ağlamaq nəyinə gərək?
O getdi, qayıtmaz. Deməк, əl üzüm?

89

Məni ölmüş görsən, oxşa məni sən,
Qarşında dayansa bu cansız bədən,
Dayan başım üstə, naz ilə söylə:
– Dur, ey öldürdüyüm, peşimanam mən.

90

Bədən yarı oxdur, yarı kamandır,
Ürək yarı qoca, yarı cavandır.
Çoxlu əzab çəkdim süd arxı üçün,
Ordan süd yerinə ancaq çıxdı qır.

91

Zülmdə, pislikdə ey mahir olan,
Zülmdən ürəyin doymur heç zaman.
Bir ürək əhlindən eşitmişəm mən,
Yamanlıq eyləyən görəcək yaman.

92

Ey zülfü üzümdən daha da çin-çin
Üzü göz yaşımdan daha da rəngin,
Günbəgün sevimli, şirin olursan
Sən gözəl olursan, mən isə bidin.

93

Ürək yox, camalda xoşdur gözəllər,
Qəlbin də, hüsnün də pakdır, a dilbər.
Sən mənə müşksən, özgələr torpaq,
Tibet müşkü olan torpağı neylər?

94

Necə asimanda gün tutar qərar,
Fil üstə oturmuş o cür hökmdar.
Ötmüş mələkləri fərri, taleyi,
Tacında "sənindir zəfər" sözü var.

95

Zülmdə, pislikdə, ey məşhur gözəl,
Gəl hicri vüsala eyləyək bədəl.
Rəqibə həmişə mükafat verib,
Sən məni, özünü rüsvay etmə gəl.

96

Bütpərəst yanında mey olmayanda,
Meyi qana dönər bədəndə, canda.
Kim xəbər versə ki, yenə gəlirsən,
Dürlə ətəyini doldurram onda.

97

Onun söyüşü də verir bal tamı,
Gözəldir, zərifdir yeddi əndamı.
Adını Həft xan döyüşü qoydu,
Mənə göstərəndə bir cüt badamı.

98

Susuram, bəlkə də çox naz etməsin,
O günah etmişdir, qoy üzr istəsin.
Həsrətlə yanıram, qovruluram mən,
Bəlkə o günahkar "bağışla" desin.

99

Ürək yarı kəklik, yarısı şahin,
Bədən yarı nazlı, yarısı qəmgin.
Mən ondan həmişə qayğı umurdum,
O mənə qəm verdi, eylədi bədbin.

100

Tanrı məhşər günü soruşsa səndən;
– Aşiqə naz etdin bu qədər nədən?
Üzrün nə olacaq, bir söz hazırla,
Onda da davaçı mən olacam, mən.

101

Yar nazla canıma qızdırma saldı,
Utanıb barmağın ağzına aldı.
Südəmər uşaq tək düşdü tamahım,
Gecə barmağımı sormağım qaldı.

102

Hüsnünlə payızım olur ilk bahar,
Şəkər ovlağımdır o tər dodaqlar.
Tanrı arxam olub, tale yarımdır,
Meylə yardan özgə, de, nə işim var?!

103

Məni alçaqlara qul etdi cahan,
Onlardan əziyyət gördüm hər zaman.
Bir anlıq vəslini cənnət sanıram,
Yoxsa bu şəhərdə qalmazdım bir an.

104

Dünən yarsız könlüm yuxuya getdi,
Balıncım üstündə bir ağac bitdi.
Kökü qəm, meyvəsi həsrət, dərd, bəla,
Bu üçü könlümü yaman incitdi.

105

Səni yaradanda, ey şah, yaradan –
Əbədi eylədi böyük hökmran.
Səni yaxşılıqla anır o sultan,
İxlasla adına göndərir fərman.

106

Ey gümüşbuxaqlı, ey laləyanaq,
Saraltdın üzümü saf qızılsayaq.
Sən ki, mehrü vəfa etməyəcəkdin,
Məni niyə çəkdin şəhərə nahaq?

107

Ürək yarı donub, yarı yanmada,
Yarısı oddadır, yarısı suda.
Xaraba qoymusan yazıq könlümü,
Vergi də gəzirsən bu xarabada.

108

Gözlərim mey rəngli ləblərə heyran,
Səbrim bir damladır, eşqim bir ümman.
Deyirlər sirrini faş eyləyirsən,
Neynim, ovcumdadır qəlbim hər zaman.

109

Baxdın, xəcil oldu ay baxmağından,
Qənd, şəkər utandı bal dodağından.
Bəbəyim üstünə qədəm basıb gəl,
Gəl ki, ləzzət alım gül qucağından.

110

Zülmət gecələrdə üzün gündüzüm,
Eşqin xəzan vaxtı yazım, novruzum.
Qamətin könlümə işıq, təsəlli,
Dünya xoş bəxtimdir, həm gülən arzum.

111

Mən nə qədər dözüm yar möhnətinə,
Vüsalı sevincdir, həyatdır mənə.
Dərim soyulsa da yarın yolunda,
Yardan ayrı düşmək yamandır yenə.

112

Mən səni görəli, ey üzü göyçək,
Hüsnünün əsiri olmuşdur ürək.
Əgər sənin mənə meylin yoxdursa,
Ya qəlbimi qaytar, ya nazdan əl çək.

113

Sən ki, bilməyirsən sədaqət, ilqar,
Vədində, əhdində yoxdur etibar.
Səbrim tükənibdir, deyim, sən də bil:
Peşən utanmazlıq, özün zülmkar!

114

Mən canımdan artıq bilirdim səni,
Demə dost saymışam aşkar düşməni.
Düşündüyüm kimi deyilmişsən ki!
Unutdum eşqinlə olub keçəni.

115

Dünyaya gələli bəxtim olub yar,
Yatmayıb bircə gün bu bəxti-bidar.
Mənə yaman deyən nə tənə edər,
Almazı ipəklə heç deşmək olar?!

116

Qamətin ucadır behişt sərvi tək,
Xalın hurilərin xalından göyçək.
Aşiq saçlarını ənbərlə hördü,
Üzə nöqtə qoydu: "xaldır" – deyərək.

117

Hicrinlə yaş tökür bu bulud gözlər,
Qəmin ürəyimə hey atəş səpər.
Həddi-hüdudu yox iztirabımın,
Bu hicran deyildir, məhşərdir, məhşər!

118

Dünyanın yarısı şaha qəsr, bağ,
Qalan yarısı da olmuş ordugah.
Çadırlar içində döyüşçüləri –
Şirlər, pələnglərdir, neçə ayqabaq.

119

Qəminlə gözümdən töküldü qanlar,
Sirrimi gül etdi üzümdə onlar.
Sirri canımdan da gizlərdi ürək,
Göz yaşım eylədi büsbütün aşkar.

120

Ey qafil, de, nədir bu qədər zəhmət?
Qəm yemə əlindən çıxıbsa sərvət.
Kim ki, maldan ötrü qüssə, qəm çəkir,
Bilsin: qüssə qalır, gedir mal-dövlət.

121

Yüz yol öyüd verdim qəlbimə hədər,
Tərslikdən nə qədər gördüm qəm, kədər,
Ona yazıq gözüm nəzər salınca,
Bircə yol baxmaqla gördü gör nələr!

122

Səninlə dost olan daim peşiman,
Səndə yaxşılıqdan yoxdur bir nişan.
Səndən məzəmmətdir gələn, get daha,
Gözləmək olarmı xəstədən dərman?

123

Zülm ilə az oyna, gəl, ey zülmkar,
Zülmünlə aləmi etmə tarü-mar,
Sən də dərdlimizdən dərdə düşərsən,
İnan, zülm edənə bir gün zülm olar.

124

Ürəkdən od qalxar, gözdən yaş axar,
Qiyamət qoparar canımda ruzgar.
Yar məndən qaçırsa, təəccüb etmə,
Axı oddan, sudan qaçar adamlar.

125

Badamın qəmzəylə ordu yandıran,
Qəndi gözdən salar yaqutun hər an.
Hər kimi sındırsan, səni çox istər,
"Gövhər alan olar gövhər sındıran".

126

Səadət gülündə qalmadı bir xar,
Tək sənin bəxtindir cahanda bidar.
Tək sənin yanında var elmə hörmət,
Ölkə saxlamaqdır işin biqərar.

# EYN-ƏL-QUZAT MİYANƏCİ

*Eyn-əl-Quzat Miyanəci h. 492-ci (1099) ildə Həmədanda doğulmuş, 525-ci (1131) ildə kafir elan edilərək edam olunmuşdur.*

*Dövrünün böyük filosofu, sufi alimi, görkəmli ədib və şairi, Şərqdə geniş şöhrət tapan "Zübdətül-həqayiq", "Təmhidat", "Nameha" və Şəkva əl-qərib" adlı əsərlərin müəllifidir. İbn Ərəbidən çox qabaq panteizmin nəzəri əsaslarını işləyib hazırlamışdır. Farsca yazdığı "Təmhidat" ("Müqəddimələr") və "Naməha" ("Məktublar") Azərbaycan sufi ədəbiyyatının ən parlaq nümunələridir. Bu əsərlər hələ orta əsrlərdə Azərbaycan dilinə tərcümə olunmuşdur. "Ərəb dilinə və ədəbiyyat elmlərinin təmrininə giriş" adlı kitab yazdığı barədə də məlumat vardır. Bədii yaradıcılığı janr baxımından zəngindir.*

## RÜBAİLƏR

1

Bir şəhid olmaqdır arzum, ey xuda,
Ucuz üç şey də ver mənə dünyada.
Ey dost, mən deyəni söyləsən əgər,
Həsir ver, neft gətir, od vur sonra da.

2

Eşqində gərək hasil ola, o, yoxdur.
Ümiddə gərək sahil ola, o, yoxdur.
Səbr eylə deyirsən ki, işin yaxşı olar,
Qəlb ola, ona qabil ola, o yoxdur.

3

Axşam qucaqladı yenə yar məni,
Qəhr ilə qul etdi o dildar məni.
Eşqindən coşaram, – dedim, – ey sənəm,
Öpərək susdurdu o nigar məni.

4

Gahdan ürəyi zülfünə qurban edərəm,
Nərgizlərinə töhfə gəhi can edərəm.
Səndən gen olub aciz olan dəmlərdə,
Səndən sənə, ey dost, əlaman edərəm.

## MƏSNƏVİ

5

Ey Həmədan, axdıqca qoynuna bir ölkədən –
Güclü yağış selləri səni dirçəltdi həmən,

Ey Mavşan, sən içirsən ancaq vadi damcısı,
Təmizlənir nə əcəb torpağının acısı?

Görcək sizi, ürəkdə vətən eşqi çağlayar,
Düz sözdür: sadiq oğul qürbətdə hey ağlayar.

Olsaydı bu zavallı könlüm tamam dəmirdən,
Onu qürbət mum kimi əridəcəkdi birdən.

Dərd-qəmi məndən alıb, fikir çəksə qarğalar,
İnan qəmdən, qüssədən nara rəngi ağarar.

O qəmlər ki, mənim var, dağları da parçalar,
Amma bir bax, səbrimə dost-düşmən də əl çalar.

## ŞİHABƏDDİN SÜHRƏVƏRDİ

*Şihabəddin Əbülfütuh Yəhya ibn Sürəvərdi h. 549-cu* (*1154*) *ildə Azərbaycanın Sürəvərd adlı kiçik bir şəhərində anadan olmuş və 587-ci* (*1191*) *ildə dinsizlikdə ittiham olunaraq Hələbdə edam edilmişdir.*

*Görkəmli filosof və şair kimi tanınan Ş.Sührəvərdi ilk təhsilini Marağada almış, fəlsəfə və fiqh elmlərini öyrənmiş, sonralar bir sıra Yaxın Şərq ölkələrinə səyahət etmişdir.*

*Şərqdə işraqilik fəlsəfi sistemini yaratmış və onun əsaslarını şərh edən "hikmət əl-işraq" əsərini yazmışdır. İbn Sinanın "Əl-İşarat" əsərini şərh edən "Şərh əl İşarət bi-l-farsiyyə" kitabının müəllifidir. Şagirdlərindən Şəmsəddin Şəhrəzuri onun 45 əsərinin adını çəkir.*

*Bədii yaradıcılığın nəzəri məsələlərinə dair əsərlər də yazmışdır. Yaradıcılığında alleqoriya və hekayə janrları əsas yer tutur. "Bustan əl-qülub"* (*"Könüllər bağı"*)*, "Nəğəmat əl-səmaviyyə"* (*"Göy nəğmələri"*)*, "Risalət ət-teyr"* (*"Quşlar haqqında risalə"*)*, "Munis əl-üşşaq"* (*"Aşiqlərin dostu"*)*, "Ruzi ba-cəmaəti-sufiyan"* (*"Bir gün sufilər arasında"*) *və b. əsərləri məşhurdur.*

1

Məni ölmüş bilib qəmə qərq olan,
Ağlayan dostlara çatdıran xəbər:

Elə bilməsinlər ölmüşəm artıq,
Hədərdir qüssələr, hədərdir qəmlər.

Bir quşdum qəfəsdə, dünya-qəfəsim,
Uçaraq boş qoydum onu sərbəsər.

Allahı görürəm burda gözümlə,
Bunu xəlqə gizli verirəm xəbər.

Ruhları çıxarın bədənlərindən,
Onda haqdan sizə görünər əsər.

Dəhşətə gəlməyin can verən zaman,
Bu, yerdəyişmədir, köçə bərabər.

Bizim ruhumuzun mayası birdir,
Bir şeydən yoğrulub bədənlə yeksər.

Mən sizi görürəm özümdə hər vaxt,
Mənim özümsünüz hamı sərasər.

Hamımız üçündür xeyir olanlar,
Hamıya ziyandır üz verərsə şər.

Mənə bu rəhminiz özünüzündür,
Gedərsəm, hamıya bu növbə gələr.

Fəna buynuzunda durur bu dünya,
Kim qalsa qayğıma, özü güclənər.

Həmd olsun, şükr olsun qadir Allaha,
Budur vəsiyyətim sizə, ey bəşər!

2

Çox millət yox oldu ulu dünyada,
Hardadır saraylar, məscidlər harda?
Ömür gedir əldən, işrətə can at,
Nemətə göz yumma, fanidir həyat.
Xoş günlərin ipi əlinə keçcək,
Nemətə laqeydlik hökmündən əl çək.

3

Aşiq öz sirrini açarsa bir dəm,
Qıyacaq canına bir vicdanı kəm.
Gizlətsə ürəkdə, yaşlı gözləri –
Eşqi əyan edər, artar kədəri.

4

Dadını-duzunu itirdi dünya,
Yalandır, sünidir yenilik burda.
Xaindir insanlar, xaindir yeksər,
Çoxu etibarsız, çoxu hiyləgər.

Düz yola hiyləyə sədd çəkib onlar,
Üstündə tikan da əkib məlunlar.
İmanı, dini də tamam atıblar.
Əsilli-nəsilli itib batıblar.

5

Çöllərdə gəzir o ahu, ceyran,
Yormuş yazığı quru biyaban.

Bilmir ki, hara gedib dolansın,
Dincəlmək üçün bir an dayansın.

Çöllərdən uçur yanar küləklər,
Tozlarla dolub qara bəbəklər.

Can pörşələnir susuzluğundan,
Keçməz belə hal su ilə ondan.

Qəlbindəki hissi atsa birdən,
Rəhm eyləyəni olar, inan sən.

Lakin ciyəri yanar alovda,
Qalmaz külü də alovda, odda.

Fəryad elədim yola salarkən,
Ahudan o gün mən ayrılarkən.

Kaş yanmaya ayrılıq çırağı,
Ta gəlməyə bir qəmin sorağı!

6

Ey Səd, dayan qonağım ol sən,
Bax gör ki, solub bu yer, bu gülşən.

Qəmlərlə hey ağlaram mən indi,
Yaş da bu gözümdə bax, tükəndi.

Qurbanın ola bizim bu daxma,
Düş, mehmanım ol, kədərlə baxma.

Bir anlığa gəl, gecəm dayansın,
Ruhumda vətən günü oyansın.

Kim Kəbəni eyləsə ziyarət,
Könlündə tapar o, eyş-işrət.

Karvanları başçısız qoyublar,
Süngü gücünə yıxıb soyublar.

Kim nə dinləyibsə, nail oldu,
Minadə mənim ünüm boğuldu.

Fəryad elədim ki, qaydanız var,
Minadə şikarı ovlamazlar.

Söylə, dedi ki, kimi deyirsən?
Parlaq bir üzü nişan verib mən;

Göstərdim onu: durub utandı,
– Ovçu özüməm, – dedi, dayandı.

# ƏBÜL-ÜLA GƏNCƏVİ

*Nizaməddin Əbül–Üla Gəncəvi XI əsrdə Qətran Təbrizi tərəfindən əsası qoyulan Azərbaycan poeziya məktəbinin davamçılarındandır. XI əsrin sonlarında Gəncədə doğulmuş və təhsilini də burada almışdır. Şair kimi geniş şöhrət qazanıb II Manuçöhr sarayına dəvət edilmiş və Məliküşşüəra* (*Şairlər padşahı*) *təyin olunmuşdur. Saray ədəbi məclislərində yaxından iştirak etmiş, Şirvanda yüksələn mədəni hərəkata yaxından kömək göstərmiş, "hökmdarın yaxın məsləhətçilərinin başçısı" adına layiq görülmüşdür.*

*Ədəbi irsinin az bir hissəsi bizə gəlib çatmışdır. Azərbaycan ədəbi məktəbinin ənənələrini ləyaqətlə inkişaf etdirən bu sənətkarın əsərləri onun özünəməxsus orijinal yaradıcılıq siması olduğunu aydın göstərir.*

1

ŞİRVANŞAH MANUÇÖHRÜN MƏDHİ

Təbim bulud kimi, sözlərim gövhər,
Qəlbim bir dəryadır təlatüm eylər.

Dilimdir satdıran bu gövhərləri,
Zamandan üstündür onun dəyəri.

Müasirlərimdən mənəm irəli;
Layiqdir öyünsə mənlə gəncəli.

Yeri var, şairlər öyrənsə məndən.
Mənəm hamısından irəli gedən.

Bu Əli Dəqqaqın ağlı nazlanar,
İncə nöqtələrim nə zaman parlar.

Əli İbn Sina iftixar edər –
Dərin sözlərimi haçan eşidər.

İmadi dünyadan etdikdə rehlət,
Ondan qalmış mənə böyük şərafət.

Həkim Sənai ki, dünyadan doydu,
Bütün parlaqlığı mənimçün qoydu.

Şerimdə ifadə, rütbə, güc, səfa;
Həm atəşdir həm də su, torpaq, hava.

Əgər od, su kimi kəskindir sözüm,
Nədən yel, torpaq tək zəliləm özüm?

Əlli beşə çatdı, şükr olsun, ilim,
Altmışa çatmamış büküldü belim.

Qozbeləm, əyilmiş çəngə bənzərəm,
Elim eşitdikcə nalə eylərəm.

Uzun illər boyu ömr eylədimsə,
Tapmadım doğru yar, vəfalı kimsə.

Paxıllıq eyləyən min düşmənim var,
Durmuşlar canımın qəsdində onlar.

Mənim tək ariflər paxılsız olmaz,
Mənim tək alimlər düşmənsiz qalmaz.

Hər yerdə saçaram işıq, ay təkin,
Burda Süha kimi olmuşam itkin.

Gah mənim şerimə əl gəzdirərlər,
Gah da al qanımda girib üzərlər.

Bir söz qalmamış ki, adımdan, inan,
Deyib yazmamışlar onlar yalandan.

Ən pisi budur ki, demişlər şaha –
Nədimlər başçısı o, Əbül-Üla –

Xəbərçilik edir səndən düşmənə,
Dağıdır sirrini hər bir yetənə.

And olsun Davudun ağlar səsinə,
Tufanlar qoparan Nuh nalәsinә.

And olsun Əyyubun müsibətinə,
Yəhyanın müqəddəs, pak ismətinə,

Tövratın, İncilin əzizliyinə,
İbrahim söhfinə, Bətha şəninə,

Merac gecəsində olan izzətə,
Hacılar çatdığı böyük hörmətə,

And olsun Kəbənin qara daşına,
Səfayə, o dağa, Zəmzəm yaşına,

Arifə, alimə və zahidlərə,
Məscid sofisinə, mücahidlərə,

Aşkarda, gizlində nə demiş düşmən,
Mənə tutduqları hər bir eybdən –

Pakam Məhəmməd tək kafər sözündən,
Kəbə evi kimi müqəddəsəm mən.

Yusif qurdu kimi Yusif yemədim,
Yəhya nəfsi kimi, xəta demədim.

Kandarın olmuşdur Allah dərgahı,
Yer üzünün sənsən adil padşahı...

Kimsənin başını kəsməzsən heç vəqt –
Qələmdən başqa ki, etməsin qələt.

Deyərdim helmdə yüksək dağ sənə,
Səs yerində versə bəşarət mənə.

Sənə səxavətdə deyərdim dərya,
Dalğalanan zaman etməsə qovğa.

Ədldə, elmdə, helmü səxada –
Olmamış sənin tək bir şah dünyada.

Nə rəyin mənasız, nə ədalətin,
Nə helmin məcburi, nə səxavətin.

Səxa ovucunda qart daş mum olar,
Qılıncından daşlar qana boyanar.

Lütfündən ətr alsa xurmalıq əgər,
O daim tikansız xurma yetirlər.

2

## QİTƏ

İllərcə gizlədim onu əğyardan müdam,
Verdim o şuxə gözlərim üstündə yer fəqət.
Ol şux baxışlı gözyaşımın sadə tifli tək,
Gözdən yüyürdü, üz-gözümə çıxdı aqibət.

3

## XAQANİ HAQQINDA

Məni zəmanənin doğdu anası,
Dünyada yüksəklik, hünər ustası.

Arandan çıxmışam, altmış yaşım var,
On altı il etdim Şirvanda qərar.

Zəif bir qocayam, şahı vəsf edən,
Demirəm Keyxosrov, Keyqubadam mən.

Sual etsən məndən, ey Əfzələddin,
Özün doğrusunu eylərsən yəqin.

And olsun o əziz canına, səndən –
Xeyli narazıyam, düzünü bilsən...

Mən sənin ustadın, həm də qaynatan,
Sən mənim övladım, göz işığımsan.

Sən məni özünə seçərkən ustad,
Verdim qızımı da, olasan damad.

Sənin təliminə bel bağlamışdım,
Sənin şairlikdə dilini açdım.

Səni o xaqana özüm göstərdim.
“Xaqani” adını sənə mən verdim.

Nədəndir od kimi üstümə coşmaq?
Nə sən odsan, susan, nə mən yel, torpaq!

# XAQANİ ŞİRVANİ

*Əfzələddin İbrahim Xaqani Şirvani h. 520-ci (1126) ildə Şamaxıda doğulmuş, h. 595-ci (1198-99) ildə Təbrizdə vəfat etmişdir.*

*17 min beytlik qəzəl, qəsidə, qitə və rübailərdən ibarət "Divan"ı dövrümüzə kimi gəlib çatmışdır. Bu "Divan" ilk dəfə 1878-ci ildə 1582 səhifədə Laknauda (Hindistan) daş basması ilə çap olunmuşdur. "Divan"ın Bombey, Tehran, Təbriz və s. nəşrləri də var.*

*H. 551-ci (1156) ildə 3200 beytlik "Töhfətül-İraqeyn" ("İki İraqın töhfəsi") əsərini bitirmişdir. Əsər Mosul vəziri Cəmaləddinə ithaf edilmişdir. "Töhfətül-İraqeyn" poemasında Xaqaninin fəlsəfi görüşləri, feodal mühitinə münasibəti öz əksini tapır.*

*Ayrı-ayrı illərdə dövrünün görkəmli şəxsiyyətlərinə yazdığı "Münşəat"ı ("Məktublar"ı) 1967-1970-ci illərdə "Ərməğan" və "Fərhənge-İranzəmin" jurnallarında, eləcə də Təbrizdə universitetinin "Məcəllə"lərində nəşr olunmuşdur.*

1

MERATÜS-SƏFA

Mənim könlüm müəllimdir, dizim üstə dəbistanı,
O şagirdəm ki, öyrəndim, sükut ilə əlifbanı.

Nə hər dizdən olar məktub, nə də hər şagird əzbərxan,
Nə hər qətrə olar nisan, nə hər dərya sədəf kanı.

Dizim məktəb deyil yalnız, o, Nuhun gəştisi timsal,
Qəmim – Cudi dağı, gözdən axan yaş – Nuh tufanı.

Bu cür insanlara Cudi dağı ancaq topuqdandır,
Dizinə onların çıxmaz su, tufan tutsa dünyanı.

Deyil bu məktəbə layiq, o kəs ki, dalğası yoxdur,
Onun dörd tufanıyla cuşa gəlməz cismü ərkanı.

Dizi məktəb olan kəsdə gərək bir hümmət olsun ki,
Önündə it kimi diz çökdürə bilsin o, arslanı.

O insan ki, dözüb dərdə, baş əyməz mərdə, namərdə,
Onu diz çökdürə bilməz, tutan dördəlli dünyanı.

Olar Xızr öz zamanında, bu mənanı bilən insan,
Yaşar, ecazdə aciz edər Xızr ilə Musanı.

Onun təlqininin şərhi sükut ilə olar təvil,
Bütün təlim müşküldür, cəhalət isə bürhanı.

Mənim öyrəndiyim ilk söz bu məktəbdə "sükut" oldu,
Bəladır dil başa, lakin sükut hər dərd dərmanı.

Məni ilk dərsdə ustad dilimdən eylədim məhrum,
O dilli bərbətə dilsiz neyin üstündür əfğanı.

Qalarkən ney kimi dilsiz, dodaqdan can əta etdi,
Dedi: – Ney tək gözündən al nəfəs, – verdi bu fərmanı.

Məni təlqin butasında əritdi, yaxdı, ta məndə –
Nə şeytan hiyləsi qaldı, nə məğrur Adəm üsyanı.

Mənə öyrətdi çox şeylər, yazarsam cüzünü, çatmaz –
Səmanı dəftər etsəm və mürəkkəb cümlə dəryanı.

O "əbcəd" ki, mənə ustad təlim etdi təcridi,
Saralmış çöhrəmə yazdı qızıl xətlə gözüm qanı.

O gün ki, sirri yoxluqdan ibarət əbcədi bildim,
Unutdum varlığa bağlı olan hər bir müəmmanı.

Görüncə bilməməkdir bu qəribə məktəbin elmi,
Unutdum hafizəmdə yer tutan hər elmü ürfanı.

Qəribə elmdir, döndüm onunla sırf nadanə,
Əcəb ustad imiş, təlim edir o guya nadanı.

Necə ayinədə tuti görər öz əksini, lakin –
Gələr nitqə təəccübdən, olar əksinin heyranı.

Ömür keçdi bu məktəbdə, hələ "əbcəd"dəyəm aciz,
Nə vaxt dərk eylərəm, aya, müəmmalı bu divanı?

Hələ körpə uşaqlar tək oyun ardındadır fikrim,
Bu hoqqabaz fələk heyran edir feliylə insanı.

Oyun həngaməsi qurmuş çocuqlar, bax, bu meydanda,
Yer heyran tək dayanmış, göysə dövr eylər bu meydanı.

Budur, axır oyun bitmiş, yəqindir ki, çatıb axşam,
Günəş batcaq, bu adətdir, qaranlıq örtər hər yanı.

Görəndə təbimi əqlim düşər təşvişə, naçarəm,
Şüurum var ikən təbim gərək tərk eyləyə canı.

Necə Firondən Musa qaçırdı çarəsiz, indi –
Mənim əqlim də qaçmaqda edir təqlid Musanı.

Bəhərsiz bir arı olmuş əgər nəfsim əzəl başdan,
Bu gün şadəm ki, şəhd ilə dolubdur nəfsimin şanı.

Onu mürtədliyə mail görüncə, adəti üzrə,
Açıldı sirri, mən nəfsin başın kəsdim də pünhanı.

Onu xəlvətdə dəfn etdim, məzarın qanla islatdım,
O qanlı qəbrə mən təlqin dedim ayati-imanı.

Şəhidin qəbri zahirdə qan ilə islanar, amma –
Dolar mişk ilə daxildə, olar cənnət gülüstanı.

Təbiət kaftarı söksə bu qəbri, qorxmuram, çünki
Şəriət məhtabın etdim bu qəbrin mən nigəhbanı.

Əgər nəfsin məzarında tikan bitmiş, nə dərdim var:
Tikan zahirdədir, sən batinə bax, gör gülüstanı.

Günəşdir hümmətim, Zəndlə Avestanın şahənşahı,
Minib ərşi, yatırmışdır dizi üstündə İsanı.

Bəli, dərvişdə hümmət günəş misli gərək olsun,
Axı o, şahdan üstündür, nə yurdu var, nə samanı,

Süleymana bərabərdir hər hümmət sahibi dərviş,
O "rəbbi həbli" təblinin səsindən titrər eyvanı.

Cahanla can iki bütdür düşüb dərviş ayağına,
Tamahla ehtiyat it tək olub zəncirli dərbanı

O İskəndərsifət Xızrın hava – taxtı, ağıl – tacı,
O aqil sərxoşa süfrə – rizadır, can – mehmanı.

Xəzinədarı – fikr, ilham, keşikçi – şər ilə tovfiq,
Əsiri – nəfs ilə amal, qul etmiş çərxi, keyhanı.

Nə hind cibalı tək qurmuş sitəmlə qəsri – "tağuti",
Nə Çin xaqani tək zülm ilə düzmüş tacə mərcanı.

Onun təslim ocağında odundur təxti sultanın,
Onun ixlas səməndinə nal etdik taci – xaqanı.

Azadlıq meydanında at çapırmaq könlünə düşsə,
Kosu – amal olar, əqlin ayağı – əldə çovqanı.

Mənim qəlbim evi göz-göz olub indi pətəklər tək,
Eşikdən sadədirsə, var içində bal dolu şanı,

Hörümçəklər toru zahirdə bir tül pərdəyə oxşar,
İçində, yoxdur əslində çibindən başqa büryanı.

Nəyə lazım balıq tək zahiri pullu, içi bomboş,
Sədəf ol ki, üzün sadə ola, qəlbin gövhər kanı.

İradə şahının getdim öpəm bir gün ayağından,
Məni taxta çıxardı, söylədi: öz mənzilin tanı!

Həvəs istərdi birlikdə mənimlə taxta əyləşsin,
Qolundan dartaraq, qovdum yanımdan mən o nadanı.

Salındı süfrə, əyləşdim, nəyə lazım mənə nemət,
Qidam öz duzlu göz yaşım, üzümdür zər nəməkdanı.

Məhəbbət camını verdi əlimə dost, şad oldum,
O camda Xızr içmişdir, deyirlər, abi-heyvanı.

Belə bir mənzili görmüş dübarə hissə aldanmaz,
O məclis şirnisin dadmış yeməz noğl ilə həlvanı.

Olar İsa kimi bayram mənim qəlbimdə hər anda,
Fəqirlik bayramında, bil könüldür təkcə qurbanı.

Mənə qəlbim dedi: ol fəqrə qane, baxma dünyayə,
Bir ac yurda, rəvadırmı, dikə göz Misr sultanı?

Fələk mehtərləri ömrün atından saldılar nəfsi,
Bu otlaqda nəyin vardır, qəhət almış bu səhranı.

Tapılmaz kəndlidə arpa, onu dövran yandırmış,
Çörək olmaz o təndirdə ki, basmışdır su tufanı.

Tapılmaz heç bu xırmanda bir arpa, aləmi gəzsən,
Gözün çək arpadan, olma çörəkçün şah dərbanı!

Qoşulsa cahilə aqil, əsər qalmaz kamalından,
Bir oğru olsa karvanda, çalar eşşəklə palanı.

Xəsisdir ruzigar, umma onun pay süfrəsindən kim,
Gecə-gündüz iki it tək qovar biçarə mehmanı.

Saqın sən bu ala itdən, amandır, felinə uyma
Ki, dişdən eyləmiş məhrum, dişilə bir çox aslanı.

Fələkdə varsa da bir cüt çörək, bir sünbül, aldanma,
Sən bir dəstə keşniş də deyil bu çərxin ehsanı.

Səmanın süfrəsində gördüyün nanparədən göz çək,
Dilənçi qismətilə göy qonaq saxlar Məsihanı.

Tamah ölmüş, ona meyyit namazı qıl desəm, hardan –
Taparsan su? Tutub çirkab iraq üzdən bu dünyanı.

Təyəmmüm qıl, desəm yoxdur bu dünyada təmiz torpaq,
Şəhidlər qanına batmış bütün bərrü biyabanı.

Özünü bəsləyənlər bir gülə oxşar ki, gülşəndə;
Tikandır batini, ancaq geyib əyninə dibanı.

Ağan süfrə açan günlər bütün itlər edər bayram,
Acından ölsə də, aslan yeməz itlərlə ehsanı.

Səxavət sahibi tozlu tikəylə cənnəti aldı,
Nə baki, olsa da müflis, bu dünya fanidir, fani.

Nolardı, bircə bilsəydim bu dünyada nəyin artar –
Yeyib-içsən gecə-gündüz şərabı, noğlu, reyhanı?

Əmirə söylə bilsin ta ki, nəfs – it, civə sərvətdir,
İtə həmkasə olmaqla gedər badə şərəf-şanı.

Ölər bağa çanağında, çıxar əfi qılafından,
İlandan kəm deyilsənsə, soyun bu rəxti-əlvanı!

Süleymanəm demə, əvvəl yanından divləri rədd et –
Və ya zəncirlə, ya öldür, ya qov quli-biyabanı!

Sənin amir o ruhun ki, tapar yer bağí-cənnətdə,
Ona qoy olmasın məhbəs bu nəfsin qarə zindanı.

Xoşa gəlməz ki, şahənşah qayıtsın şad qürbətdən,
Otursun qəsrdə rahət, unutsun yarü əyanı.

Bu aləmdən uzaqlaş sən, o aləm dərdinə qalma,
İki aləmdən üstündür təfəkkür əhlinin canı.

İki aləm iki gözlü tərəzidir, bunu bil ki,
Ədaləti çəkə bilməz ilahinin bu mizanı.

İki aləmdə sərvət dərdinə namərd qalar ancaq –
Ki, Mizan xasdı Nahidə, o sevməz nəcmi-Keyvanı.

Ayaq torpağını al mərdlərin, başına tac eylə,
Qızıl tac alma, vermə oğruya sən sirri-pünhanı.

Deyil dərviş o kəslər ki, ola şah tacına məftun,
Gərək dərviş bir gözdə görə dərvişlə sultanı.

Könül sultanı dərvişlər səfində xas yer tutmuş –
Ki, şah tacından üstündür ona dərvişin astanı.

Bütün dərvişlərin şahı olubdur Əhmədi-Mürsəl –
Ki, "Nun-vəlqələm" Quranda sibt etmiş bu fərmanı.

Əgər dərvişsən, dərvişlərin əhvalına qal ki,
Günəş üryan ikən xələtlə şad eylər çox üryanı.

Cahanda yoxsul olduqca, daha artıq səxavət qıl –
Ki, meynə doldurar zərlə payızda bağı, bostanı.

Riyadır hər kəs istərsə səxavətə əvəz almaq;
Verib bir dirhəmi, on dirhəm etsin borclu yəzdanı.

Bacarmaz yaxşılıq pislər, müqəssirdir buna xilqət,
İlandan bal umarlarmı, onun yoxdursa imkanı?

Arı sancarsa da bəzən, – bu nadir bir təsadüfdür,
Xəbər vardır bu haqda get oxu ayati-Quranı.

Bacarsan, olma aludə cəlalına bu dünyanın,
Bu murdar daşı almaqla ələ, şad etmə şeytanı.

Fəqirin xirqəsində bəxyələrdə rəmzlər vardır –
Ki, anlar "lövhi-məhfuz"u açanlar bu müəmmanı.

Hamı dünyaya aşiqdir, biz isə qəmdən azadıq,
İtə aşiq olanlarda gərəkdir olsun it canı.

Sənə bir həftəlik bəxtin əgər yar olsa, şad olma,
Üçüncü həftədə başlar həmişə təzə nöqsanı.

Atarsa qol-budaq neysan ayında gərçək ağacı,
Onu xoşbəxt sanma, qarşılar pəjmürdə abanı.

Fəlakətsiz səadət umma dövrandan, yəqin bil ki,
Hilal iqbalına qarşı təbiət qoydu Sərtanı.

Düşünsən haqqını, yoxdur cahanda daimi iqbal,
Dönük, sərt üzlüdür, billah, onu sən yaxşıca tanı!

Saqın sən gücsüz ahından, gecə yatmır o, göz yummur,
Elə bil nizələr batmış gözünə kirpiyi sanı.

Tökər sübhə qədər qan-yaş gözündən sel kimi məzlum,
Boğar zalımları rahət yataqda qanlı tufanı.

Əlac axtar qəza təqdirinə, sən əzdiyin aciz –
Düşübsə torpağa, ahı yıxar ərşi-müəllanı.

Salıbsan Bijəni həbsə, sən ey Əfrasiyab, yatma!
Durubdur pusquda Rüstəm, əlində tiği-bürranı.

Yatarsan məst, lakin yatmamış sən əzdiyin məzlum,
Pilə qurdu kimi sazlar sənə tor çeşmi-giryanı.

Edibsən it kimi pislik, peşiman ol, "əl-əfv" söylə –
Ki, itdə eyləyər "əl-əfv", nəyin olsa peşimanı.

Qocalmışsan, ölüm vaxtı nədir, nalan olursan sən?
Doğulduqda uşaq ağlar, tutar dünyanı əfğanı.

Qoyun tək bağlamış quyruq sənə dövran, belindən at –
Onu, qoy gavü mahinin dağılsın qəsri, ərkanı.

Sənə dayə olub torpaq, südün əmdin, əmər qanın,
Bütün qanın o süddəndir ki, vermiş dayə püstanı.

Cavanlar qanıdır, içmə, əlində tutduğun badə –
Ki, torpaq meynəlikdən qaytarıb öz içdiyi qanı.

Gözəl zalimlərin nəfsi kimi, xunxar bu dünyanın –
İçi olmuş məzarıstan, eşikdə bağü bostanı.

Xorasan bir hərəmdirsə, Məlikşahdır ona Kəbə,
Səmərqənd bir fələkdirsə, bir ulduzdur Qədər xanı.

Qədər xan öldü, bir gün də Səmərqənd etmədi nalə,
Məlikşah getdi, bir kəs görmədi ağlar Xorasanı.

Məlikşah "od-su" adlandı, su axdı, atəşi söndü,
Kül oldu, torpağa döndü, məkan qıldı Sifahanı.

Vurarkən Səncərə şəbxunu Gurxan fateh adlandı,
Əcəl Gurxana şəbxun vurdu, kor oldu şəbistanı.

Görün Xaqaniyə hümmət necə imkan yaratmış ki,
Bu gün yüz fəlsəfə ustadını saymaz da Xaqani.

2

Şaham, mənim əlimdədir bu söz mülkü, söz diyarı,
Bü dünyada tək mənimdir söz mülkünün ixtiyarı.

Nadir-nadir mənaların Məryəminə ruh verənəm,
Uca, yüksək fikirlərin aləminə hakim mənəm.

Mənəm ağlın Şah Tuğanın əvəz edən qabil vəkil,
Fəzilətin gəlininə sahib olan cavanam, bil.

Geyib hikmət zirehini, çağırıram hərif bu dəm,
İlhamlardan süfrə açıb, uca səslə: – gəl, – deyirəm.

Mənim bakir sözlərimdir xasiyyətdə ruh tilsimi,
Mənim qəlbim nurlandırır ağılları işıq kimi.

Sehr düzən şairlərə sapı verən bil mənəm, mən!
Bütün şeir zərrabları hey kimiya alır məndən.

O Həssanın qəlbin yeyən bu nəzmimin həsrətidir,
O Söhbana şillə vuran bu nəsrimin qüvvətidir.

İlhamımın Büraqı da hansı yerdə salarsa nal,
Fələk onu döyüş üçün kəskin qılınc edər dərhal.

Mübaliğə deyil əsla: "papağımdır – əzəliyyət,
Guşənişin insanlara don tikirəm – əbədiyyət".

Yer üzündə kölgə kimi sakinəmsə; diqqət et bir:
Əsərlərim günəş kimi, mənzil-mənzil dünya gəzir.

Bu ustadın adı nədir? – biri deyir heyran-heyran,
O biri də soruşur ki: bu sehrkar gəlmiş hardan?

Qənaətin şahlarşahı əmr verən andan bəri, –
Uzansan da çatmaz mənə tamahın o boş əlləri.

Şirin mədhim əhl adama gözəl şərab olar hər an;
Tutiyanı qayırırlar aləm içrə turş qoramdan.

Dilim göylər xəznəsinin açarıdır, bunu bil sən,
Bu iddiam sübut olur Məhəmmədin sözlərindən.

Dəfinələr, xəzinələr içindəyəm hər zaman, bax,
Onlar isə inci tapmaq həvəsilə ələr torpaq.

Bu aləmə gələn gündən, ağlın mənəm bir çırağı,
Onlar isə kordur tamam, görməyirlər heç uzağı.

Dərrakəmin, qüdrətimin düşmənidir bu paxıllar,
Bax, bu sehri, xariqəni eyləyirlər onlar inkar.

Bir neçə haqq tapdalayan Yusifə də dedi hədyan,
Məhəmmədin sözlərini yalan saydı neçə nadan.

Məna yurdu Hindistanda Adəm kimi tutdum qərar,
Sənət yurdu Çində "mərdüm-giya" olmuş bu ulaqlar.

Qurşun kasa içi kimi qapqaradır ürəkləri,
Civə qabı ağzı kimi bərk bağlanıb ver əlləri.

Sanki onlar quldurluğun məktəbini bitirmişlər,
Küfrə qardaş olub, səfa dostlarını itirmişlər.

Mən ki, Misrin əziziyəm, ləyaqətsiz bu adamlar,
Bazarlarda veyillənib, orda-burda namus satar.

Haqlıdırlar bir səbəblə onlar olsa mənə düşmən,
Çünki Süheyl ulduzu tək öldürürəm bicləri mən.

Peymanəmin damcıların onlar içir susuzluqdan,
Onlar mənim sirr süfrəmdən tör-töküntü istər hər an.

Beyinlərin laxladaram bir fil kimi zərbəmlə mən,
Çıxardaram ilan təki mən onları dərisindən.

Onlar – Ad qoşunu, mənim yel qanadlı qələmim var,
Onlar Yəcuc tayfasısa, mənim nitqim bir sur olar.

Əbəs yerə özlərini Xaqaniyə bənzədirlər,
Heç gözəl yaz buluduna bənzəyərmi qaba süngər?

Qamışlıqda qarğıların görünsə də rəngləri bir,
Birisindən şəkər çıxır, digərindən quru həsir.

Misgin, məğmun eşidərkən şerimdəki fəsahəti
Beyni-başı alov tutur, artır mənə küdurəti.

Deyirlər ki, özümüzük dəniz güclü o Xaqani,
Bəli, onlar Xaqanidir, ortasından atsan "qa"nı.

3

Əqlə ağır yük daşıdan mənim könlüm, bəyanımdır,
Qələm seyrə çıxan zaman söz üzəngi tutanımdır.

Zəmanəni xəlq eyləyən bir Allaha and olsun ki,
Dövran mənim dövranımdır, zaman mənim zamanımdır.

Şeriyyətin qıt olduğu bu əyyamda, aləm bilir,
Ac qəlbləri qonaq edən mənim şirin lisanımdır.

Dünya mənim narıncımın ətri ilə çulğalanıbdır,
Çünki məna bağ-bağçası mənim yaşıl bostanımdır.

Hər axmağın hərzəliyi incitməyir əsla məni,
Bu dünyada yoxdur tayım, meydan mənim meydanımdır.

Çox tez çatır şərqə, qərbə mənim könül məktublarım,
Çün fələyin göyərçini mənim xəbər yayanımdır.

Mənəm məna yaratmaqda şairlərin peyğəmbəri,
Söz möcüzü varsa əgər, bu gün mənim bəyanımdır.

Sən, ey mənə pis söyləyən, bir gün şimşək səni vursa,
Ölüb getsən, bil, o şimşək mənim ahım, fəğanımdır.

Həcv edərkən söyüş söymək xasiyyətim deyil mənim,
Əlimdəki qələm mənim zərif məna yazanımdır.

4

Zaman başa vuranda Sənainin dövrünü,
Bu şeir dünyasında o gün Xaqan doğuldu.

Getdisə də Qəznədə bir sahir torpaqlara,
Şirvan elində sahir bir növcavan doğuldu.

Köçdüsə də dünyadan bir xoşavazlı bülbül,
Köhnə evdə təzə bir tutizəban doğuldu.

Bir ölkədə öldüsə yeganə söz ustadı,
Başqa eldə bir ustad şeiryazan doğuldu.

Getdisə də bir dahi üçüncü iqlimdən, ah!
Beşinci iqlimdə bir dahi insan doğuldu.

Tükəndi reyhanların ömrü, güllər açıldı,
Səhərin fəcri keçdi, günəş ondan doğuldu.

Məğribin yaxasında qəmər gizlənən zaman,
Məşriqin ətəyində günəş lapdan doğuldu.

Qayıtdısa Mahmudun cismi qara torpağa,
Əhdimizin Səlcuqu o torpaqdan doğuldu.

Tarixlərə baxanda gördüm, Bəhmən ölən tək,
Tarixdə İskəndər tək bir hökmran doğuldu.

Düz danışan Yusifin şirin dili susanda
Onun varisi Musa, bil, anadan doğuldu.

Əbu-Hənifə öldü axşamüstü, haman gün,
Şafei dan ulduzu çıxan zaman doğuldu.

Məhv etdisə gecənin əsərini zəmanə,
Gündüzün əlaməti oldu əyan, doğuldu.

Çox şükür, söz bağında çiçəklər töküldüsə,
Budaqlar bəhrələndi, məna, ürfan doğuldu.

Söndü axan bir ulduz, parıldadı şəhabı,
Torpaq su içdi, ondan xoş gülüstan doğuldu.

Bir məsəl var, deyərlər: toyuq dən yedi, sonra –
Onun yumurtasından ləlü mərcan doğuldu.

5

Xaqaniyəm, yer üzünə yayılmışdır şöhrətim;
Bu aləmdən xilas olmaq hikmətimdir, hikmətim.

Qırmış təməh cinlərini sənətimin xəncəri,
Bu kəskin dil mələklərdən olmuş mənim qismətim.

Mələk üzlü, bəd tiynətli fələk istər Cəmşidə –
Divlər bir qul olduğu tək, bəlkə ola xidmətim.

Yoxumsa da var-dövlətim, deməırəm ki, yoxsulam,
Yoxsulluq bir varlılıqdır, artar ondan şövkətim.

Bu dünyanın murdarlığı əlindən can qurtarsam,
Yusif olar suçəkənim, artar qədrim, qiymətim.

Xacənin mən istəyirdim töhfəsini rədd edəm,
Çünki belə töhfələrdən çox yüksəkdir hümmətim.

Xızr dilə gəlib, mənə dedi Kəbə adından:
Rədd eləmə, bil ki, odur mənim vəlinemətim.

6

GÖZƏLLİKDƏN ŞİKAYƏT

Könlüm yaxıldı od tək onun dadlı qəndinə,
Qəlbim üzərlik oldu yanan odlu dərdinə.

Xaqani bir azadlıq olan mülkdən gəlib,
Sanma ki, bənd ola fələyin hiylə bəndinə.

Bayram çağı görəndə saralmış yanan günəş,
Düşdüm hilal tək mən onun nur kəməndinə.

Qoynu ipək, fəqət ürəyi şalə bənzəyir,
Mat qalmışam bu fərq ilə mən öylə fəndinə.

Ağlar gözüm, yuyar üzümü intizar ilə,
Bir dəm, nolar, çatam sənin o nuşxəndinə.

Ahım sinəmdə zəncirə döndü mənim, haray!
Baxmaz, nə eyləmək ki, belə dərdməndinə.

Odlar sönər əsəndə soyuq yel, bu rəsmdir,
Ta sönməmiş odum yetişən bir səməndinə.

Netmiş, görən ki, sırğa, asıbdır qulağına,
Görcək düşürəm mən də inan sırğa dərdinə.

Daim mənə nəsihət edər, bir qulam ona,
Yetməz, heyif ki, taleyimiz bəxt həddinə.

Xaqani bir dirəmlə alınmış onun qulu,
Satsa bu dəm söz açmağa əsla ki, həddi nə?!

Bir arpaya o sünbülünü almayır göyün,
Əvvəl nə idi kəhkəşanı, söylə indi nə?

Baxmaz həyat gülşəninə, tərk edib keçər,
Verməz qulaq o boş sözünə, pənd-məndinə.

Bir qönçə tək o bağlı dil ilə çəkər fəğan,
Sınmaz çinar kimi, dayanar köklü əhdinə.

Bir Xızrdır ki, guşənişinlik edir bu gün,
Xızranə meyl edir daha Özkənd kəndinə.

Böylə böyüklük ilə nəzər saldı özgəyə,
Lənət bəla verən bu zamanın həpəndinə!

İt milçəyilə qartal olubdur həmaşiyan,
Dərmanı gör nədir, onu seyr et ki, dərdi nə?!

Qarğa deyil ki, meyl eləyə murdar ətlərə,
Simurqdür, bilir fələyin feli, fəndi nə,

Hərçənd həyat bəxş elədi pak nəfəslə o,
Saldı nədənsə sonra məni odlu Zəndinə.

Gün görmüsən ki, sən suları qaldıra göyə?
Bax buzluğa ki, seyl dönüb çeşmbəndinə.

Bəsdir, od olubdur onun övladı təbinin,
Övladə bax ki, fəxr yaranmış o Zəndinə.

Nakəs görəndə bal ilə mey tək bu sözləri,
Tez turşudar üzün nə deyə, ya nə cür dinə...

Zərdüştün atəşi görər isə bu sehrimi,
Söndürməyə səpər suyu Zərdüşt Zəndinə.

7

## ATAM USTAD ƏLİNİN TƏRİFİ

(*ixtisarla*)

Göydə bulud bənzəyir zülfi-pərişanına,
Var günəşin oxşarı çöhreyi-tabanına.

Şirləri etmiş əsir pəncəsi sevda ilə,
Dözməyib heç bir zireh navəki-müjganına.

Çöhrəsi güldən gözəl, ləbləri qənddən şirin,
Duzla çörək bəxş edib mehr ilə mehmanına

Göylər alır rəngini yerdə məgər qönçədən,
Bənzədir öz halını püsteyi-xəndanına?

Baxma ki, bir az mənə lütfü azalmış onun,
Ömrü boyu borcluyam şöhrətinə, şanına.

Verdim ona könlümün dağını, gözyaşımı,
Kim vuracaq böylə nəqş dilbərin eyvanına?

Keçdi ömür dərd ilə, çaldı göyə dırnağım,
Böylə ağır qəmlə mən dözmərəm hicranına.

Öz gülüşüylə verib odlu nəfəslər mənə,
Böylə odu salmaram yar gülüstanına.

Deyləmimizdir bizim, mənsə bu ünvan ilə
Hindli kimi tabeyəm daimi fərmanına.

Eşq deyir şövq ilə söylə ki, Xaqaniya,
Yarım əzizdir, olum qurban onun canına.

Dairə çəkdi dünən bir ata tək gördü o,
Harda olam, bağlıyam ləl ilə mərcanına.

"Sanei-zərrinəməl, piri-sənaət Əli"
Gəlməz o beyzalı əl sənəti meydanına.

### İkinci mətlə

Eşq zərif dürdür, can da onun ümmanı,
Qəlb əcəmi bir gözəl, eşqin onun dastanı.

Can sağ əlilə döyür qapısını vəhdətin,
Sol əl ilə yoxlayır qulluğuna imkanı.

Qoyma könül aynası paslana gözdən düşə,
Eşq alıb gəzdirir bir belə pak aynanı.

Əql susuzdur yanır, hümmət onun həsrəti,
Təşnədir o camına, süfrəsi can dərmanı.

İlk yaranırkən həyat ilki könül xəlq olub,
Dairədə olmayıb nöqtəsinin dövranı.

Əmn-amanlıqdadır könlümüzün qasidi,
Şəminə pərvanədir yer üzünün divanı.

Gövhərə bənzər könül, qiyməti həddən ziyad,
Bir əbədi feyz onun dəhrdə adı-sanı.

Ancaq onu qorxudan gildə ediblər nihan,
Bir də çətin aşkara bir elə imkan hanı?

Qəlb ayaq döydü hey sinədə fəryad ilə,
Tapdaladı aləmi hiddət ilə cövlanı.

Qəlb səmadən gəlib, yerdə yaranmazdı o,
Odla ki, oynar belə varlığının hər anı.

Oldu könül mənzili dağlı əlindən sənin,
Ah, necə süsləndi gör nəqşin ilə eyvanı.

Yusifi saldın əcəb sən belə bir zindana,
Sonra qızıldan qıfıl aldı onun zindanı.

Bir gözəli salmısan sən ayağın altına,
Milçəyini qovmusan, rahət ola ta canı?

Palçıq at üstündəki qəlb nə cür şad ola,
Rəxşə gərəkdir onun hökm eləyə fərmanı.

Bayraq olubdur könül, səbr elə, olsun vəzir,
Ta başa çatsın onun yeddi geniş ormanı.

Böylə könül söhbəti hasili Xaqaninin –
Bağlıdır xoş söhbətə dini ilə imanı.

Söylədi, Xaqaniya, eşq uca sövt ilə, –
Nə böyük işdir, oyan, gör ki, nədir peymanı.

8

## TÖHFƏTÜL-İRAQEYN

(*parçalar*)

### FƏXRİYYƏ

Sənətkarlıq nədir, bilmək istəsən,
Gəl onun sirrini sən məndən öyrən.

Kamal mayasında bir zərrə idim,
Günəş məqamına qalxıb yüksəldim.

İndi söz günəşi aləmdə mənəm,
Şairlərdən üç qat ucadır rütbəm.

Dövrəmdə ay kimi gəzirlər onlar,
İlham mayasını məndən alanlar.

Mənsiz bir heçdirlər, parlasalar da,
Ardımca sürünər onlar dünyada.

Gecə solğun işıq saçsa da qəmər,
Günəş doğan kimi o gözdən itər.

9

### GÜNƏŞƏ XİTAB VƏ QIZILI MƏZƏMMƏT

Uşağa xoş gələr qırmızı, sarı,
Kişi getməz lələ, qızıla sarı.

Gül-çiçək oxşayır qızıla, lələ,
Odur tez solaraq, verilir yelə.

Pislik zatındadır qızılın əslən,
Ölümə məhkumdur hər pislik edən.

Hər kim qızıl yığıb töksə kisəyə,
Kisə tək boğazı keçər ilgəyə.

Kimin qızıldadır gücü, yəqin bil,
Qızılın quludur, sahibi deyil.

Bir möhnət odudur cana simü-zər,
Düz olar qızıla deyilsə "azər".

Zərdüştün adının əvvəlidir "zər",
Zərə arxalanır atəşpərəstlər.

Zər nədir? Sönmüş bir atəşdir, ancaq
Ona mən deyərdim: bir ölü torpaq.

Ürək çeşməsindən tutulmuş gözü
Belə sönmüş odla açılmaz, düzü.

Tamah dəmirindən geyinsən paltar,
Qızıl o paltara miqnatis olar.

Bu dəmir geyimi çıxarsan əgər,
Qızıl miqnatisi səndən əl çəkər.

Qızıl həm oğrudur, həm də ki, dilbər:
O ikiüzlüdür, ondan üz döndər.

Bütə oxşasa da o dilbər pəri,
Sındırmaq lazımdır elə bütləri.

Qızıla Xaqani salınca nəzər
Dedi: bütpərəstdir qızılpərəstlər.

O, büt sındırmağı öyrənib çoxdan,
Atəşpərəstliyin qaçmış odundan.

Altıbaşlı dünya arzular insan,
Qızıl yeddibaşlı ilandır, inan.

Kimin gözlərini pərdələyib zər,
Aynaya baxsa da, görməz o gözlər.

Sən ey gövhərlərə gözəl rəng verən,
Hər şeyə bir surət, bir ahəng verən.

Dünyada hər kəsə əziz, mehriban,
Hamıya dayə tək bir nəzər salan.

Günəş! Sən hər şeyə nüfuz edirsən,
Çox böyük, çox uca olsan da, bəzən –

Enirsən üstünə qara torpağın,
Ayağı altında hər bir alçağın.

Ey kimsədən işıq əsirgəməyən,
Məndən əsirgədin onu bəs nədən?

Dostdan üz çevirmək dosta nə layiq?
Bu sifət görünmüş, düşmənə layiq

Şirvan şəfəqinə qərq olub tamam,
Bəs niyə mən belə qaranlıqdayam?

Dərdimi açmağa bir həmnəfəs yox,
Xoş söhbət etməyə yaxın bir kəs yox;

Möhnətlə, sinəsi dağlı qalmışam.
Kimsəsiz, ayağı bağlı qalmışam.

Pars odu püskürür dodaqlarımdan,
Hind xəncəri edib qəlbimi şan-şan.

Qapı halqası tək asılıyam mən;
Sızlaram hər yetən namərd əlindən.

Bir daş parçası tək başsız, ayaqsız
Qaranlıq bucaqda qalmışam yalqız.

Başıma bir çəkic zərbəsi dəydi,
“Əlif” qamətimi “mim” kimi əydi.

Bu qoca dünyanın ustadısan sən;
Xalqın qapısında həmişəliksən.

Mən qapı halqası olmuşam, deyə
Ahım halqa-halqa yüksəlir göyə.

Elə ki, bu ahlar sinəmdən axır,
Mənim boğazımı yandırıb-yaxır.

Möhtəşəm bayrağın yüksələn zaman
Min düyün açırsan. Nə olar bir an

Mənim də gözümün pəncərəsindən
Baxasan bir anlıq ürəyimə sən...

Çoxdur pəncərəsi günə baxanlar;
Hər halda mənim də bir pəncərəm var.

Kimin qapısına sən nur səpirsən,
Gəlir ruzusu da dal pəncərədən.

Nərgiz kor olsa da, şux baxışı var,
Başsızdır, lakin o qızıl tac qoyar.

Elə adamlara üzük verirsən –
Ki, onu torpağa atırlar həmən...

Üstündə bir qızıl olsa süfrənin,
O süfrəni yerə çırpmazlar yəqin.

Balıq tək pulludur ancaq o insan,
Elmin dəryasında olmuş hər zaman!

Dövlət nə biliyin, nə hünərindir,
Mənsəb də, sərvət də nakəslərindir.

Fələyin zatında qalmamış nişan –
İgidlik, sədaqət və adamlıqdan.

Fələyin dövranı dəyişib artıq,
Günəş də anlayır ögey-doğmalıq.

Yox, bu dediklərim tamam əbəsdir,
Bunlar gəlib keçən ani həvəsdir...

Mən kiməm, qoy deyim bir az özümdən,
Verim öz nəslimdən sizə xəbər mən.

10

## BABAM HAQQINDA

Sənətcə toxucu olmuşdur babam,
Mən də yavaş-yavaş söz toxuyuram.

Gecələr səmayə baxsanız əgər,
Pambıq tarlası tək görünər göylər.

O pambıqdan olar ipliyim mənim,
Bir sənət evidir ruhum, bədənim.

Mənim can evimdə ilham pərim var,
O iplik əyirər, arğaclar qurar.

Vəta, Adəm, Xızr və Musa üçün
Məna naxışları vururam hər gün.

Əgər istəsələr ləbbadə, dəstar,
Ruhdan toxuyaraq verrəm yadigar.

İstəsəm dindən də bir paltar tikmək,
Tikərəm, şübhəsiz, onu "Yasin"tək.

Fələkdə parlayıb ötən yolçular
Tikirlərsə əgər bəzəkli paltar,

Təfəkkür odundan, ilham suyundan,
Mən də toxuyuram naxışlı dastan.

Bir möcüz göstərib mənalı sözdən,
Sudan, oddan paltar toxuyuram mən.

Layiqdir, göydəki üç bacı alsın,
Şerimi ləçək tək başına salsın.

İncəlik yaratmaq istəyən zaman,
Sənətin ecazkar karxanasından –

Mələklər başına mən qoyaram tac,
Eylərəm İsanın dərdinə əlac.

Özüm tor quraram ipəkqurdu tək,
Hörümçək kimiyəm daima işlək.

Ancaq onun kimi al qan içmərəm,
Barama qurdu tək halal işlərəm.

Barama qurdusa söz toxusa əgər
Özünü o ancaq bizə bənzədər.

Hörümçək toxuyar naxışlı paltar,
Lakin bir ucundan onu tez yırtar.

Baram qurdusa edib qənaət,
Zahid tək evində yaşayar rahət.

Barama qurduyam, hörümçək deyil,
Ömrümü sürürəm halallıqla bil!

Gözəl gəlin kimi barama qurdu
Pərdənin dalında gizli oturdu.

Hər kəsin ki, belə gözü, qaşı var,
Pərdədə yaşamaq ona yaraşar.

Mənəm, bax, bu günün əziz insanı,
Mənəm söz toxuyan şair Xaqani.

İndi bir guşədə yaradıb hikmət,
Edirəm bir neçə sufiylə söhbət.

Xasların məclisi bəzənsin deyə,
Sözdən fərş toxuyub, edim hədiyyə...

11

ATAM NƏCCAR ƏLİ HAQQINDA

Atam nəccar idi, dərs alıb ondan
Oldum zəmanədə ustad sözyonan,

Sözün matqabilə çalışaraq, mən
Kaman düzəldirəm qövsi-qüzehdən.

Ağlımı qaldırsam göylərə əgər,
Yüz tayfa qarşımda xidmət eyləyər.

O rind ki, rəndəmdən çıxaraq yaşar,
Dövrün simasında bir telə oxşar.

Musa ağacıdır ağacım tamam,
Tuba budağından düzəlib taxtam.

Ağlımın davatı o ağacdandır,
O taxta mənimçin bir təxti-candır.

Təbim bəzəyərsə bu taxtı əgər,
Olmaz bir gövhər də ona bərabər.

Nuh hanı ki, ona verim yadigar,
Bu memar təbimdən səttarə, pərgar.

Nə qədər məskənim bu xoş məkandır,
O Şərvan deyildir, bir xeyrvandır.

Təsdiq etməsə də neçə xam kişi,
Bitdi Xaqaniylə söz yonmaq işi.

12

ATAM NƏCCAR ƏLİNİN TƏRİFİ

Atam, aləm bilir, Nəccar Əlidir,
Onun səxavəti elə bəllidir.

O məni böyüdüb, vermişdir çörək,
Mədh edəm, vəsf edəm onu mən gərək.

Sənətdə Azərdi, söhbətdə İsa,
Tabut qayırardı o, Xəlilasa.

Onun qayırdığı tabutlar, yəqin,
Qoyulur qəbrinə musəvilərin.

O da bir Əliydi adda, ehsanda,
Mən isə Qənbərdim hazır fərmanda.

Azad ailənin başçısı atam.
Sevən ailəni mən qoruyuram.

Girərək qəlbimə o şəfqət ilə,
Könlümü oxşayar məhəbbət ilə.

Səhv edib, dadsaydım dünyada əgər
Canları məhv edən acı bir zəhər,

Satardı ən əziz hər nəyi vardı,
O zəhri məhv edən dərman alardı.

O, can sərf edərdi hər istəyimə,
Əgər quş südü də istəsəm, yenə,

Hansı yolla olsa tapardı, inan;
O mənə canını edərdi qurban.

Bəslədi, can quşum pərvaza gəldi,
Onun danəsindən yeyib yüksəldi.

O bir soltan kimi əmr verərkən,
Quş kimi hazırdım qulluğunda mən.

13

## ANAMIN TƏRİFİ

Gər olmasaydı ana zəhməti,
Qazana bilməzdim heç bu şöhrəti.

Mənalar anası, o qoca qarı,
Rabiədir ki, yox tayı, oxşarı.

Rabiə söyləmək səhv olar ona,
O, bir Rabiəydi göy qızlarına.

O, hikmət evində bir baş hərəmdi,
İsmət aləmində çox möhtərəmdi.

Adına Məryəm tək yapışmaz böhtan,
Zəhraya oxşardı verərkən ehsan.

Beşgünlük dünyada eyşi unutdu,
Məryəm tək beşaylıq bir oruc tutdu.

Nəsturi qızıydı, möbədilərdən,
O, islam dininə gəlsə də, həmən –

Atəşpərəstliyə etmişdi vərdiş.
Qılardı daima oda pərəstiş.

Bu torpaq onunla gələrdi cana,
O bir Filakusdu, gəldi cahana.

Myastu yolunda əyləşərdi şad,
Siruni dilini bilirdi azad.

Belə qət etmişdi ağlı, ilhamı –
Ki, qəbul eyləsin dini-islamı.

Bir gün İncildən üz döndərən zaman
Onu cəlb etmişdi özünə Quran.

O, Züleyxa kimi bir xanım ikən,
Sonra Yusif kimi qul oldu birdən.

Hüsndə olmuşdur bir Rum gözəli,
Onu bəsləmişdi Nəcaşin əli.

Əzəl bağçasına vermişdi ürək,
Hüda pərdəsində o bəslənərək.

Quranı görəndə deyib: "la ilah",
Xaçdan və İncildən etmişdi ikrah.

Xaça kəsildikcə o belə düşmən,
Xaç kimi, o, çarpaz olmuşdur həmən.

İsayə daima min dua etdi,
Xəlilin yoluyla inamla getdi.

Oyaqdır, yatmayır əsla bir gecə,
İbadət eyləyir dan sökülüncə.

Bu dinə qəlbində etiqad, inam,
Pərvini bir təsbeh çevirər anam.

Sufi tək paklıqda qazanmışdır ad,
Sonsuzdur ondakı inam, etiqad.

Eşqilə yaşayıb əbədiyyətin,
Əzəl möhrü ilə kəsmişdir kəbin.

Yandırmaq istərkən qəlbimdə çıraq
Qəlbini mum etdi, sözlərini yağ.

Zəfər çalmaq üçün, bunu da deyim,
Mənə sübh oxundan tikmişdi geyim.

Onun ruzisilə xoş olar halım,
Onun duasilə gülər iqbalım.

Onun hər sözündən alıram qüvvət;
Qəlbini mum etdi, verdi nəsihət.

Düşmən tənəsilə kəsilsə yolum,
O zəif qarıdan güc alar qolum.

Onun duaları olmasaydı, ah!
Ömrüm puç olardı, yəqin, bir sabah.

Onunla fəxr edir şirvanlı olan;
Odur bu torpağa məni bağlayan.

Üveys tək onunçün burada qaldım,
Özümü min dərdə, bəlayə saldım.

Onun haqqı çoxdur boynumda, bişək
Boynumda əmimin haqqı olan tək.

14

ÖZÜM HAQQINDA

Bir aşpaz qızıydı sevimli anam,
Odur ki, hər kəsi mən doydururam.

Hikmət xəzinəsi öz məskənimdir,
Onunçün, məclisdə baş yer mənimdir.

Deyiləm zahiri gözəl bir çinar,
Nemət mətbəxiyəm, içimdə od var.

Yeriyib mətbəxə hər an girərkən,
Yuyaram səqfini saf su ilə mən.

Qazanım doludur, qaynar hər zaman,
Görməmiş kasamı sınmış, bir insan.

Yuya mətbəximi adlı-sanlılar,
Daima əlləri bal-yağla oynar.

Beyin qazanımda bişəndə hisslər
Dolar nemət ilə bütün məclislər.

Mənim mətbəximdən dad almaq üçün
Günəş də can atıb, dolanır hər gün.

Mənim mətbəximdən çıxırkən tüstü,
Göylərdə ənbərə dönər əlüstü.

O Məryəm sifətli gözəllər ki, var.
Mənim xörəyimlə iftar açarlar.

Mədhdə, həcvdə təbim dəryadır,
Zaman süfrəsində sözüm halvadır.

Şerimi bir karvan əhli görcəyin,
Deyər zəfəranlı plovdur yəqin.

Ruhla gəlir mənim plovum dada,
Ucaldır insanı, ruh vardır onda.

Yağlı sözlərimlə dolmuşdur cahan,
Mavi bir kasaya oxşar asiman.

Çoxdandır bu kasa gəzdirən fələk
Mənim ilhamımdan pay alır, gerçək.

Bu vəfasız aləm hər səhər-axşam –
Məndən loğma alıb, dolanır müdam.

Mənim təbim geniş süfrə açırkən,
Ondan bəhrələnir hər yerdə insan.

Sözümün şərbəti bir saf şərabdır;
Sufilər içərsə onu, səvabdı.

Xasların qəlbini sözlərim açar;
Hər beytim şam kimi, yanıb nur saçar.

Həyat süfrəsini bəzəyim, deyə –
Mən təzə yeməklər etdim hədiyyə.

Xörəyim dostlara şirin-şəkərdir,
Lakin paxıl üçün zəqqum-zəhərdir.

15

ƏMİM HAQQINDA

Mən təbib əmimdən almışam ilham,
Odur, söz mülkünün bir Bokratıyam.

Ağlım pay almışdır min bir dənizdən,
Tanışam hər otla Qaf dağında mən.

Bil, Avə dağının Musası mənəm,
İndi bu aləmin İsası mənəm;

Odur ki, məskənim olmuş asiman,
Dördüncü göyümdür mənim bu Şirvan.

Cənnətdə nə meyvə yemişsə Adəm,
Tumunu təbimə sancmışdır möhkəm.

O şadlıq gətirən tumlar ucundan –
Sözlərim olmuşdur hər dərdə dərman.

Qəlbim Hindistandır, ilhamım Çindir,
O nadir dərmanlar canda bəslənir.

Təzələsəm nə vaxt şirin sözləri,
Paxıl adamların çıxar gözləri.

Kim belə bir dərman hazırlasa, bil,
Ona can evində verilər mənzil.

Sözüm ki, dərmandır bir xəstə cana,
Taundan betərdir dargöz insana.

Mən haqq yolçusuna yol göstərənəm,
Düşmənin canına qızdırma mənəm.

Mənim nəfəsimin möcüzəsindən
Yüz min qızdırmalı sağalar həmən.

Sözümün şəhdini içdikcə Şirvan
Coşur damarlarda qızıl kimi qan.

Dərman qayırmağı sanki peyğəmbər –
Eyləmiş əzəldən mənə müyəssər.

Əlilə yaratdı kövsərdən dərman,
Mən Rəfrəf satıram, açmışam dükan.

O, dərman verərdi xəstə insana,
O, İsa kimidir, ruh verər cana.

Mənim düşmənimə yağdırar lənət,
Belə dosta olsun yüz dəfə rəhmət.

Ağlı naqis olan bir neçə cahil –
Belə söhbətlərdən qafildi, qafil.

16

ƏMİM KAFİYƏDDİN
ÖMƏR İBN-OSMANIN TƏRİFİ

Ömər ibn-Osman sayəsində mən
Yetimlik divinin qaçdım əlindən.

Odur, bil, böyüyüm, yolgöstərənim,
Tərbiyə verənim – əmimdir mənim.

Sözü həndəsə tək dəqiqdir onun,
Şagirdi Ərəstu, bir də Əflatun.

Hermesə üçbucaq elmini zaman –
Onun idrakilə öyrətmiş inan!

Əmimdən almışam zəkanı mən pay,
Günəşdən nur alar torpaqla su, ay,

Günəşdir rəng verən torpağa, daşa,
O, suyu qaldırar göyə birbaşa.

Günəş öz ipiylə, dolçayla həmən –
Su çəkir fələyin dənizlərindən.

Günəş qızıl əlli nəqqaşa bənzər,
Torpağı durmadan min rənglə bəzər.

Günəşin işığı altında ancaq
İncini su verər, qızılı torpaq.

Gördü ki, otağı dardır qəlbimin,
Açdı əmim ora pəncərə yüz min.

O, hər pəncərənin üstündə nurdan –
İplər toxumuşdur günəş tək haman.

Əzab quyusundan qurtarım, deyə –
Etmiş o ipləri mənə hədiyyə.

Əmim sayəsində başım oldu dik;
O, tək ədədimi etmişdir minlik.

Mən kiçik "dəqiqə" mislində ikən –
Böyük "dərəcəyə" çatdırdı həmən.

Göyün bürclərini gəzdirib bir-bir –
Ulduzlar içində mənə verdi yer.

Əvvəlcə birlikdən altmışa atdı,
Sonra da altmışdan otuz yaratdı.

İki on beş etdi otuzu da həm,
Onlardan yaratdı yeddi qat aləm.

Atam dözməyərək dərdə cahanda,
Sam Zalı atan tək, məni atanda.

Əmim simurq kimi uçub gələrək,
Qanadı altına alaraq, Zal tək,

Qaldırdı biliyin Qafına həmən,
Onun yuvasında bəslənmişəm mən.

Necə Məhəmmədə oldu əmi yar,
Oldu əmim mənə o cür pərəstar.

O məni öyrətdi, hər elmə, fənnə,
Oxutdu o, "Ələm-yəcidkə" mənə.

Atam mənə verdi elə bir cəza –
Ki, rəva görərdi ərəblər qıza.

Mən qaldım atılmış uşaq tək xəstə,
Nəfəsi tutulmuş, qəlbi şikəstə.

Əmim görüb bunu gəldi həycana,
Yenidən o məni gətirdi cana.

Sanki oldu mənim mehriban dayəm,
Yaralı könlümə o qoydu məlhəm.

O səkkiz behiştdən ətrafımda şad,
Yeddi heykəl qurdu sevimli ustad.

Aldı kainatdan yeddi dəmir mil,
Bir halqa boynuma etdi həmail.

Sudan və alovdan çıxıb boy atdım,
Yəni yeddi yaşa mən gəldim çatdım.

Baxaraq açılmış şirin dilimə,
Ağıl lövhəsini verdi əlimə.

Əvvəlcə o mənə öyrətdi "əbcəd",
Mənə "Həqayiqi" dedi nəhayət.

Mənə xətt öyrətdi hər səhər, axşam,
Gəldi arxasınca ayə və əhkam.

O bir müəllimdi, hikmətdi sözü,
Dərsdə xəlifəm də olmuşdu özü.

Öyrətdi lütf ilə hər məsələni,
Çatdırdı, nəhayət, "Vənnasə" məni.

Gördü ki, bələdəm hər nişanəyə,
Apardı bir böyük kitabxanəyə.

Gördükdə olmuşam doğrudan heyran,
Oxutdu əvvəlcə "Xələqəl insan".

Bunlarla bərabər qoydu bir sabah –
Qarşıma gözəl bir Kitabi-islah;

Əmr etdi oxuyum mən onu təkrar,
Ta gözüm önündə açılsın əsrar.

O mənə ustaddı, mən ona şagird,
O İbn-Vəriddi, mənsə Mübərrid.

Mənə dil qanunu öyrətdi əmim,
Qoymadı səhv edəm, oldu həmdəmim.

Xəyalla, ağılla, hiss ilə zinət –
Verərək təbir, qoymadı minnət.

O mənə şərh etdi hər bir məfhumu,
Mən ondan öyrəndim elmi-nücumu.

İkicə sübutla eylədi bir-bir –
O, Quranın on dörd sirrini təbir.

Üç əsas həriflə anlatdı mənə –
“Beş” nədir, “dörd” nədir, “üç”, “iki”, “bir” nə.

Sonra dörd kitaba saldıqda nəzər
Dörd ulusdan verdi ətraflı xəbər.

O dörd sütun oldu danılmaz sənəd,
Quranı onlara eylədi məsnəd.

Doğru yol göstərib o mənə hər dəm
Dedi: “Gör nə sirlə yaranmış aləm!”

Sirrini öyrəndim iki aləmin,
Bu işdə həmdərsi oldum Adəmin.

O mənim dayəmdi, müəllimimdi,
Həm böyük ustadım, həm də əmimdi.

Çatıb boya-başa mən şad olanda,
Məktəbdən, dərslərdən azad olanda,

Bar verən ağac tək açdıqda çiçək,
Həyatım bir bahar fəslinə gircək,

Min təsir alaraq sudan, günəşdən,
Rəngdə su, istidə bir od oldum mən.

Sonra dünya baxdı taleyimə kəm,
Dərd, ələm yaxamdan yapışdı möhkəm;

Kəsdi salxımımı qara oraqla –
Qəzavü qədərdən dərs alan Cövza.

Çox bəlalar gördüm mən ruzigardan,
Sanki baş qaldırdı bənövşə qardan.

Zəmanə bəxtimə yazırkən rəqəm,
Ağ lövhədə yazdı: “Nun vəlqələm”;

Baxdıqda bu “nun”a, bu “vəlqələmə”
Bir “Yasin” pilərdim dərdə, ələmə.

Gördü söz mülkünün hakimi mənəm,
Adıma söylədi “Həssani-əcəm”.

Qəlbimin ayağı xəznəyə batdı,
Ömrümsə iyirmi beş ilə çatdı.

Bildi söz mülkünə mənəm hökmran,
Əmim ölən zaman rahat verdi can.

Bu fani dünyanı bir gün tərk etdi,
Hardan gəlmişdisə, oraya getdi.

Bir göz qırpımında eylədi rəhlət,
Mələklər oxudu ona min rəhmət.

Qırx il bu dünyada o, subay qaldı,
Nəhayət, cənnətdə bir huri aldı.

Kim belə bir yara olarsa məftun,
Subaylıq çəkməyə haqqı var onun.

Ayrılıb getdikdə məndən o sərvər,
Aldı ətrafımı azğın düşmənlər.

İntiqam almaqçün fani dünyadan –
Adəm köçüb getdi, yaşadı şeytan.

## 17

## SƏFƏR TƏFSİLATI

Dövrün əmirinin fərmaniylə mən,
Nəhayət, qurtardım Şirvan bəndindən...

Səfərə çıxaraq, dağda, səhrada –
Sürüdüm özümü özüm piyada.

Şərvan dənizindən uzağa getdim,
Arzuma çatmaqçün İraqa getdim;

Qara dəniz qaldı mənim arxamda,
Səfidrud çayını keçdim bir anda.

Kuhistana çatıb gördüm, nəhayət,
Behişt bağları tək yeddi vilayət.

Torpağı İsaya tutiya verər,
Daşları Musaya kimiya verər.

Orada hər ilin dörd baharı var,
İki bayram görür gündə o diyar.

Onun hər tərəfi bir gülüstandır,
Nəzəri cəlb edən bağdır, bostandır.

Bir vaxt qarşı durub Xuzistana o,
İki zərbə vurub Hindistana o.

Torpağı çəməndir onun bahar, qış,
Çayların üstündən körpü salınmış...

Heyif, belə gözəl, cənnət kimi yer –
Cəhənnəm əhlinin əllərindədir.

Durar vəhşi kimi pusquda onlar,
Gündüz yatıb, gecə ova çıxarlar.

Quldurluqdan başqa məqsədləri yox,
İnsanlığa azca hörmətləri yox.

Yolun kənarına çıxıb səhərlər,
Guya qonaqları qəbul edərlər;

Lakin o hiyləgər tülkülər hər an –
Pusquda duraraq, güdürlər karvan.

Əvvəl yol göstərib karvana onlar,
Sonra da yolunu kəsib soyurlar.

Üzdən gülsələr də, dişləri qanlı,
Zöhhak ağızlıdır, əjdaha kamlı.

Od üstündə bişmiş bir yumurta tək,
Sərtdir onlardakı duyğusuz ürək.

Onlar bir heyvandır, insan deyil, yox,
Tufanlı dəniz tək qəzəblidir çox.

Onlarçün nə din var, nə də ki, dinar,
Nə fəryad eşidər, nə aman qanar.

Orda oğrularla dostdur darğalar,
Hərənin yüz dili, min peşəsi var.

Yaman naəhl olur o yerin əhli;
Həm oddur, həm sudur onların dili.

Bəla rəngi vurur boyaqçılar da,
Odur ki, qaradır adamlar orda.

Samirilər kimi, danışan zaman,
Od-alov tökülür ağızlarından.

Çörəkçiləri də yaman xəsisdir,
Bir mələk cildinə girmiş iblisdir.

Gecə adam yeyər orda aşpazlar,
Gündüz İsa ilə oturub-durar.

Quldurlar yol kəsib minbir can alır,
Boyaqçılıq üçün qızıl qan alır.

Dövlət adamları canidir tamam,
Rüşvətlə dolanır hakimlər müdam.

Dərziləri üzdən çox gülər olur,
Lakin xəsis olur, hiyləgər olur.

Qərəz... canilərdən tez ayrılaraq
Getdim, özlərinə qaldı bağça, bağ.

18

## CƏMALƏDDİN MUSİLİ İLƏ GÖRÜŞ VƏ ONUNLA SÖHBƏT

O söz həkiminə oxuduqca mən,
Bəyəndi şerimi təmiz ürəkdən.

O, sədəf ağzından səpdikcə gövhər,
Elə bil dolurdu dürlə dənizlər.

Həmişə çıxsa da dürlər dənizdən,
Neçə dürr dənizi yaratdı sözdən.

Dedi: soruşuram, mənə söylə bir –
Əslən haralısan, de, ismin nədir?

Dedim: tələbəyəm, həm də sözbilən,
Şərvan şəhərində doğulmuşam mən.

Xəlilüllah olmuş dövründə atam,
Deməli, əslində xarrat oğluyam.

Bəla kahasında xeyli oturdum,
Zəka barmağımı illərlə sordum.

Dedi: necə gəlib çıxdın İraqa?
Nə üçün gəlmişsən bizim torpağa?

Dedim: oralara qıtlıq od vurdu,
Çörəyi şirindi, suları şordu;

Füsunkar olsa da təbiəti çox,
Lakin ağır keçir vəziyyəti çox.

Orada lal axır sərin bulaqlar,
Yanır, od püskürür hər yana dağlar.

Gərdişin əlilə o gözəl yerlər –
Cəhənnəmə dönmüş indi sərbəsər.

Şəhərin üstündə ucalır vulkan,
Orada neyləsin aqil bir insan?

Oradan ki, məni nəzər didirdi,
İqbalım İraqa çəkib gətirdi.

Sən şaha bildir ki, bu qərib axşam –
Onun dərgahına gəlib çıxmışam.

Məni qəbul etsin, minnət et şaha,
Doğru bir yol göstər o barigaha.

Dedi: natamamsan, bil ki, hələ sən;
Qayıt, o məqama layiq deyilsən.

"Mənəm, mənəm" deyib, öymə özünü,
Həmişə müxtəsər eylə sözünü.

Cahildir özünü tərif edənlər;
"Çox bilirəm" demə, bilsən də əgər.

Boş söz insanların abrını tökür,
Yalan şirlərin də bağrını sökür.

Uzunçuluq igid adamların da,
Bir dəfə dadına çatmamış darda.

Məntiqsiz, dəlilsiz yalan danışmaq –
Nadan adamların işidir ancaq.

Əgər tavus kimi özünü öysən,
Xəcalət çəkərsən tavus kimi sən.

Görsə də əksini tuti aynada,
Özünü tanıya bilməz dünyada.

Lakin öz-özünü görməyən zaman –
Daha da həvəslə danışar, inan.

Tərif xoşlasa da əgər bizim şah,
Bir söz sərrafdır, yaxşı ol agah!

Fəzilət xələti saralmaz, solmaz,
Hər yeniyetməyə o qismət olmaz.

Çoxu şərbət içər ədalətindən,
Heyif ki, qədrini bilməz hər yetən.

Dəryanın yanında bir damla nədir?
Sən heç, şahsa zəngin bir xəzinədir.

Bağlı xəzinəyə əlini atma!
Yatmış əjdahanı, gözlə, oyatma!

Az-az təvazölə danış sözünü,
Döşünə döyüb də öymə özünü.

Ustad qabağında əlibağlı dur,
Körpə uşaq kimi dilibağlı dur!

Hər kim acı dilli olsa, bil bunu,
Şahın qapısına qoymazlar onu.

Dil gülünc etməsin deyə insanı, –
İnsan ağzı olmuş dilin zindanı.

Bəzən dil siyrilmiş qılınca bənzər,
Ayıq ol, başını bədəndən üzər.

Can cəhənnəminə qapıçıdır dil,
Dilsizlik behiştin açarıdır, bil!

Balıq dilsizlikdə tapdı gücünü,
Tutdu göy üzündə Balıq bürcünü.

İlan haçadilli olduğu üçün,
Cənnətdən əzabla qovuldu bir gün.

Canını saxlamaq istəsən əgər,
Çalış ki, dilini saxla birtəhər.

Buradan tezliklə qayıt, birbaşa –
Get, öz doğulduğun torpaqda yaşa.

Məktəbdə elm oxu, fənn öyrən, dərs al,
Hər nə oxumusan, bir-bir yada sal.

Əcəmi olduğun yetər, indi sən –
Get, otur, bir az da ərəbcə öyrən!

Oğul, hələ xamsan, püxtə ol əvvəl,
Kamal məqamına çat, İraqa gəl!

– Uzaqdan gəlmişəm, – dedim, – axı mən,
Əliboş qayıdım geri dönərkən?

Nə aparım burdan sovqatdır deyə,
Qəhətlik içində qalmış ölkəyə?

Xacədən nə aldın? – deyə qonşular –
Sorsalar, cavabım mənim nə olar?

Dedi ki: Al durma, qayıt vətənə,
Apar bu üzüyü, töhfədir sənə.

Üzüyü verirəm, lakin sən gərək –
Qoruyasan onu göz bəbəyin tək.

Bu üzüyün qaşı bahadır, düzü,
Cəmin gövhəridir, Cəmşidin gözü.

Dünyada nə qədər yanındadır bu –
Səninçün heç şeyin yoxdur qorxusu.

Bunun üzərində müqəddəs adlar, –
Həm də mayəsində şəfa sehri var.

Bu üzük zidd olmuş hər Əhrimənə,
Cəmşiddən yadigar qalmışdır mənə.

Şirvanda qəhətlik güclənsə əgər,
O bəladən səni bu xilas edər.

Bu bir dövlətdir ki, çalış onu sən,
Heç zaman, heç yerdə vermə əlindən.

Bu üzüklə Cəmşid – comərdəm, – deyə
Padişahlıq etdi yeddi ölkəyə.

Saxlaya bilməsən ömrün uzunu,
Barı şərəfləndir ölkəndə bunu!

Şərbət möhrəsidir, zəhri tanıdar,
Əlində hər zaman olar bir meyar.

Yəqin çox olacaq gəlib istəyən,
Ancaq bir adama bağışlama sən.

Üzüyün üstünə bu sözləri yaz:
“Kimsəyə satılmaz, bağışlanılmaz!”

Qorxuram əlinə üzük keçəndə
Bilməyəsən onun qədrini sən də”, –

Deyib, üzüyünü verərkən mənə,
Üzüyə bənzədim onun önündə.

Canına dualar etməklə, həmən
Təşəkkür söylədim yüz yol ürəkdən.

Onun qulluğunda öpərək yeri,
Sədi-əkbər kimi qayıtdım geri.

Gördüm ki, taleyim sevindi haqdan,
Şadlıqla, fərəhlə döndüm İraqdan.

Keçdim Kuhistanın sərhədlərini,
Yenə də Şərvanın gördüm şərini.

Gördüm ki, adamlar tapdıqca fürsət,
Mənim üzüyümdən açırlar söhbət.

Danışdı üzüyün görən-görməyən,
Əfsunlu, sehrli möcüzlərindən...

Şöhrəti yayıldı bütün hər yana,
Yetişdi bu xəbər böyük xaqana.

O, qasid göndərib dərhal yanıma,
Qara-qorxu saldı mənim canıma.

Dedi: “Razı qalsam töhfədən əgər,
Bu sənə şərəfdir, üzüyü göndər;

Canın mayəsidir üzük, yaxşı bil,
Dustağın olmağa o layiq deyil!

Barmaqların ona layiqdir məgər?
Sənə dəmir üzük kifayət edər.

Cəmşid üzüyünü etmə oyuncaq,
Min bəla gətirər başına ancaq".

Dedim ki: "Şahımız insaflı şahdır,
Belə bir rəftarı böyük günahdır.

Ədalət axtarar, deyirlər, şahlar,
Zülmkar olarsa şahlar, az yaşar.

Ədlin mühəndisi qurmasaydı bəs,
Qərar tutardımı bu mavi günbəz?"

Şah dedi: "Üzüyü gətir sat mənə,
Əvəzində şəhər bəxş edim sənə".

Dedim: "Hədiyyədir, bunu satmaram,
Günəşin üzünə palçıq atmaram.

Dünyanın kimyası verilsə mənə,
Sənə bu üzüyü satmaram yenə".

Barmağıma taxıb gəzəndə hərdən
Sanki aya qədər ucalıram mən.

O Xızrın gördüyü dərin dəryalar
Üzüyün yanında bir damla olar.

Mən dırnaq tutarkən onu fələklər
İşıqdan doğan bir hilal zənn edər.

Səmada günəş də qibtə edərək,
Deyirdi: – Bu üzük qütb olsun gərək.

Üzüm saralanda, qəlbim sınanda,
Mən qüvvət alardım ondan hər anda.

Bəzən əmmamənin düyünündə mən,
Ya da ki, cibimin küncündə bəzən,

Gəzdirər... bir sirr tək üstünü örtər,
Gizlin saxlayardım onu birtəhər.

Alçaq adamların qorxusundan mən
Gizlədərdim evdə, bir küncdə bəzən.

Uzaqda olsaydım üzük qaşından,
Bir ağrı qalxardı sanki başımdan.

Ağıl sərhədini xəyal şeytanı –
Yaranda coşardı qeyzim ümmanı.

Tuğan şaha tərəf çəkərdi hirsim.
Təkin şah tərəfə cumardı nəfsim.

Biri deyir: – Xaslar məclisinə get.
Birisi deyərdi: – Şahı tərif et!

Mənsə, bu döşəmə üstə oturdum,
Nə irəli getdim, nə geri durdum.

Lakin möhtac qalıb çörəyə bəzən,
Öydüm hər alçağın süfrəsini mən.

Bəzi məclislərdə çox utanmışam,
Qızıl tək torpaqda tapdalanmışam...

Gah şadlıq anında düşdüm bəlaya,
Maral tək tuş oldum bir əjdahaya.

Namərdlər bəzmində oldum piyalə,
Dolandım əzabla hey əldən-ələ.

Şadlıq məclisinin bir adəti var:
Camı dolu alıb, boş qaytararlar...

Deyən, könül camım sınmamış hələ,
Heyif çox gəzəcək hey əldən-ələ.

Madam ki, cami-Cəm olmadın, de bir,
Adi cama dönmək ar deyilmidir?

Bir gecə dalmışdım dərin xəyala,
Fikirdən şişmişdi başım az qala.

Ağlım qulağımdan yapışdı birdən,
Vəhdət aləminə götürdü yerdən.

Qoydum bir əlimi ağlın çiyninə,
Bir əllə yapışdım əsayi-dinə.

Onların köməyi çox oldu, əlbət,
Gəlib doğru yola düşdüm, nəhayət.

Yeddiqat gözümdə tez işıqlandı,
Doqquzqat elə bil alışdı, yandı.

Gözümü dünyaya açırkən səhər,
Al-əlvan don geymiş gördüm üfüqlər.

Bir gözəl baxışı, bir aşiq ahı –
Duydum, seyr edəndə gülən sabahı.

Gördüm bir ağ çadır qalxdı göylərə,
Odlu iplərisə sallandı yerə.

Bir qızartı tutdu göyləri bütün,
Ay da şəfəqinə büründü sübhün.

Füsunkar bir lövhə yaratdı səhər,
Bürüdü ətrafı müxtəlif səslər.

Açılan səhərin bu ülviyyəti –
Seyr ilə fəth etdim əbədiyyəti.

Qırx səhərdə nələr görmüşsə Adəm,
Tək bircə səhərdə gördüm onu mən.

Səhərin bayrağı yüksələn zaman,
Birdən daxil oldu Xızr qapımdan.

Məni görən kimi, gülümsəyərək –
Açıldı siması tazə qönçə tək.

Söhbətə başladı, yarımhilalı –
Açılar-açılmaz mən oldum halı.

O yarımhilalı şölə saçırkən,
Bir günəş doğurdu, inan, hər sözdən.

Günəşi andıran parlaq sədəflə –
Otuz iki ulduz parladı səflə.

Oturdu görüşə gələnlər kimi,
Danışdı, hər sözü bir gövhər kimi.

O gördü bir çöpə dönmüş bədənim,
Yaralı ürəyim yorğundur mənim.

Danışdı, başımdan ağrını aldı,
Ağrını dərdin öz başına saldı.

Sözləri gülab tək, hind kafuru tək –
Başıma, üzümə səpələnərək,

O gülab, o kafur, çəkmədi bir an,
Bütün ağrıları aldı canımdan.

Bu hörmətə əvəz düşündüm, ancaq,
Mən ona nə verim töhfə olaraq?

Dilləndi qeybdən ağlımın səsi,
Xızrın odlu sözü, isti nəfəsi,

Şəfa verdi, dərhal sən gəldin cana,
Xacənin üzüyü layiqdir ona, –

Deyərək, üzüyü gətirdim həmən,
Öpüb qarşısına qoydum onun mən.

Qiymətli peşkəşi süzüb diqqətlə,
Heyran qalıb ona, dedi heyrətlə:

“– Cəmşidin möcüzü sənin əlinə,
Haradan keçmişdir? Agah etsənə!”

Dedim ki: “İraqa yolum düşərkən,
Böyük xacə ilə tanış oldum mən.

Doğru yol göstərdi, ülfət bağladı;
Bu üzüyü o mənə bağışladı”.

O da öz səxavət əlini açdı,
Bir üzük çıxardı, nur, şölə saçdı...

Alıb üzüyümün qoydu üstünə,
Töhfəmi özümə qaytardı yenə.

Dedi: “Sağ əlinə tax bunu ancaq,
Digərini isə sol əlinə tax.

Hifz edər bəladan səni hər zaman,
Bunun biri sağdan, digəri soldan...”

Daha sonra dedi: – “Burada dünən,
Qəlbi saf adamlar məclisində mən

Qonaqdım, onlarla dağlara getdim,
Neçə mərd adamla mən söhbət etdim.

Keçdi məclisimiz şirin, səmimi,
O mehriban tayfa bir ipək kimi.

Çox incə, çox zərif şeirlərindən
Ləzzət apardılar, duydum bunu mən.

Şerini həycanla oxuyub onlar,
Böyük maraq ilə soruşurdular:

“ – Görən haralıdır bu söz ustadı?
Necədir elində şöhrəti, adı?”.

Dedim: “ – Şirvanlıdır, adı – Xaqani,
Yayılıb şöhrəti tutub hər yanı.

Sözün sərrafıdır, bir dahidir o,
Biliyin, atəşin məddahıdır o”.

Mən sənin haqqında danışdım, qərəz...
Ağıllı adamlar dedilər ki, bəs –

Belə məharətlə, dərin alimi,
Bunca alçaq tutmaq eyib deyilmi?

Belə bir ustadın, o kor xəbislər
Qədr-qiymətini bilərmi məgər?

Mənə üz tutaraq dedilər belə:
“Ey Xızr, get ona nəsihət elə.

Yar ol sənətkara ömrü uzunu,
Xətadan, bəladan sən qoru onu”.

Nəcib insanları dinləyib, haman
Yanına yollanıb, gəldim uzaqdan.

İndi sözlərimi yaxşı dinlə gəl,
Qalsın xatirində bunlar mükəmməl;

Qulaq as! Sənə bir nəsihətim var;
Etibarsız olur bal rəngli ruzgar.

Durma kölgəsində ikirənglinin,
Olma heç nəhəngin felinə əmin.

Baxma nə rənginə, nə də iyinə,
Axşamın, səhərin gözəlliyinə.

Kişinin bəzəyi silahdır, inan,
Arvadın bəzəyi ənliklə, kirşan.

Yeddi min ildirsə yaşı Adəmin,
Birgünlük görünsün gözündə sənin!..”

Belə nəsihətlər verdikcə mənə,
Döndü rəngim sarı qızıl rənginə.

Fürsəti qənimət bilincə, dərhal,
Utana-utana elədim sual:

“ – Ey mələk sifətli, mənə söylə bir,
Deyirsən bu dünya bal rəngindədir.

Dünya həm ucadır, həm də ki, alçaq,
Bu dünya nə zaman, de, məhv olacaq?

De, yazıq insanlar nə zəmanədək –
Ümidlə, qorxuyla ömür sürəcək?

Odlu körpülərdən keçmək olarmı?
Yoxsa ki, odlarda yanacaq hamı?

Beş hissin əlindən – dünya torundan
Qurtulmaq mümkünmü bizlərə bir an?

Başımız üstündə bu yüksək çətir,
Qara, əyri tağlı bu səhnə nədir?

Bu çevrə nə zaman bir qərar tutar?
Bu nöqtə nə zaman yerindən qopar?

Necədir o yanı xətt-üstüvanın?
Kimdir sakinləri bəs o dünyanın?..”

Dalbadal suallar verdim mən ona,
Suallar gəlmədi əsla xoşuna.

Dedi: “ – Çox aşikar görürəm ki, mən
Əhrimən sədası qopur qəlbindən.

Bağlayıb dünyaya xəyallar səni,
Halın xatırladır yeniyetməni.

Heç belə danışmaz arif olanlar,
Sənin sözlərində müxalifət var.

De, nə vaxta qədər sən belə heyran,
Çürük fəlsəfədən dəm vuracaqsan?

Əslinə baxanda “fəlsəfə” sözü
“Səfeh” kəlməsinə yaxındır, düzü;

Ayrı bir mənası olmamış dərin,
Quranın, danılmaz bu hədislərin.

Qabağında, yəqin, anlayır hər kəs,
Yunan fəlsəfəsi bir yuna dəyməz.

Vaz keç bu fikirdən, heç bənd olma sən,
Bir fülus yaxşıdır min fəlsəfədən.

Kəbəyə üz çevir, boş şeydən əl çək;
Altıüzlü olma nərdin zəri tək!

Bir məna kəsb eylə, məzmunsuz qalma,
Hübab günbəzi tək içi boş olma!

İkiüzlü olma! Başsız, bədənsiz,
Dəf kimi içi boş, üzü tərtəmiz.

Şirin öpüş kimi bir an xoş gələn –
Bəhrəsiz işlərlə məşğul olma sən!

Özünə dayaq et həmişə dini,
Böyük sanma yunan Uqlidisini.

Dərs olmasın ucuz sözləri sənə,
Aldanma mənasız şəkillərinə.

Sən sünbülə tapşır çox dil tökməyi,
Hörümçək həndəsi olduğu üçün,

Hörümçək həndəsi olduğu üçün,
Yediyi-içdiyi haramdır hər gün.

Şəriət haqqında mənə ver sual,
Möminlər haqqında ancaq xəbər al!

Başına əhli-din papağı qoysan,
Papaq istəməzsən xaqandan, şahdan.

Papaqsız qalsan da, dərd çəkmə yenə,
Papaqsızlıq özü papaqdır sənə.

Papaqsız qalanın hər şeyi vardır,
Hər iki dünyada o, hökmdardır.

Şöhrət papağına yoxdur etibar;
Onu itirənlər olur zəlil, xar...

Nə işlər törədir, yaxşı bax, cahan,
Cəmşid qul olmuşdur, divsə hökmran.

Hər zaman dəyişir hökmü dövranın,
Dünya tuluğudur su parlayanın.

Quruyub yapışar, boş qalsa əgər;
Doldumu, şişərək partlamaq istər...

Bəlkə ruzi tapdım, deyə, bir qarın,
Sən nə vaxta qədər bu alçaqların,

Bərəkətsiz olan süfrələrindən –
Çörək qırıntısı döşürəcəksən?

Gedib hər qapıda olmasan köpək,
Fikrin əyri olmaz it quyruğu tək.

İş adamı deyil naəhl olanlar,
Onlarda bir çirkin it xisləti var.

Qaç, bu dinsizlərin qulluğundan, qaç,
Haqqın qapısını ehtiramla aç!

Şər dolu qapıdan uzaqlaş daha,
Xaqani, get sığın vahid Allaha!

19

ƏRZİN FƏZİLƏTİ HAQQINDA

Çox səfər eylədin, əl çək göylərdən,
Bir az da gəz, dolaş bu yerləri sən.

Gər öz meylini bağlasan yerə,
Artar şərafətin birə min kərə.

Piyadan keçdimi yeddi xanəni,
Udmaq çətin olar, çox güman, səni.

Sədəfçin qətrələr göylərdən enir,
Mirvari gəzməklə qiymətə minir.

Xüsusən, səyahət, dünyanı gəzmək –
Böyük adamlara olmuşdur bəzək.

Qəza pərgarını açdı eninə,
Qoydu ilk nöqtəni yer üzərinə.

Xətt olur nöqtələr cəmlənsə bir-bir,
Kainat torpaqla şərafətlənir.

Torpaq cövhəridir bu kainatın,
Torpaq xəznəsidir cəvahiratın.

Dünyanın beşiyi olmuş bu torpaq,
Torpaqdan doğulmuş mənalar ancaq.

Yer göydən əzizdir, bahadır, baha,
Çünki bu torpaqda yatır Mustafa.

Bəzi təqlidçilər pıçıldayaraq,
Dedilər: "Aləmdə məhşər qopacaq,

Otuz ildən sonra baş verib bir sirr,
İyirmi bir bəla törəyəcəkdir.

Fəlakət qopacaq, bütün bu cahan,
Alt-üst olacaqdır küləkdən, sudan.

Üfüqdə hərəkət edən ulduzlar
Böyük bir qəzaya olacaq düçar.

Onlar səyyarələr içində tək-tək –
Dolaşıb, üçbucaq təşkil edərək, –

Tərəzi bürcündə birləşən zaman,
Böyük fəlakətə düşəcək cahan.

Üz verən zamanda həmin fəlakət
Yerə toxunacaq ağır xəsarət".

Lakin qorxu bilməz əsla, heç zaman –
Bu məddah Xaqani, qopsa da tufan.

Kimin sənin kimi bir arxası var, –
Heç vecinə gəlməz bu uydurmalar.

Xaqani inanmır bu yalanlara,
Gülür bu yalanı uyduranlara.

Çünki əlindədir bütün ixtiyar,
İstəsən, bəlalar bizlərdən qaçar.

Sənin bəndələrin çox olar onda,
Göydəki hesabsız ulduzlardan da.

Bəladan hifs olsun dövlətin, varın,
Bütün qurduqların, yaratdıqların.

20

## PEYĞƏMBƏRDƏN KÖMƏK UMMAQ HAQQINDA

Ey eyb ilə qeybi dərindən bilən,
Eyblər açılar sənin əqlindən.

Könlümdə yara var, özün qıl çara,
Qoyma mən qərq olum müdhiş sulara.

Zalimlər əlindən halım yamandır,
Sən, ey dadixahım, rəhm et, amandır!

Olmuşlar məndəki hünərə düşmən,
Köməyim sən olsan xof etmərəm mən.

Verirlər qəlbimə cəfa, əziyyət,
Qəbulun dərdimə şəfadır, əlbət...

Başıma bir əl çək, görsün gözlərim,
Aləmə yayılsın inci sözlərim.

Eyləsən lütfünlə mənə bir kömək,
Nə insan qorxudar məni, nə fələk.

Əlinə kim Gavə bayrağı alsa,
O iki ilandan xof etməz əsla.

Bir müddət bir loğma çörəkçün mən də
Dişimi sındırdım nakəs önündə.

Könlümü verdikdə sənə, nəhayət,
Dişlərim zərbədən qaldı səlamət.

Eşqin məni saldı haqqın rahına,
Apardı qənaət barigahına.

Həyatım devlərin içində soldu,
İyirmi iki il ömrüm puç oldu.

Elə ki, özümü qapına saldım,
O itən ömrümü geriyə aldım.

Qurtardım tamahın hər əməlindən,
Qəhətlik əlindən, vəba əlindən.

Sirlər yuvasından uçan bir quşam,
Mən sənin qapına gəlib qonmuşam.

Öyrəşib bu ali xislətinə mən,
Sənin qəfəsini eylədim məskən;

Hər yerə uçsam da mən birnəfəsə
Yenə qayıdaram bu xoş qəfəsə.

Deyiləm yırtıcı, vəhşi qırğı tək
Ki, sinə yırtaraq çıxardam ürək.

Nə kəklik ardınca gəzən qarğayam,
Hər yerə baş vurub axtaram təam.

Yaxşıdır, göyərçin balası kimi,
Anamın ağzından alım yemimi.

Tuti tək söz alıb özgə dilindən,
Bubbu tək sirləri axtarmaram mən.

Sığırçın olsam da, bir milçək belə,
İncimәmiş mәnim әlimdәn hәlә.

Bülbül tәk olsa da çox gözәl sәsim,
Mәni ayaqlara salmadı nәfsim.

Bayquş tәk qalaram xәrabәlәrdә,
Gözüm nakәslәri görmәsin bir dә.

Bir tavus yarandım haqqın bağında,
Simurğәm mәn dinin o Qaf dağında.

Ey behişt ağası, sәnin süfrәndәn,
Bir hüma olub da sümük yedim mәn.

Daha mәn çörәkçün, yaşamaq üçün,
Haçadil deyilәm indi büsbütün.

İndi qılınc kimi kәskin dilim var,
Qılınc siyrilәndә kәsәrli olar.

Əvvәllәr dilim bir dәmir kimiydi,
Cәlalın yağladı dәmiri indi.

Sәndәki iqbalın sayәsindә, bax,
Mәnim dәmirimdәn tökülmәkdә yağ.

Yeddiqat fәlәkdә yanan ulduzlar,
Yanmaqçün dilimdәn yağı borc alar.

İlhamım yalanla xarab olmuşdu,
O, civә rәngindә sәrab olmuşdu.

İndi hәr sözümdә bir hәqiqәt var,
O – güzgü, mәhәk tәk olmuşdur meyar.

Mәdh ilә özümü etmәrәm bәdnam,
Göstәrmәz doğrunu әyri bu aynam.

Əvvəllər olmadı şerim mədhsiz,
Onunçün olmuşdu dilim natəmiz.

Qurtarmaq üçün bu natəmizlikdən
Yuyuram ağzımı göz yaşımla mən.

Qəlbə təsir etsə əgər qüssə, qəm,
Odlu göz yaşları yağdırar o dəm.

Tale üz döndərib yıxsa hər kəsi,
Ondan uzaq qaçar hətta kölgəsi.

Ruzigarda vəfa görməmişəm mən,
O, vəfa göstərər bəlkə nüdrətən.

Fələyin nöqtəsiz olur zərləri,
O nərddə udmuşdur çox hərifləri.

Pəncü yek oynamış yenə də fələk
Ki, do-şeş atana hesablar do-yek.

Məni yaxşılıqla utandırmadan,
Pisliklə xəcalət edir hər zaman.

Acgöz bir qarışqa, dilsiz bir quşam,
Əsla qəfəs üçün doğulmamışam.

Bir quş caynağından ordu sınarmı?
Qarışqa gücüylə şəhr alınarmı?

Adətən arılar vızıldar, ancaq
İnsan arzularmı heç vızıldamaq?

Ayağıma zəncir vurubdur fələk,
Sancır hər halqası ilan ağzı tək.

Bu dəmir halqalar, dişsiz ağızlar,
Necə ki, ağızsız, dişli bir mişar.

Doğrayar meyvəli, göy budaqları,
Bax, eləcə kəsir bu ayaqları.

Bir dəmir həlqədir, yoxsa ac köpək?
Qapır baldırımı qudurmuş it tək.

Xaqani ahından duman yaratdı,
O duman yüksəlib, göylərə çatdı.

Fələyin pərdəsi yırtıldı bir baş,
Bütün sirləri faş olundu, faş.

Lakin iş bunlarla düzəlmir tamam,
Tək yaradan çəkir işlərə əncam.

Düşmən çox olsa da ölüm gerçəkdir,
Hamısı torpağa çevriləcəkdir.

21

KİTABIN YAZILMASI HAQQINDA

Ağır vəziyyətdən gələrkən cana,
Yazdım can şirəmlə tərif Şirvana.

Nə üçün mədh etdim onu, bilirsən?
Nə üçün bu yolun yolçusuyam mən?

Günəş məclisindən təbim, budur, bax, –
Nurlu bir cəvahir oğurlayaraq, –

Dedi: "Qiymətlidir, al bunu, saxla,
Qoy qəlbin nurlansın bu çilçıraqla".

Bürcis eşidərək, coşdu və əsdi,
Günəşin dibindən əlini kəsdi.

Dan yeri söküldü, açıldı səhər,
Al qana boyandı yanan üfüqlər.

Sonra günəş məndən aman istədi,
Dayanıb qarşımda təzimlə dedi:

“ – Ey Xaqani, həmin gövhəri yenə –
Qaytar öz yerinə, Allah eşqinə!”

Xacədən xəcalət çəkdimsə hər gün,
İraqa getməyim olmadı mümkün.

Qırx günə bu qədər cəvahiri mən
Qələmin ucuyla yona bilmişəm...

Cəvahirlər sapa düzülən zaman –
Onları günəşin asdım boynundan.

O boyunbağını mən asdım, bəli,
Çünki kəsilmişdi günəşin əli.

Ləli sahibinə qaytarsam əgər, –
O məndən, əlbəttə, qəbul eyləyər.

Oğurlanan şeylər, necə var, yenə –
Tezcə qaytarılsın gərək yerinə.

O məni salmadı bir an nəzərdən,
Mən də onun üçün dürdən, gövhərdən –

Boyunbağı düzdüm, xoşdur əməyim,
Rəvamı, mən ondan dəyər istəyim?

Kim “belə yazaram” desə əbəsdir;
Bu hədiyyəm Şama, İraqa bəsdir.

Haqqım var fəxr edəm, qoy bilsin əyyam:
Mən söz dünyasının hökmdarıyam!

Nə vaxt söz qılıncım qalxdı yuxarı,
Qolu kəsik qaçdı söz oğruları.

And olsun Əhmədə, dünyada heç kəs –
Bu inci sözləri yarada bilməz!

Əqlim məni dünya pənahı sandı,
Ruhum məni Allah məddahı sandı.

Ədaləti olsun qoy birə on qat,
Onun sayəsində düzəlsin həyat.

22

## ƏHVALIMDAN ŞİKAYƏT

Dinləyin, halımdan şikayətim var:
Bəla dənizinə məni atıblar.

Bu dibsiz dənizdə nə cür üzüm ki,
Əlsiz-ayaqsızam mən sədəf təki.

Fələk nə axtarır, bir yetim dürmü?
Yarır cərrah kimi sədəf köksümü.

Gah odda gümüş tək əriyirəm mən,
Gah civə oluram dərddən, ələmdən.

Ruzgarın gözündə mən bir ağ titə,
Məndən nə istəyir çopur ifritə?!

Nədir o ağ titə? Dövrün dərdləri.
Nədir o çopurluq? Şirvanın şəri.

Qanadları sınıq qartal kimiyəm,
Şər sınıq qanadda dağlar qədər qəm.

Paxıllar nə üçün bu qədər zalım?
Boğazımda qalıb fəryadım, ahım!

Dəyirman hərləyən öküz kimiyəm,
Meydanım – dar çevrə, özüm bəxti kəm.

Dəyirman öküzü dolanar, dönər,
Ona günəş belə zülmət görünər.

Axurda arpa var, yonca var demə,
Onun bağlı başı çatarmı yemə?

Quyudan çıxsam da sinəsi dağlı,
Qolum zəncirlidir, gözlərim bağlı.

Murada çatmağa hərçənd yol var,
Uzana bilərmi kəsilmiş qollar?!

Göz yaşım – sirişgim zirişgə bənzər,
Bəlkə damarımda qan yox, od gəzər.

Üzümə baxanda zirişg utanır,
Görür ki, ürəyim qovrulub yanır.

İşlərim dolaşıq, ürəyim sınıq,
Nalədən dilimdə söz qırıq-qırıq.

Belə bir tufanda sönməzmi çıraq?
Həm piltə nəzilib, həm tükənib yağ.

Bu zülmət dünyada gün görmədim mən,
Novruz bayramım da çıxdı əlimdən.

Tale təqvim kimi məni yaratdı,
Bir ili saxladı, bir ömrü atdı.

Bəli, il başında can verir təqvim,
Boş qalan kötüyü kim axtarar, kim?

Tarixçi heç ona məhəl də qoymaz,
Məhv olan həyatı bir kimsə duymaz.

Enər xəyal kimi göylərdən yerə,
Zay olub qoşular əsən yellərə.

Onu yarpaq-yarpaq cırarlar, ya da
Məktəbdən çıxarıb atarlar oda.

Tanrım and olsun, çərxin əlindən
O köhnəlmiş təqvim elə mənəm, mən!

Bir vəfa görmədim mən bu iqlimdə
Nə görmək? Heç onu eşitmədim də.

Yusif nələr çəkdi qardaşlarından,
Mən ondan yüz dəfə çox çəkdim, inan.

Mən dərdlər dağından dönmüşəm daşa,
Qatlaşa-qatlaşa qara, yağışa.

İşlər, əməllər ki, yolumu gözlər,
Burnuma tutulan tüstüyə bənzər.

Məna tutisiyəm, bilirmi kimsə,
Düşmüşəm Şirvanda dəmir qəfəsə.

Fələk qanadımı zəncirlədimi?
Kəsdi dimdiyimi, kəsdi dilimi.

Məni ayrı saldı hind şadlığımdan,
İlham günəşimi saraltdı zaman.

Zəqqum yedizdirdi qənd əvəzinə,
İlanın ağzından su verdi mənə.

Tutuquşu kimi göz yumdum mən də.
Həyatı aradım öz ölümümdə.

Bu qansız, imansız dövrün əlindən –
Nitqi sükut olan bir natiqəm mən.

Gördüm ki, dövrəmdə casusdur hamı,
Özüm qıfılladım dodaqlarımı.

Məryəmi məzəmmət edirkən avam,
Dedi: "Danışmaqda oruc tutmuşam".

Mən də dişlərimi möhkəm sıxaraq,
Etmişəm ağzımda dilimi dustaq.

Dilimi xəncərlə kəsdilərsə də,
Dilim – qılıncımdır, Tanrı vəsfində.

Yanılmaz, qılınca bənzəyirsə dil,
Sözündə kəm olar, işində kamil.

Şamaxı – bu geniş, bu gülşən diyar
Hamam tünəyi tək mənim üçün dar.

Mənə zindan olub doğma məskənim,
Üstümdə gözətçim hər tüküm mənim.

Məni ayırmışlar bütün cahandan,
Mehi də qoymazlar keçə yanımdan.

Əgər bircə qədəm çıxsam yolumdan,
Ya bircə ah çəksəm ciyər yananda –

Düşmən düyün vurub dərhal o aha,
Bir göz qırpımında çatdırar şaha.

23

## HƏBSİYYƏ

### HƏBSDƏN ŞİKAYƏT

Hər səhər qalxar göyə ah ilə əfqanım mənim,
Qərq olar qanda şəfəq tək çeşmi-giryanım mənim.

Qurmuşam qəm məclisi, yanmış söyüd tək indi, bax,
Mey süzür məndən mənimçün qanlı müjganım mənim.

Yüz oyun hər gün tutar narınca oxşar bu fələk –
Neyləyim, səfra ilə odlanmasın canım mənim?

Ah oxumla hər səhər aldım hədəf, etdim şikar,
Ol qoca qurdu ayaqdan saldı peykanım mənim.

Pas kimi sardı məni dövran ki, yandırsan, həmən –
Ah odumda yandı, his oldu o dövranım mənim.

Görmüsənmi ki, sarınsın bir çöpə əfi ilan?
Əfidir zəncir, ayağım çöp, gedir canım mənim.

Bax, necə gör halqalanmış damənimdə əjdaha,
Qorxuram tərpənməyə, yoxdur bir imkanım mənim.

Qorxmasın ta gözlərimin nənnisində cüt uşaq,
Əjdahanı gizlədər hər an bu damanım mənim.

Boynuma Zöhhak ilanı saldı ahəngər bu gün,
Çün Fəridun xəznəsidir əqlü ürfanım mənim.

Oxşayır gündə ayağımda dəyirman daşına,
Qanlı göz yaşımla işlər bu dəyirmanım mənim.

Paltarım xara, yaxam da göz yaşımla islanar,
Gizlədər Xara dağını rəxti-əlvanım mənim.

Bu samanla torpağa dönmüş üzümdən, göz yaşım –
Palçıq hazırlar, suvansın ta ki, zindanım mənim.

Şam kimi diş-diş olubdur qıçlarım zəncir ilə,
Çeynəmiş sanki qıçımı qanlı dəndanım mənim.

Qütb tək saxlar məni çarmıx dəyişməz nöqtədə,
Bu Zühəlsima iki Mərrix zənəbsanım mənim.

Sur tək saldı fəğanım göylərə min vəlvələ,
Bu dəmir kürsüdə olcaq saqi-lərzanım mənim.

Söykənib divarına zindanın, üz tutdum göyə,
Asiman tək güllər açdı çeşmi-giryanım mənim.

Qoz içi tək, möhnət ilə mən dayandım üz-üzə,
Bağlıdır fındıq kimi zindanda hər yanım mənim.

Gündüzüm qəmlə, gecəm hey "Allah", "Allah"la keçər,
Dinləməz naləmi o həyyi-sübhanım mənim?

Eylə qorxuncdur bu zindanda mənim hər bir gecəm,
Qorxudar məhşər gününü, xofi-zindanım mənim.

Yüz hasar olsa aşar ahım və mütləq söndürər –
Şəmini bədxahların, bilsin nigəhbanım mənim.

Nəzr edib tutdum oruc Məryəm kimi, Məryəmsifət –
Cəbrəildən doğdu İsa, pak vicdanım mənim.

Xəstə bu qəlb ilə mümkünmü tutam mən də oruc,
Çün oruc batil edər gözdən axan qanım mənim.

Ağzıma iftar vəqti isti gözyaşım axar,
Yoxdur ondan başqa bir iftarə imkanım mənim.

Sanki sövdalı başım etmiş bəlayə mübtəla,
Qıçlarımı saldı işdən indi rəhbanım mənim.

Odlu dəmir dərdə dərmandır deyirlər, ah ilə –
Qızdı zəncirim ayaqda, oldu dərmanım mənim.

Deyləmi gördüm gözümlə, nizəyə döndü tüküm,
Qıvrılıb Deyləm tükü tək, cismi-piçanım mənim.

Bir rübabə oxşaram, kasəm, xəzinəm boş qalıb,
Boynuma kəndir salıb zülm ilə düşmanım mənim.

Danə qoydum ovcuna gördükdə bir hindu qadın,
Tapmadı, əfsus, o falçı, harda xırmanım mənim.

Zər tək itmək, gül kimi solmaqdan əsla qorxmuram,
Dilsizəm, pərvanə tək çıxmaz bir əfqanım mənim.

Əldə hər gül, hər qızıl əqlə tikandır, qoymaram –
Bir tikan seydi ola əqli-süxəndanım mənim.

“Zər” sözündə var iki hərf, heç qovuşmaz bir-birə,
Razı ollammı qovuşsun zərlə vicdanım mənim?

Samiri tiynətliyəm, Musa təbiət olmaram,
Bir buzov dırnağı olsun möcüzə kanım mənim.

Həsrətəm yayda söyüd yarpağına, qədrimə bax,
Oldu Tuba şaxəsindən yayda yelpanım mənim.

Xurma yarpağı mənəm, yelpazə eylərlər məni,
Çün sərin ahım dodaqda titrədər canım mənim.

Oxşaram mişkə, məni gər yüz hasara salsalar,
Çulğayar dünyanı öz ətrilə reyhanım mənim.

Mişkə kimüxt üz tütüb, bir gün dedi rişxənd ilə:
“ – Sən nə çirkinsən, varımdır rəngi-əlvanım mənim”.

Tez cavabında dedi mişk: “ – Ey həyasız, az danış!
Ətrim ilə oldu dünya xoş gülüstanım mənim.

Güzgü tək zahirdə parlaqsan, içinsə qapqara,
Kimyayəm, zahirimdən xoşdu pünhanım mənim.

Kəbəyəm, cümlə mələklər səcdə eylərlər mənə,
Çünki İsa tirməsindən oldu xüftanım mənim”.

Məskənim çirkin də olsa, xatirimlə kövsərəm,
Cənnətə merac üçün vardır hər imkanım mənim.

Kütbeyin düşmən mağara axtarır gizlənməyə,
Hər biri olmuş, odur, quli-biyabanım mənim.

Abinüsəm mən, sədəflə batmışam dəryalərə,
Olmaram çöp, üzdə olsun kəflə cövlanım mənim.

Əql məndə, feyz məndə, qəlbü can da məndədir,
Aləmin həqqi nədir ki, verə fərmanım mənim?

Ülviyəm, ruhaniyəm, qeybi doğuldum qüdsdən:
Qoy bunu inkar qılsın xəsmi-nadanım mənim.

Şirnim olmuşdur şəriət, nənnim – insaf, dayəm – əql,
Oldu dörd ünsür anam, ülviyyət ərkanım mənim.

Səbrlə doldu təbiət dayəsinin döşləri –
Ki, təriqət oldu aləmdə dəbistanım mənim.

Həm Xəlilüllah təkin oldu atam nəccar Əli,
Məryəmə bacı olub, tərsa anacanım mənim.

Gəlmişəm dünyaya mən böylə gözəl saf çeşmədən,
Xəlq olub ol çeşmədən gövhərli ümmanım mənim.

Fəqr bətnində yetişdim, nitq əli oldu mamam,
Oldu yurdum elmü urfan yurdu, Şirvanım mənim.

Fırfıra fırlatmadım qəflət üzündən bir kərə,
Çünki hər an valideyn olmuşdu pasbanım mənim.

Nər dəvəm sizdən noğala ummadı heç bir zaman
Dolmamış xamlar əlilə kisəm, həmyanım mənim.

Qoy vəbalım düşsün hurilə mələklər boynuna,
Bakirə meynə qanından dolsa peymanəm mənim.

Mey içərsəm də rəvadır, çün dünən vermiş peşin,
Zəhmət həqqimi mənə cənnətli dehqanım mənim.

Sağərim alsın deyə, torpağa düşdü ruhlər,
Ta behişt içrə içilsin qırmızı qanım mənim.

Nurlu Quranla qara daşı gərək hər dəm öpüm, –
Tutsa da kövsər kimi dünyanı ehsanım mənim.

Nitq gənci sahibi, söz mülkünün xaqaniyəm,
Vardır hər bir kəlmədə yüz gənci-xaqanım mənim.

Bax, əlim – Cövza, qələm – Hut oldu, məna – Sünbülə,
Sünbülə Hutdan doğar, Cövza – qələmdanım mənim.

Yeddi ölkədə iki beytim yazarsa kimsə, bil,
Kafərəm, Darül-Qəmamə – darül-imanım mənim.

Bu-Ləhəblərlə döyüşməkdən nə qorxum dəhrdə?
Mustafanın mehri olmuş əldə qalxanım mənim.

Qasimi – Rəhmət, Əbülqasim, Rəsulüllahdir,
Canıma, əqlimə sahib, şanlı sultanım mənim.

24

## HƏBSDƏN ŞİKAYƏT VƏ AZAD OLMAĞIM ÜÇÜN RUM QEYSƏRİNDƏN XAHİŞ

Tərsalərin xətti kimi tərsinə işlər fələk,
Boynuma bir zəncir salıb, saxlar məni rahib tək.

Bu deyrdə sakin deyil məgər həzrəti İsa –
Ki, Dəccalın işin işlər mina rəngli kəlisa?

Bax Məryəmin sapı kimi ikiqatdır bədənim,
İsadakı iynə kimi təkcədir qəlbim mənim.

Möhkəm iplə əl-qolumu bağlamışlar burada,
Necə İsa bir iynəyə bağlı qalmış orada.

Necə olmuş: Dəccal kimi təkgöz olan bir iynə –
İmkan tapıb sancılmışdır İsanın sinəsinə.

Rahiblərin paltarı tək, gündüzüm olmuş qara,
Hər gecə mən rahib kimi başlaram ahü-zara.

Sur kimi nəfəslənən ahlarımla hər səhər,
Mavi damın bacasında yerləşən xaç deşilər.

Dəryaları buxar edən ahıma tuş gələrək –
İsa üçün təyəmmümgah oldu dördüncü fələk.

Mənə ülvi atalarım olmadılar mehriban;
Odur ki, mən saqınıram İsa kimi atadan.

Mənə bilik ulduzunun nə olacaq faydası?
Mən zülmətəm, parlamaqdır ulduzumun qaydası.

Ruh olmuşsa Keyxosrov tək İran, Turan hakimi,
Niyə zülmət bir quyuda qalmışdır Bijən kimi?

O dördüncü göydə İsa günəşlə həmxanasa,
Bundan nə həzz ala bilər İsa quşu – yarasa?

Niyə İsa öz quşunun özü təbibi olmur –
Ki, o quşun kor gözünə özü bağışlasın nur?

Təbimin bu körpələri birər İsaya oxşar,
Anasının paklığını hər biri etmiş ixtar.

Məryəm xurma ağacilə göstərmişsə möcüzü,
Mən təbimin paklığına şahid gətirrəm sözü.

Beş yüz ildir doğulmamış mənim kimi sənətkar,
Yalan yoxdur bu sözümdə, mənim min şahidim var.

Yaralanmış könlüm oxşar barlı arı şanına,
Verdiyim bal bulanmışdır ürəyimin qanına.

Ah odumla alışaraq yanan bu yağlı dilim, –
Tərsamıyam məgər? – Dönüb olmuş mənim qəndilim?

Düşmən məni zəncir ilə bağlamış üç tərəfdən,
Asıb daim odlayırlar, məgər bir qəndiləm mən?

Axıdıram, Məryəm kimi yerə tikib başımı, –
Məsihanın nəfəsi tək saf olan göz yaşımı.

Necə iki əlif durar bir “ətəna” sözündə,
“Tən”in o cür dayanmışam arxasında, önündə.

Mənə zərrə yardım etmir təəssüfü dostların,
Nə lüzumu var bu qədər fəryadın, ahü-zarın?

Zəmanənin pislərindən həqqə aparram pənah,
Allahsızı haqq yoluna özü gətirsin Allah.

Abbasilər qapısına getmərəm kömək üçün,
Səlcuqilər qapısında inləmərəm bircə gün.

Bu dövrandan görməmişəm nə ədalət, nə kərəm,
Nə Arslan, nə də Buğra qapısına gedərəm.

Yusif yoxdur, qıtlıq günü eləsin məni təmin,
Birdir mənim gözlərimdə Yəhuda, İbn-Yəmin.

Müsəlmanlar mənə qarşı ədalətsiz oldular;
Mən dinimdən əl çəkimmi? Bunun nə mənası var?

Yeddi yerdən din elmini təhsil edəndən sonra,
Yeddi kitab üzrə vəhyə təhlil verəndən sonra,

Əzbərləyib “Əlhəmdüllah”, “Əlkəhf”i, “Ərrəhman”ı,
Həm “Yasin”i, həm “Tasin”i, həm “Mim”i, həm “Taha”nı,

Miqatdan həccə gedib təvaf edib Kəbəni,
Səyü cümar icra edib, görüb əsl qibləni,

Otuz ildə neçə dəfə çillə tutandan sonra,
Necə gedib əlli günü pəhriz tutum aşkara?

İudanın tay-tuşudur düşmənlərim, odur mən –
İsa kimi çox qorxuram gözlənilməz tənədən.

Nədir əmrin, İudanın sitəmindən qorxaraq,
Mən Sükuba kilsəsinə düşüm əlindən qaçaq?

Nədir mənim, gedib küfrün kandarında yer tutam?
Gözləməyin öz dinimin yolunda ali məqam?

Abxazların qapısını gedib göyüm əlimlə?
Rumluların məzhəbinə iqrar edim dilimlə?

Qibləm olan Beytüllahdan mən necə üz döndərim?
Olsun Beytülmüqəddəsin mehrabı səcdə yerim?

Əlli ildir müsəlmanam, ağartmışam saçımı,
İndi gedib ayağıma zəncir edim xaçımı?

Məhkumluqdan gedib öpüm kəlisanın zəngini?
Zülm əlindən zünnar asıb, dəyişdirim rəngimi?

Səryanilər hədisini İncil üzrə şərh edim?
Tövratdakı müəmmanı oxumağa mən gedim?

Nacorməklik hara, Məxran kilsəsində mən hara?
Bokratilər qapısına gedib, istəyim çara?

Necə gedib zahid kimi mağaralarda qalım,
Əynimə bir çuxa geyim, orada “molo” çalım?

Əvəz edim bir palazla ipək xara köynəyi?
Bətriq kimi yurdum olsun qayaların ətəyi?

Uşaqların boğazına taxta dua asan tək,
Bu yaşımda xaç asarsam, əqilsiz olam gərək.

Mənə hörmət etməzlərsə Abxazyada, nə edim?
Oradan da yola düşüb, Rum ellərinə gedim?

Gedib Rumun heykəlində məktəb açım təzədən?
Mətran qoyan ayinləri başlayım təlimə mən?

Səqqa oğlu kimi atım ridanı, teyləsanı?
Zünnar asım, bərnəs geyim, olum donuz çobanı?

Verim böyük Tərsiqusun qarşısında imtahan,
Söhbət açım Cəbrayıldan, oğuldan, həm atadan?

Bir sözümlə, nə qədər var üç əsasa inanan, –
Haqq yoluna çıxar dərhal tərəddüd quyusundan:

Üsqüf mənim biliyimi üstün tutar, verər həqq,
Yəqub ilə, Nəstur ilə Məlkaya qarşı mütləq.

Kəşf edərəm öz əlimlə əsrarını lahutun,
Göstərərəm, nə deməkdir həyulası nasutun,

Dərs almağa məndən gələr dəstə-dəstə keşişlər,
Onlar hələ mənim kimi bir alim görməmişlər.

Deyərlər ki, bu, hikmətdə ikinci Bətlimusdur,
Böyüklükdə, hörmətində şöhrətli Filakusdur.

Qüstəntinə aparılan yazımın hər kəlməsi
Ölülərə hunut olar, dirilərin sürməsi.

Mən Musanın əsasını hardan olsa alaram,
O əsanı sındıraraq, xaç şəklinə salaram.

Məsihanın eşşəyinin peyinini basıb mən,
Burun qanın dayandırram qoca abidin fövrən.

Səmərqəndlə Buxaranın xəqanına tac deyə,
Göndərərəm o eşşəyin noxtasını hədiyyə.

Gümrahların göz yaşilə dırnağını eşşəyin –
Tutduraram mən qızıla, lələ, yaquta yəqin.

Üç üqnumu, üç qurğufu öyrənərəm mən əzbər,
Dəlillərlə məzmununu şərh edərəm müxtəsər.

Nə çay idi, nə çimməkdi, nə yengindən püfləmək?
Bir halda ki, çılpaq idi Məryəm, Cəbrayılsa tək.

Necə yəni bəkarəti pozulmadan Məryəmin, –
Bətnində bir gövhər onun canlandı həmin-həmin?

Necə İsa yaratmışdır canlı bir quş palçıqdan?
Necə Məryəm sübut etdi ki, o günahkar deyil?

Necə İsa yaratmışdır canlı bir quş palçıqdan?
Necə ölmüş Azərə o yenidən vermişdi can?

Necə yəni dar başında İsa dedi gedirəm,
Yuxarıda öz atamın səsini dərk edirəm?

Əgər Zərdüşt dini ilə maraqlanarsa qeysər,
Əlim ilə Zənd-Avesta ayinləri dirilər.

Deyərəm ki, od nə idi, haradan yarandı Zənd –
Ki, onların ikisindən ad aldı zənd-pazənd?

Nə kül idi, yerdə qalan o oddan ki, bir zaman –
Alışaraq yandı, etdi Xəlilüllahı heyran?

Bir məbədi tərəziyə qoyub axtarsam taraz,
Luka oğlu Qəsta onun yəqin pərsəngi olmaz.

Nə üçündür bədəninə milçəklər fitə bağlar?
Nə deməkdir çəyirtgənin ayağında o şalvar?

Məşhur olan Çin Ərtəngi Tənglüşadan gözəl,
Qeysərlərin şənində mən yazaram təsnif, qəzəl.

Ey Xaqani, bu yaramaz fikirləri boşla sən,
Çünki bu cür fikirləri şeytandır təlqin edən.

İsa üçün nə düşünər alçaq olsa yoldaşı?
Pis vəzirdən nə qavraya bilər sultanın başı?

Bəsdir, daha, küfrə son qoy, təzədən imana gəl,
Tövbə eylə dediyindən, arzulardan götür əl.

Söylə, iqrar edirəm ki, böyükdür, təkdir Allah,
Mənim tərif etməyimdən qat-qat yüksəkdir Allah.

Buradadır İzzüddövlə, Rumun böyük hakimi,
Nəyə lazım Ruma getdim yoldan azanlar kimi.

O, İsanın sağ əlidir, həvarilər bayrağı,
O, Məryəmin əminidir, nəsaralar dayağı.

Sən ey İsa təbiətli, Qeysər oğlu, sən məni –
Dinlə bir az, and verirəm bir Allaha mən səni;

And verirəm Cəbrayilə, ruh püfünə, Məryəmə,
Həm İncilə, həvariyə, həm İsəbni-Məryəmə.

O doğruluq beşiyinə, o bakirə hamilə,
Həm o ələ, o qola ki, mayalandı yel ilə;

Çaxmaq daşı, Əqsa deyri, Beytülmüqəddəsə mən –
And verirəm Şəlixaya, Ənsariyə, pak ikən.

And verirəm zünnar ilə, naqus ilə qəndilə,
Yuhənnaya, Bəheyraya, Şəmmasə, gəl rəhm elə.

Həm Allaha, həm qurbana, həm Fitrə axşamına,
Həm Məryəmin orucuna, həm heykəl bayramına;

Məryəmə ki, qoymamışdı Yusiflə baş yastığa,
İsaya ki, yerləşməmiş bətndə uşaqlığa;

O ağac ki, həqqin ruhu olmuş onun meyvəsi,
Sən olsan o ağacın qol-budağı, rişəsi.

And verirəm o qışa ki, birdən dönmüş bahara,
O qocalmış ağaca ki, cavanlaşmış dübara;

Kəlisada inləyərək, “molo” çalan rahibə,
Öz əlilə öz boynuna zəncir salan rahibə.

And verirəm o üç bürcə, o ulduza, o Aya,
O təslisə o tərbiə, təsdisə, səlasayə.

O üçlüyə ki, ucadır səmanın ülkərindən,
Dörd yan xaça, külək üçün düzələn bacaya, sən –

Mənə Beytülmüqəddəsi görmək üçün rüsxət al,
Bu xüsusda dünyaların sultanını başa sal.

Ki, üstüva xətti ilə mehvərin xətti əgər –
Birləşsələr, nəticədə bir xaç əmələ gələr.

Layiqdir ki, bu şerimi İsa öyrənsin əzbər,
Təsbehində vird eyləsin hər beytimi səhərlər.

25

Ruhum bu can mülkünü uçub tərk edən kimi,
Rahatlığın pərisi atıb getdi qəlbimi.

Bizi barışdıracaq nəfəs idi arada,
Baş alıb ortalıqdan bir anda çıxdı o da.

Qalmışdı təkcə kölgəm, o da getdi aradan,
Artıq adım, nişanım silinmişdir dünyadan.

Evimin dörd divarı baca kimi söküldü,
Astanası dağıldı, səqfi yerə töküldü.

Könlüm nərd oyununda düşmüşdür şeşxanaya,
Qanlı göz yaşım gərək on yeddini sanaya.

Duzlu su gözlərimdən axdıqca hey torpağa,
Ayağımın altını döndərmişdir duzlağa.

Fələk mənim qəlbimi nişana aldı, atdı,
Atdığı ox işləyib sümüyə, cana çatdı.

Dünən gecə ahıma hədəf etdim göyləri,
Qanlı bulud bir anda çulğaladı hər yeri.

Ürəyimin başında bir kədər tutdu məskən,
Deyəsən getməyəcək o heç zaman bu yerdən.

Gəlib çatdı dostumdan məktub gətirən o quş,
O quş ki, səhər-səhər öz yuvasından uçmuş.

Lakin o gördü əsla ayağa qalxmadım mən,
Qəzəblə endi yerə, kədərlə qalxdı yerdən.

Bir əjdaha yatırdı ayağımın altında,
Buna görə ayağa dura bilmədim onda.

Ayağımın üstünə qoyulmuşdu dəmir dağ,
Ayağı dağ altında olan qalxar nə sayaq?

Xaqaninin ayağı açıq olsaydı əlbət,
Qalxardı öz yerindən göstərərdi o hörmət.

Zöhhak ilanlarilə sarınmışdır ayağım,
Onunçündür gözündən mirvari yağdırmağım.

Ayağıma sarılmış iki əfi ilandan,
Tavadakı balıq tək qovrulur qəlb, yanır can.

Ah çəkərkən təndir tək alovlanır bədənim,
Odlu ilan tək çıxır alov ağzımdan mənim.

Sataşdıqca gözümə keşikçisi məhbəsin,
Qəlbimin yaraları qövr edir həzin-həzin.

Bir quduz it zindanda keşikçim olmuş mənim,
Ağlar gözümdən şirin yuxum qovulmuş mənim.

Sudan qorxar deyərlər, quduz it qapmış insan,
Bununçündür ki, mən də qorxuram gözyaşımdan.

Ürəyimin odundan göz yaşım olmuş buxar,
Çəkdiyim soyuq ahdan qışa dönür hər bahar.

Nar dənəsinə bənzər tökdüyüm gözyaşından –
Üzüm olur hər gecə şəfəq kimi al-əlvan.

Qıçımı zəncir kəsib, topuğumdan qan axır,
Elə bil, yağış seli iri novdandan axır.

Bəlkə, ahımdan dəmir qızararaq əriyir,
Onunçün də səslənib dəmir "əlaman" deyir?!

Bu dəmir xalxalımı açmaq istəyən zaman,
Zınqırov kimi məndən ucaldı nalə, fəğan.

Zəifləmiş vücudum bənzər ipək bir telə,
Bu nazik ipək tel də qüssədən gəlmiş dilə.

Divarlar seyr elədi mənim solğun rəngimi,
Onların da üzləri oldu zəfəran kimi.

Göyə fəvvarə vurdu ürəyimdən axan qan,
Öz yolunda palçığa batıb qaldı kəhkəşan.

Tikanlığın içində çırpınan bülbüləm mən,
Ümidimi kəsmişəm gülüstanın gülündən.

İnsaf, mürüvvət gülü qalmamışkən dünyada,
Etdiyim bu haraydan, bu nalədən nə fayda?..

Ciyərimin qanından ciyərim doymuş deyə,
Mədəmin meyli yoxdur nə suya, nə çörəyə.

Can burda məhv olurkən, nəyə gərəkdir bədən?
Ölürkən ev sahibi, tapılarmı ev güdən?

Torpaqdan ev tikənlər axırda torpaq oldu,
Tikdikləri saraylar, kaşanələr uçuldu.

Sel coşdu, dalğalandı, yaman tufan qopardı,
O, tək paltarı deyil, dərzini də apardı.

Bir qəssab dükanıdır bu fələk ilk çağından,
Qan axır damcı-damcı qəssabın bıçağından.

Bir yan quzu cəmdəyi, bir yanda var tərəzi,
Nə köklük, nə arıqlıq düşündürür bir kəsi.

Yağlı, ucuz bir tikə mənimsəmiş hər alçaq,
Mənim tikəm həm kiçik, həm də bahadır ancaq.

Dükanda döş, qabırğa, ürəkdir dəyən gözə,
İstədiyi tikəni qəssab vermir heç kəsə.

Abır-həya gedincə qorxu qalxır ortadan,
Nəyin dərdini çəkər sürüsü batmış çoban?!

Çıxıb getdi şəhərdən uzaqlaşdı karivan,
Qarasoran bac alıb, çəkildi getdi yoldan.

Dəvə palçıqda yanmış ildırım zərbəsindən,
Türkmən azad edilmiş dəvənin vergisindən.

Arzulardım həyatda sədaqət, düzgün ilqar,
Ümidlərim puç oldu, vəfasız çıxdı dildar.

Dad çəkdim fərasətsiz, anlamaz böyüklərdən,
Böyük qəmlər bu kiçik könlümü etdi məskən.

Zənn edirdim, dünyada var vəfalı adamlar,
Yarım vəfasız çıxdı, səhvimi etdim iqrar.

Yusifin də başına bəlalar açdı dövran,
Qardaşlar arasında baş verən bir nifaqdan.

Bir ilin məhsuludur mənim gündəlik qəmim,
Uzun illər boyunca qəm olacaq həmdəmim.

Yox, bu tufan yaranmış qəzanın buyruğilə,
Qoy dünyada möminlər yaşasın bundan belə.

Xilas olum deyə mən, bir qüdrətli hökmdar –
Çalışır var gücüylə, artıq nə möhnətim var.

Xaqanini öldürsə şah, onun sarayından –
Qisasını alar bir şah nişanlı hökmran.

26

## VƏZİRƏ MƏKTUB

Nə qədər ki, dövlət sənin qapındadır pasiban,
Açacaqdır ağuşunu sənə əngin asiman.

Qureyşilər bayrağınla səfərbər oldu sənin,
Yəmanilər xəncərinlə müzəffər oldu sənin.

İnsaf sənin dərgahına gəldi sevinc ilə, bax,
Zülmü sitəm astanadan qaçdı yaxa yırtaraq.

Fələk sənin qullarının qollarına baş əydi,
Ona görə fanilikdən azad oldu əbədi.

Öz qələmin rəng vermişdir məharətlə ruzgara,
Gündüz, gecə bu səbəbdən olmuş belə ağ, qara.

Söz Misrinin Yusifləri sağlığına hər zaman,
Nuş eyləyir mənaların badəsini durmadan.

Mənim bütün varlığımı bürümüşdür qəm, kədər,
Razılığın olmayınca, bu varlıqdan nə səmər?

Mənim yüksək qiymətimi təkcə bir sən bilərsən,
Simurğə də bu dünyada Cəmşid verə bilər dən.

Gözəl bilər bu mətləbi göy cəlallı hökmdar,
Mənim kimi yer üzündə tapılmaz bir sənətkar.

Baxma sadə bir xarratın oğluyam mən, bil, Azər –
Xarrat idi, lakin oğlu Xəlil oldu peyğəmbər.

Bu sənətdə hər kəs məndən öyrəndi bir fəsahət,
Sonra gedib hazırladı mənə min cür fəlakət.

Təəccüb deyil, əgər bir qurşun almaz qıra –
Hünər ona deyərəm ki, almaz polad sındıra.

Gedən zaman bu dünyadan Sənai tək bir ustad –
Əvəz gəldim ona, atam mənə Bədil qoydu ad.

Boğazına gövhər taxdım bu dünyanın o qədər,
Onu aman deməyə də qoymadı bu gövhərlər.

Sən təbimin bağçasından istə təzə xurmalar,
Gedib hər bir yaramazın söyüdündən umma bar!

Hər an xurma ağacından bollu xurma dərərsən,
Yel əsərsə, kəpənəklər uçar fəqət söyüddən.

Əgər qəmdən qocalmışsa vücudum, nə eybi var? –
Mədhin ilə bu dünyanı təzələrəm, şəhriyar!

Tərifini edən qəlbim sınsın gərək hər anda,
Çün xəzinə olar ancaq xarabazar məkanda.

27

Xaqani qürbətə basalı ayaq,
Olmuş təkqapılı bir evdə dustaq.

Nə evin içində rahət olur can,
Nə də var bayıra çıxmağa güman.

Üzü divaradır, sanki hörümçək –
Girmiş daş altına bir qarışqa tək.

Qıfıldır keşikçi ona bayırdan,
Daxildə cəftədir ona pasiban.

Nəfəsi – alovdur, göz yaşı – Ceyhun,
Qəlbi – od kürəsi, ahı – od, onun.

Salınmış dörd yanı bağla bir yerə,
Açılır qapısı geniş göylərə.

Sükut qıfılını ağzına vurub,
Ümidini haqqa bağlayıb durub.

Nə qədər bu ümid qonaqdır bura,
Qapını açmayın yad duyğulara.

Xaqani, xoş həyat fikrindən əl çək!
Dünyada tapılmaz dərdsiz bir ürək.

Dörd əsas üstündə dayanmış cahan,
O dörddən birisi sayılır ərkan.

Sən də öz evinə dörd cəhət axtar,
Çünki hər təməli dörd səbəb qurar.

Şadlığın şərtisə üç şeydədir, bax:
Məkandır, zamandır, bir də dost, – ancaq.

Dördüncü şərtini görən olmamış,
Çünki yoxdan xəbər verən olmamış.

28

## ZƏMANƏDƏN VƏ ZƏMANƏ ƏHLİNDƏN ŞİKAYƏT

### ÜRƏK DƏRDİNİN İZHARI

Ağlayırdı ana yurdum, nədir, – dedim mən, – illəti?
Buna səbəb zəmanəmi, yoxsa qardaş müsibəti?

Dedi: " – Qardaş ayrılığı zindan edib bu dünyanı,
Qardaş idi, yaxşı dostdu mənim üçün, bil, Xaqani.

Günəş tökər gözündən yaş, görmürsənmi, bir yaxşı bax,
Şəbnəm kimi yaş tökməsi onun əsla deyil nahaq.

İşıq saçan oxlar ilə ürəyimi alıb nişan,
Deyirlər ki, bu oxlarla işıqlanır sənin yaxan".

Mən yurdumdan üzr istədim, bağışladı o nəhayət,
Bir izhari-məhəbbətdi elədiyi bütün töhmət.

Ölkə parlaq oxlarını ürəyimə sancmış tamam,
Al qanımı saxlamağa otlağına mən qaçmışam.

Barınmağa, sığınmağa xoş olsa da bu tərəflər,
Daşı "qəfəs" sözündəki hərflərə xeyli bənzər.

Sübhü – sağlam, atı – qıvraq, hüzuruna gəldim, nə qəm,
Mən insafın, ədalətin, sədaqətin məskəniyəm.

Əzizliklə keçər Şirvan torpatının ruzigarı,
Zövqü səfa qucağıdır o mərifət çadırları.

O çadırlar bizim üçün hər bir zaman əziz olur,
Mən həm ondan utanıram, həm gözlərim yaşla dolur.

İndi elə bir haldayam, dost görəndə əzab çəkər,
Şadlıq edər, bu halımı görə bilsə düşmən əgər.

Yaqut rəngi alıb, budur, – gözlərimin yaşı donub,
O, qəlbimdən sızan qandır kirpiyimə yaş tək qonub.

Göz yaşımda nə acılıq, nə də şorluq əsəri var,
Bəlkə yaqut suyundadır keçən şorluq, acılıqlar.

Necə ki, Səd unutmazdı Əsmanı – öz dildarını
Yaşıllıqda uçan quş da unutmaz öz diyarını.

Ana övlad sevən kimi sevər gülü yaxşı bağban,
Həkim də öz xəstəsinin qayğısını çəkər hər an.

Sulanmışdır iki gözüm, kirpiklərim əyilmişdir,
Bu yaxşıdır, elə bil ki, gözlərimə nur gəlmişdir.

Hamar yerdə su dayanmaz, axıb gedər, – bu adətdir,
Otlu yerdə dayanmasa, deyin görək nə hikmətdir?

Göz yaşıma çəpər olan kirpiyimə baxıb Şirvan,
Heyrət edir, çünki tökür yaş yerinə o qızıl qan.

Axıtdıqca göz yaşları qızıl üzüm salxımı tək,
Bu yaşlardan xoşhallanır, sevinc, şadlıq duyur ürək.

Hava gözsüz ola-ola, derlər – ağlar, nə halətdir?
Bəli, ağlar, iki gözü "he" hərfindən ibarətdir.

Bir gecənin şehindən çox yaş tökürəm sübhə qədər,
Görənləri aldatmaqçün deyildir bu iniltilər.

Ağlamıram, gülürəm mən, gülüşümə sal bir nəzər,
Süd verən bir qadın erkən boylu olsa belə gülər.

İlk baharın buludu tək ağlar, gülər üzüm mənim,
Deməli, hind biharını yamsılayır gözüm mənim.

Söyləyirlər "sən gülürsən", deyirəm ki, "sizə əlbət".
Cavabımdan düşmənlərin ürəyinə düşür dəhşət.

Söyləyirlər “ağlayırsan”, “səbəb sizsiz”, – deyirəm mən, –
“Dost idiniz mənə bir vaxt, ağlayıram dərdinizdən”.

Onlar bizi aldatsa da, üzr istəyib, dedi cahan:
“Mən bir qisas dünyasıyam, can qurtarmaq deyil asan!”

Varlı idim, dost oldular, yoxsul düşdüm, tez doydular,
Məndən kənar dolandılar, dostluğa da son qoydular.

Duymusansa səhər yeli oxşadıqca üz-gözünü, –
Gəl, qardaşlıq hörmətinə təsdiq elə bu sözümü.

Cavab hanı, aman, o da göz yaşına qərq oldumu?
Səmum yeli nəfəsinin təsirindən o soldumu?

Kim istəsə tezlik ilə qəbul görə duasını, –
Duasına qatmalıdır özü “amin” sədasını.

Göz yaşından əyilməsə başım, qınaq etməsin yar,
Təmkin ilə, yumşaqlıqla ancaq isbat etmək olar.

Əgər yarın yanaqları qırmızısa xilqətindən,
Mənim üzüm qızarmışdır ağlamağın şiddətindən.

Həyat fani olduğundan, heç kəs almaz onu saya,
Arzulayıb, kim bağlanır müvəqqəti bir dünyaya?

Görünür ki, yaranıbmış qarğa məndən xeyli qabaq,
Heyrətimdən can qurtardı, o ayıltdı məni ancaq.

Vəfalıdır yarım, lakin nə yanına dəvət edər,
Nə də çalıb oxumaqla can bağışlar, himmət edər.

Yurddaş kimi qəbul edib sevindirdin məni, ey yar,
Bəs: “didərgin oğlu” deyib, neçün sonra eylədin xar?

Mən var idim, yoxa çıxdım sənlə ülfət qatan kimi,
Mən simurğə yetişməmiş, mən batdım, ay batan kimi.

Qaranlığın ətrafında səhər güldü xeyli parlaq,
Belə sübhü qeyd etməmiş heç bir alim bizdən qabaq.

Axtarırkən qamçısını qaranlıqda itirənlər,
Xoruzlar sübh olduğunu banlamaqla verdi xəbər.

Əşarımı göyərçinlə yola saldım diyar-diyar,
Hər misramda xislətimin müfəssəl bir izahı var.

Səxavətli kişiləri şerimdə çox öymüşəm mən,
Ümmanlar bir nümunədir beytimdən ürəklərdən.

Gözyaşları o qədər ki, boğdu məni, etdim təlaş,
Həyəcana düşdü canım köynəyimi görüncə yaş.

Tutdum Allah kəməndindən, bu ip möhkəm, bu ip haqdır,
O, Tubaya bağlanmışdır, məni ərşə dartacaqdır.

Mən Şirvandan məcburiyyət qarşısında uzaq düşdüm,
Təbrizdən də özbaşına ayrılmadım, iraq düşdüm.

Taxtapara üstündəsən madam, sənə yoxdur nicat,
Vətən vəsli mümkün deyil, ölüm səni edər rahat.

Mən ki, məskən eləmişəm ağlar gözlə bir səhrada;
Qorxuram ki, gözyaşıyla əldən çıxa bir gün bu da.

Bu səhranın sonu yoxdur, göz baxdıqda heyran qalır,
Qoynundakı çadırımsa uzaqlara işıq salır.

Yurdumuzdan nəsibimiz xatirəylə həsrət oldu,
O tikanlı kölgəliyi güllük sanmaq qismət oldu.

Bu göy çadır altında, ah, nələr gördü üzüm, nələr!
Şadlığımı əldən aldı bu çöllərdə sular, sellər.

Rəzillərin övladı da alçaq olar, paxıl olar,
Məhrum edər mənim təki çoxlarını rəzil əğyar.

Uzun zəhmət çəkib ana böyüdəndə əziz bala,
Düşünərmi övladına üz verəcək bir gün bəla?!

Həyat vermək istəyərkən ana xəstə övladına, –
Dirilərə qəsd eləmək heç düşərmi, de, yadına?!

Mən elm ilə suvarılmış bir zəmiyəm, barım dən-dən
Abi-həyat içirmişdir anam mənə döşlərindən.

Bətnindəki doyurduqca şama dönər hər bir ana,
Nəfəs verər yedizdirər, gətirincə bu cahana.

Öz Tanrıma möhtacam mən fəzilətdə, kəramətdə,
Bir çox fəsih ədiblər də möhtacımdır məharətdə.

Göyərtilər buludlardan tələb edər daima su,
Dənizlərə möhtac olur buludlar da, – qaydadır bu.

Hörümçəklər divarlara tor toxuyar gözəl, qəşəng,
Gəlib onu düyün salar, dolaşdırar qara milçək.

Göz önündə nə tor hörər, nə iş görər ancaq arı,
Şan içində hazırlayar dərdə şəfa dərmanları.

Nə fərqi var təsvir etsəm çəmənləri, göy düzləri,
Qısqanc, paxıl adamları, biabırçı, pis sözləri...

Bəli, nöqsan cahillikdir, günah olur fəzlin mənə,
Çünki batır fəzilətim cahillərin gözlərinə,

Mənim rəvan şeirlərim ruhlandırar aqilləri,
Çoxdu şahid, bu şeirlər döyər yalnız cahilləri.

Tanrım məni ucaltmışdır, könlüm göyü dolaşmışdır,
Mənim əzmim bu dünyanın o tayına yol açmışdır.

Mənim qəlbim sirli, mövhum bir nöqtədir öz sinəmdə,
Nimkürrədə "be" hərfinin nöqtəsinə bənzər həm də.

Mən özüməm söz mülkünün xəlifəsi, iqtidarı,
Ustadımsa bir sultandır – elmin, fənnin tacidarı.

Çox göndərdim mən sultana ləyaqətli söz töhfəsi,
Belə bəxşiş alır bəzən zəmanənin xəlifəsi.

Şairlərin ucasıyam, qəlbim şeir sultanıdır,
Nə vardırsa ürəyimdə, fazillərin ehsanıdır.

Cəlaliylə sultan mənə fəziləti ehsan etdi,
Lakin qüdsi Cəlaləddin bunu daha rəvan etdi.

Şeir yazıb mədh edirəm o inamı, alimi mən,
İstəyirəm bir feyz alım ətir saçan məskənindən.

Din sütunu nəcib seyyid, dərk edəndir həqiqəti,
Heç bir kəsdə ola bilməz fəsahəti, bəlağəti.

O, hidayət baqrağının qılıncıdır, qoruyandır,
Fazillərə, alimlərə o, ustaddır, o, həyandır.

Elmlərin o, Xızrıdır, pəhrizlərin Musasıdır,
Sirr açmaqda bu dünyanın məharətli İsasıdır.

Xızr kimi bizə elmi ancaq o ərməğan verib,
Ölmüşlərə, həqiqətən, İsa kimi o can verib.

Onun düha nəfəsilə ilham gəldi qəlbimizə,
Sözün dərin mənasını odur təfsir edən bizə.

Onun gözəl musiqisi, qəlbə yatan muğamı var,
O mübarək məclisinə cənnət deyir toplananlar.

Onun xitab kürsüsü çox faydalıdır, həm də qəşəng,
O kürsüyə əhsən! Ona qibtə edir doqquz fələk.

Onun duzlu kəlamına baldan şirin desəm, xoşdur,
Eşq suyundan, aşiqlərin göz yaşından yoğrulmuşdur.

Nəsihəti, vəzi şirin, qönçə ağzı müəttərdir;
O, gələcək nəslə belə yol göstərən bir rəhbərdir.

O vücudun sədaqətli xidmətçisi, quluyam mən,
İmamların xosrovudur, düzdür hər bir xəlifədən.

Yeddi ulduz parlasa da qəlbim işıq saçan zaman,
Əsla heyrət etməyirəm mən onların işığından.

Çünki mənim ürəyimdə min təşəkkür, min tərif var,
Bu tariflər, təşəkkürlər duaları xatırladar.

Dağa dönər mərifətli qəlbim onu yad edəndə,
Onun mədhi bir sönməyən nur yaratdı dağ sinəmdə.

Mədh etdiyim insan çox bəsləyir hörmət mənə,
Şadlandırır ürəyimi, göstərdikcə rəğbət mənə.

Hər tərəfdə qarşılanır o tükənməz bir hörmətlə,
Bəxşiş almış ağ əmmamə, ömür sürür bu şöhrətlə.

Uca yerdə qoyub onu, hüzurundan mən getmişəm,
Cuda qalxmış bir Nuhdur o, daim belə zənn etmişəm.

O, hümməti sayəsində daim əziz olacaqdır;
Gecələr də gündüz kimi həm işıqlı, həm parlaqdır.

Göndərdiyim nə vardısa, hamısını etmiş qəbul,
Şikayətə səbəb olmaz xəta etsə təzə bir qul.

Bacarsaydım, bağışlardım bir xəznə ki, inciləri
Qərq edərdi günəş kimi nura zülmət gecələri.

Bir baxışı vardır onun, nüfuz edir arzulara,
Bunun üçün ona bəsdir gözündəki bir cüt qara.

Bir günəşin misalıdır parlaqlıqda onun gözü,
Elə bil ki, qürub vaxtı su üzüdür gözəl üzü.

O aləmin ümididir, ona baxır bütün dünya,
Mülayimdir xasiyyəti, işıqdan xəlq olub guya.

Yer üzündə tədbir ilə şəhərlərə zinət verir,
Bütün xalqın tədbirinə öz əqlilə qüvvət verir.

O, həqiqət hakimidir, hüdud bilməz ədaləti,
Keçməz onun divanında yalançılar şəhadəti.

Ehtirama layiq olub onun evi çoxdan bəri,
Otağında asılmışdır ümidlərin qəndilləri.

Köz sönəndə qalmaz onun işığından əsla əsər,
Lakin sönməz heç bir zaman o saçdığı al şəfəqlər.

Elə bil ki, yaranmışdır başdan-başa qaynar sudan,
İstiqanlı bir kişidir isti su tək hər bir zaman.

Cismən bir az kiçiksə də, çox ucadır şan-şövkəti,
Heç bir kəsə ziyan verməz, ipəkdəndir təbiəti.

Asanlıqla ürək açar, qanad alar ondan hamı,
Müşkülləri həll eləyib, razı salar həm adamı.

Mən yazdığım mədhiyyəni göyərçinlə saldım yola,
Əzizliyi mədhiyyəmlə yaratmışam – sanma əsla.

Zər qələmim göyərçinin dimdiyinə müqabildir,
Qartal kimi uzaqgörən, tuti kimi şirindildir.

29

PAXILLARI MƏZƏMMƏT

Nə zaman ayrılarsam bu bağdan, bu çəməndən,
Yaxın ollam o anda yeganə xaliqə mən.

Təxtü tacım, üzüyüm yoxdur Süleyman kimi,
Dəm vururam Allahdan abid bir insan kimi.

Nə Musa tək Turum var, nə də atəşim yanar,
Dost olmaqçün Allaha məndə çox iddia var.

Nəfsimin istəyini dəryada atmışam mən,
Əl çəkirəm büsbütün, əqlin istəklərindən,

Göydə qanad açıram rütbəmlə, hörmətlə,
İncə şeir yazıram qüdrətim, hümmətimlə.

Xərclədim doqquz çərxin töhfəsini bir anda,
Şam yeməyində getdi altıgünlük cahan da.

Fitrə gecə-gündüzdən bir təxt qurubdur mənə,
Göy qübbəsi tağımdır, – bəxş etmişdir zəmanə.

Zahirimdən təbimin evinədək pakam, bax,
Göyün yeddi qatında görünürəm ağappaq.

Mən göylərə layiqəm, çünki xoşbəxt bir quşam;
Gövhərəm ki, dünyanın sinəsinə qonmuşam.

Leylaclara uduzdum qumarda bu dünyanı,
Başqa aləm gəzirəm udmağa, ancaq hanı?

Ayna edib qəlbini, həyat tapan ər mənəm,
İnanmasan da inan: Xızram, İskəndər mənəm.

Asanlıqla udmuşam mən çox usta həriflər,
Dörd ünsürə, beş hissə özüm olsam da şeşdər.

Bir fərmanla göstərdi mənə haqqı məhəbbət,
Bu rütbəni bəxş edib mənə iradə, qüdrət.

Mən bir tuti quşuyam, dünya qarşımda ayna,
Məğruram, yox özümdən qeyri bir baxan ona.

Öz əqlim nə söyləsə mənə ayna dalından,
O sözləri deyərəm mən əzbərdən hər zaman.

Ulduzdur, bütdür mənim yanımda arzu, tamah,
Xəlil kimi, onlar olmadı məndə iştah.

“Nəbüdül-əsnam” ilə düz yol tapmasam əgər,
“La hübbül-afilin”ə ürəyim olmuş rəhbər.

Xanənişin olmaqda ənqaya nisbətim var,
Vəhşi divlər önündə Rüstəm-Zal qüvvətim var,

Şirvanın şairləri vursa da kinlə eyham,
İraqdakı şairlər alır nitqimdən ilham.

Xalqın payına düşmüş fəqirliyə getmişəm,
Samın atdığı Zalı mən sərkərdə etmişəm.

İt qılıqlı adamlar həqir saysa da əgər,
Aslansifətlər içrə mənəm dünyada gövhər.

Çox yüksəkdir Hümmətim xaqanlardan, şahlardan,
Xaqani şöhrətimdən işıq alır bu cahan.

Ürəyimin barıdır bu iftixar, bu qürur,
Yoxsa mən bu cahanı dolanardımmı məğrur?!

Fələk nayib istədi, dedi: “ – Xələt, minbər al!”
Düşdü mənim gözümdən o gündən sərvət, cəlal.

Mən kiməm ki, deyirsən mənə fövqəlbəşərsən?
Tac qoymayıb başıma mənim dünya əzəldən.

Bu əsilsiz cismimi canlı yox, sehr et güman,
Od deyiləm, küləyəm, əsər yox varlığımdan.

Daim dəyişən odam, nur salmışam cahana,
Mən ilk Həməl bürcüyəm, qalxmışam kəhkəşana.

Ulduzların, fələyin şəri, vəbalı məndə,
Sayılıram odur ki, mən faydasız, şərməndə.

Əhli-Əli də olsam, Yəhuda məzhəbəm, bil,
Havadan yaranmışam, qara torpaqdan deyil.

“Leysə min əhlik” – deyə, mən anadan olanda,
Əqlim mənə öyrətdi bu sözü bircə anda.

Dörd tərəfin dəryadır, cəzirədə təkəm mən,
Mümkün deyil qorxusuz keçmək odlu körpüdən.

Mənim zəif bədənim cansızdır, tükə bənzər,
Ənlik-kirşan misalı tezliklə solub gedər.

Dostamsa da haruta, yarıyam Bərbətzənin,
İlanıyam Zöhhakın, dəmiriyəm Gavənin.

Allahsız məktəbində oxudum küfr dərsi –
Ki, “La mövla ləhüm”dür yazımın ilk kəlməsi.

İnanmıram Kəbəyə, bütpərəstəm mən, ey quş!
Daşa bas ki, Kəbəni mənim əlim uçurmuş!

Bir möminəm desəm də, aydındır gün tək haman –
Ki, yalançı səhər tək dilim danışır yalan.

Üzüm tavus olsa da, içim bənzər ilana,
Mən göstərdim, xülasə, cənnəti kor şeytana.

Qapdım Məryəm çadrasın, utandırdım Zəhranı,
Töhmətə mən salmışam Həcər ilə Həvvanı.

Hüma kim az yeyən, təmiz sanırlar, əfsus,
Mənim təki yeyimcil yox zinakar bir xoruz.

Nə Allah, nə Quran tanımadan aləmdə,
Məşğulam mən ilboyu əlimdə odlu badə.

Hamiləyəm mən oda, olsam da boz bir dəmir,
Nəfsim dəvəquşudur, dəmir yeyir, od yeyir.

Abidəm, Yəhya deyil, Brəhmən dinindənəm,
Şairəm, Həssan deyil, Ləbidə nisbət mənəm.

Müqəssirdir söylədim Əbül-üla, Mübarək,
Həfsətitək mənəmmiş dini pozan, edən şəkk.

Çörəyimi yeyirəm, mən həmişə zəhərlə,
Acıyam ki, acıyam, yuyunsam da kövsərlə.

Özüm zahidlərin müridi saysam da mən,
Mənim min sehrkarlıq, cadu gəlir əlimdən.

Məğrurluq göstərsə də iradəm, əzmim mənim,
Çox şeirdən gözəldir hər sözüm, nəzmim mənim.

Eşşəyimin muncuğun, elə qanmazam ki, gör,
Zənn edirəm göylərin əşrəfidir, dürrüdür.

Zəriflikdən sakinəm əl-əla"çılarla,
Allah büsatı qurram, əgər qüvvətim olsa.

Məst bir filəm, başıma vururlar ki, hər zaman,
Dinc qalarsam, yadıma bəlkə düşər Hindistan.

Qıfıl kimi içim boş, həlqə tək bir gözüm var,
Odur ki, məskənimdir ehtiramlı qapılar.

İnziva girdabında qalmaq xoşdur, çünki həm –
Əqlən yüngül yelkənəm, ruhən ağır lövbərəm.

Mən ki, qəm Qarunuyam, məni rədd et saraydan,
Şər işlərdə Fironam, vurmasın tənə Şərvan.

Xaqani yox, o kişi demişkən, xəlqaniyəm,
Xoşdur ki, yoxsullarla olmuşam sirdaş, məhrəm.

Məni "Qara Xaqani" çağırır ağıllılar,
Sufilərsə deyirlər məndə bir pak işıq var.

30

## ZƏMANƏDƏN ŞİKAYƏT

Əbədiyyət qoynuna bu gündən atıram can,
Qaçıram puç dünyanın fani dəyirmanından.

Gözümü əl quşu tək bağladı zalım fələk,
Bir də qəmdən, bəladan xilas olmasın ürək.

Qırğı tək başım kiçik olsa da, gendir sinəm,
Onunçün də nə papaq, nə də don istəyirəm.

Solmuş vəfa ağağı, tökülmüş yarpaqları,
Vəfa olmayan yerdə könlümün nə qərarı?

Özgələrin kölgəsi xofa salır qəlbimi,
Vaxt olur öz-özümdən qaçıram kölgə kimi.

Vücudumun kölgəsi kəsilsə də yad mənə,
Can atıram könüldə yetəm dostun vəslinə.

Könüldə dərdü qəm çox, xoşdur mənə bu dərd, qəm,
Qaçıram ki, nə təbib tapsın məni, nə məlhəm.

Nurdan göz qamaşsa da, çəkmərəm əl günəşdən;
Tutiya əzabından qaçıram hər zaman mən.

Məni min təklif ilə ağıl salmış kəməndə,
Ondan xilas olmağın gəzər xəyalı məndə.

Səhərin dodaqları ətir yayır havaya.
Qaçıram ki, yetişsin məftun könül səbaya.

Mey içməyi gəl öyrən meyxanə sahibindən,
Meylim mey içmək olsa, ora yollanaram mən.

Sor qırx piri-muğandan mənim əhvalımı sən,
Qırx sübhümü keçirdim meyxana küncündə mən.

O yerdə dəryalarca şərab nuş eyləyən var,
Nəhənglərdən qaçıb mən o yerdə tutdum qərar.

Meyxanə səfalıdır kəhfin xərabatından,
Səfa üçün o kəhfə can atıram mən də, can!

Yeddi nəfər var orda, mən oldum səkkizinci,
Atmış məni o səmtə taleyin zülmü, rənci,

Ey saqi, badə ver sən, o Firon badəsindən,
İlandan qaçdı Firon, mən zöhd əqidəsindən.

Gizlətmə bir nəfərdən, açıq ver o şərabı,
Qaçıram mən riyadan, ki çəkməyim əzabı.

Ayır sən bir qədəhlə məni məndən və bizdən,
Həm bizdən, həm də məndən ayrılmaq istərəm mən.

Mən badədən söz açdım, sən tövbədən, sus artıq!
Qaçıram macəradan, bilsin bunu xəlayiq.

Aludəyəm şəraba, təsbeh hara, mən hara?
Qaçıram möminlərin təsbehindən kənara.

Yetər ibadətimçün bir meynənin kölgəsi,
Qoy əhli-şərə qalsın möminlərin Məkkəsi.

Məni tərif etsə də dar süfrəli adamlar,
Onların bu tərifi qəlbimi yaman sıxar.

Doldur ləbaləb olsun, dolsun mənim piyaləm.
Badəm yarımçıq olsa, can mülkümü tutar qəm.

Yox, mey deyil məramım, mey rəngli gözyaşım var,
Mənim qiymətli könlüm ucuz meydən nə anlar?!

Bax, bu gecəylə-gündüz bir itdir, rəngi ala,
Bu ala rəngli itdən qəlb istər uzaq qala.

İt qapmış bir adam tək, od tutub yansa qəlbim,
Su üçün açmaram əl saqi olarsa hər kim.

Qaçmıram işvə-nazdan, cismim dəmirdir, ancaq –
Qaçıram mən onunçün ahənrübadan uzaq.

Məni gah yad incidib, gah dostum, gah həmrahım,
Onlardan əl üzmüşəm, bir Allahdır pənahım.

Qorxuram gah Məsih tək, mən də yəhudilərdən,
Gah da hərzə keşişdən həzərlə qaçıram mən.

İnsanların adından elə qorxmuşam ki, ah!
Məndə dəhşət yaradır hətta o mərdüm-giyah.

Əsanın görkəmindən qaçaraq deyər ilan:
“Qaçıram, məndə əsa görkəmi olduğundan”.

Boynumu vurduğundan arzumun kəskin əli
Qaçıram əldə qılınc mən görəndə əcəli.

Qaç dedilər oğlağa, oğlaq gəldi zinhara,
Qəssab dalda durarkən, dedi, qaçım mən hara?

Bax, bütün hisslərim şahanədir binadan,
Qaçıram, yalnız qorxu adlanan bir gədadan.

Kamalın öz əlilə əkilmiş bir dənəm mən,
Qaçıram ömrü əzən dəyirmanın əlindən.

Bir suya bənzərəm mən, altında od var kimi,
Torpağın töhmətindən qaçıram ruzgar kimi.

Çox misana çəkib mən gördüm ki, puçdur cahan,
Qaçıram oda doğru baltanın qorxusundan.

Onun ağ əllərindən mənim bəxtim qaradır,
Qaçıram bu qocadan, bilmədən yol haradır?

Fələyin dəhşətindən mələyə sığınır can,
Qaçıram oda doğru baltanın qorxusundan.

Bəxtiqarə olmağım aydındır günəş kimi,
Qaçıram ki, gecəyə qatım qara bəxtimi.

Odla qılınc gətirsən ömrümə son qoymağa,
Qaçaram nə qılıncdan, nə də oddan uzağa.

Bir sazda bir sədalı, bir səsli nəğmə çal sən,
Qaçıram üç sədalı setarın nəğməsindən.

Dördlə üç sərhədində tükənməz bir savaş var,
Qaçıram bu savaşdan, mənə təkdir havadar.

Ayağım çox yaman uduzdum bu qumarda,
Başımıı ayaq edib qaçıram bu diyardan.

Xəyalət zəngirində sızlayır könlüm hər an,
Qaçıram bu könüldən qopan bağırtılardan.

Qalacağam varlığa bağlanıb nə vaxtadək?
Baş götürüb bu yerdən daima qaçam gərək.

Meylim yox, bu dünyaya göz açdığım saatdan,
Gəlmişəm bu qərara, ki qaçam kainatdan.

Məkan dardır, iki rəng vardır bizim zamanda,
Qaçıram bezdiyimdən, yox etibar cahanda.

Könlümdəki diləklər sığmaz heç bir diyara,
Qaçıram göylərin də hüdudundan kənara.

Yandıraram cahanı istəsəm bir ah ilə,
Məcburiyyət üzündən yaxınlaşdım şah ilə.

Yerdəki yeddi kənddən baş alıb qaçıram mən,
Qaçıram hətta göydə olan səkkiz şəhərdən.

Bu yeddi mütəkkəli yerdən uca gör məni,
Qaçıram ki, görməyim yerdən doğan kölgəni.

Nə İsa kimiyəm ki, qaranlıq xərabədən –
Dördüncü göy qatına qol-qanadsız uçam mən;

Nə Musa kimiyəm ki, edib zindandan təlaş,
Qaçıb səkkiz behiştin hər birinə çəkəm baş.

Gecəyə gündüz olmaz vəhdət yolunda əsla,
Qaçıram bu gecəylə gündüzdən ehtiyatla.

Qovur bayquş tək məni dəyirmançı hər yana,
Yeddiqat dəyirmanın yönəlmişəm damına.

Dosta ölməzlik yarar, aşiqə fani olmaq,
Qaçıram ölməzlikdən, belə bir aşiqəm, bax.

Məqsəd – var olmaqdısa, yox olaram mən onda,
Qaçaram öz-özümdən bu yoxluğun yolunda.

Yox olaram o mütləq varlığın sayəsində,
Qaçıram çatmaq üçün mütləq yoxluğa mən də.

Altımdakı köhlənə tərsinə vurmuşam nal,
Qaçıram ki, bu məkan darısqaldır, darısqal.

Saysız ulduz görürsən göylər çadırında sən,
Qaçıram ulduzların mənhus əlamətindən.

Vəba evidir bu çərx, qaçmaq gərəkdir ondan,
Qaçmaq gərək dünyanın dövlətindən, malından.

Könlümdə namuradlıq qovğaya başlayırkən,
Razılıq hasarına tərəf bərk qaçıram mən.

Bu vaxtadək dünyaya əta idi niyazım,
Qaçıram o ətadan, niyaz mənə nə lazım?

Tamah kişi heyzidir, boynunu vurmuşam mən,
Qaçmışam, qaçmaqdayam səxa sahiblərindən.

Dovşan heyiz görməkdə bənzəsə də qadına,
Mən pələngəm, yaraşmaz heyiz pələng adına.

31

## DÜŞMƏNLƏRİ MƏZƏMMƏT

Bəd niyyətli adamların yaxşılığı olar bəd,
Yalanlarla fəxr etməyi onlar etmişdir adət.

Doğruluqla yox işləri, ataları bilinmir,
Nə Adəmdən törəmişlər, nə İsadan, – budur sirr.

Bu dünyada rəhbərlərə rahib olur hər biri,
O dünyada axar su tək dəyərsizdir işləri.

Arıların quraq ildə düzəltdiyi şan təkin,
Onların da beyinləri bomboş olur bil yəqin.

Bədənləri qum tək ağır, başlarında yel oynar,
Məhşərdəki tərəzi tək yüngülməzac olurlar.

Bağlarında, Nuh nəsli tək, ağacların yox barı,
Sevincləri bir qarının təndirinin ruzgarı.

Məscid evi onlar üçün olmuş uşaq beşiyi,
Həm yatırlar orda, həm də bulayırlar hər şeyi.

Paxıllıqdan qızdırmaya, titrətməyə düşüblər,
Onlar mənim paltarımı geyinsələr yox zərər.

Bax, onların boş həvəngə bərabərdir hər biri,
Sürtülməkdən xarab olmuş, getmiş tamam üzləri.

Şüşəboğaz bu axmaqlar o göy rəngli xeymədən
Sürahi tək başlarına ilmək taxıblar nədən?

Açar ilə qıfıl kimi erkək-dişidir onlar,
Tutduqları fəna işdən bağlılıq hasil olar.

Evlərindən çölə çıxmaz yazdıqları şeirlər,
Bu şairlər rədd olunan dəvətlərə çox bənzər,

Dadsız bir mey hasil olar sözlərinin suyundan,
Bu mey qəlbi elə möhkəm soyudar ki, donar qan.

Doğmaz quru təblərindən təravətli şeirlər,
Onlar suda qərar tutan nilufərə bənzəyər.

Yazdıqları xürafata qataraq söz sehrimdən,
Bu-Ləhəblə, Bu-Türabı ayırmaz bir-birindən.

Göy təşt altda kordur onlar, onunçün də uzaqdan
Sanırlar zər afitabi-zərəfşan.

Belə eşşək adamların cahilliyi deyil az,
İsa da öz mətbəxindən onlara pay ayırmaz.

Aşağıda yer verirlər mənə, xoşdur bu hesab,
Onlar neftdir, aşağıda qalar mənim tək gülab.

Üzdə əgər balıq kimi lal olsa da hər biri,
Lakin dalda ilan kimi zəhər tökür dilləri.

İlhamımız xəzinədir al kükürdə dünyada,
Əzabları bir civədir titrəmə-qızdırmada.

Niyə gərək mən onlara cavab verəm, asiman
“Hirsinizdən ölün” deyə cavab verir hər zaman.

Mən onların sözlərini kəskinlətməsəm əgər,
Dillərinin küt qılıncı sanma ki, bir tük kəsər.

Cəbrayıldan qanad alır ürəyimdən uçan ox,
Qartalında qanadına məndə bir ehtiyac yox.

Onlar özü qidalanır mənim meyvələrimdən,
Qara qarğa əncir yesə, heç təəccüb etmə sən.

Çörək üçün gen qapımı döyür onlar, doğrusu,
Dən verməsəm, tikdikləri dəyirmanı yıxar su.

Tülkü kimi, şir ardınca gəzir onlar hər zaman,
Gəzirlər ki, pay alalar şir ovlayan şikardan.

Cəlalımın Bijənini quyuya da salsalar,
Səhər ahım düşmənlərin canlarına od salar.

Kaman atan Rüstəm mənəm bu təbiət içində,
Əfrasiyab qoyun yatsın əzab, qəflət içində.

Səs-küyündən sən onların qorxma heç də, Xaqani,
Bax, onların buludunda ildırım, yağış hanı?!

Gizli məna gəlinini bəzəyən məşşatə tək,
Dara sözün zülflərini, qəlblərinə bir dağ çək.

Fikir, xəyal odundan tutuşub canım yanıb,
"Allah-Allah" deməkdən axır dəhanım yanıb.

Fələk mənim sinəmə elə bir od vurub ki,
Təkcə ürəyim deyil, bəlkə hər yanım yanıb.

İşlərimi zay etdi mənim bu can yanğısı,
İnadından fələyin ruhi-rəvanım yanıb.

Ahımın şöləsindən xalqın gözü önündə
Pərdəm yanıb, faş olub sirr-nəhanım yanıb.

Mən dövlət axtarırdım, kasıblıq qismət oldu,
Dedim: – Odsan, bu sözü deyən zəbanım yanıb.

Görmüşsən od yandırar necə nazik ipəyi?
O cür qəm şimşəyilə mənim ərganım yanıb.

Şerim əgər od salar qəlbə, səbəb odur ki,
Gövhər saçan xatirim, təbi-rəvanım yanıb.

Söz mülkünün naibi Xaqaniyəm, həsəddən
Göylər mənə qəhr edib, alışıb canım yanıb.

32

Şirvanda olsaydı sirdaşım əgər,
Fikrimə bir səfər gəlməzdi, inan.

Olsaydı hörmətim Təbrizdə hərgah,
Məskənim olmazdı, əlbəttə, aran.

Arranda olsaydı qiymət verənim,
Başqa bir aləmi etməzdim məkan.

Nə qədər çalışdım, çapaladımsa,
Mənimlə olmadı fələk mehriban.

Zəhmət çəkdimsə də arzu yolunda,
Taleyim gülmədi üzümə bir an.

Ciyərim həsrətlə qana döndüsə,
Taleyim olmadı əlimdən tutan.

Yoxluq pərdəsinə büründü istək,
Yalvardım, girmədi əsla qapımdan.

Dünyaya sığmayan hümmətim vardı,
Ona dar gələrdi hər iki cahan.

Arzum, istəklərim dərya qədərdi,
Bir az da olmadı qarşımda əyan.

Ruzinin suyu da hər gün çeşmədən
Ancaq iki qətrə oldu nümayan.

Könlümün bir quru yarpağı yoxdu.
İndisə qalmışdı gör necə üryan.

Əlimi üzmüşəm bolluqdan, axır,
Dövlət tarlasa da bar vermir əlan.

Mənə verilənlər olmalı layiq,
Layiq olanı da vermədi dövran.

33

Zəmanədə axtarma rahatlıqdan bir əsər,
Umma ki, dünya sənin dərdinə dərman edər.

Qəm odunda yan, kül ol, yaddan istəmə məlhəm,
Öz dərdinə özün qal, bilmə kimsəni həmdəm.

Çərxin qumar evində hərif tapılmaz sənə,
Dəhrin karvansarası düşərgə olmaz sənə.

Nəhəng udsa da səni, haray salma, səbr elə,
Boğulsan da, girdabda əl uzatma sahilə.

Sədaqəti, vəfanı məgər sevirmi dövran?
Gözləmə ki, o səni eylər xilas bəladan.

İçmə, qədəh tutarsa əlində müflis fələk,
Süfrəsindən bu xəsis dünyanın alma çörək.

Yanıb ümid xərmənin külə dönsə də əgər,
Göz dikmə ki, ruzigar zərərini ödəyər.

Razı olma dünyada hamin olsun padişah,
Suda boğul, aparma naqqa balığı pənah.

Vermə dünyaya könlün, o qiymətli gövhəri,
Qırmızı kükürd deyil, o gövhərin dəyəri.

İlahiyyat ərşinə səni izlət çatdırar,
Bundan yaxşı nərdivan o məqama harda var?

İnsanlara dikmə göz, hümmət sənə arxadır,
Göz çək novdan suyundan, sənə layiq dəryadır.

Şadlıq xəzinəsinə ağalıqla yiyələn,
Ruzi verən mələyə heç vaxt ağız açma sən.

Qənaətin vəsfində dörd kitab oxumusan,
Tamahkarlıq dərsini başlama əlifbadan.

Varlanmağa çalışma, yoxsulluğu et şüar,
Yelqovana baş əymə, külək sənə at olar.

Könülün boğazına şərab tökmə kuzə tək,
Sürahi tək, yetənə xidmət etməkdən əl çək!

Acından ölsən belə, xəsislərin önündə –
Ondilli sünbül kimi gedib əyilmə gündə.

Sümük qapar pərilər insanların əlindən,
Mələk kimi qoxu çək, sümüyə göz dikmə sən!

Qoy ürəyin ağrısın, qızdırmadan cana gəl,
Gülqənd üçün, nar üçün hər nakəsə açma əl!

Qızdırmanı kəsməyə qarğı lazımsa əgər,
Kəs tamah barmağını – qarğını əvəz eylər.

Kamalın, əqlin ki var, nə zor axtar, nə zər gəz!
Cəhrəçinin ipliyi bafta üçün gərəkməz.

Ehtiyacın darğası tabe ikən Qubada,
Mülkündən qorxma, demə: – Tuğan gəlsin imdada!

Dostlara bel bağlama, tək yaşa, azad yaşa!
Həmdəm axtarıb açma ağız qohum-qardaşa.

Yusifin əhvalını hər zaman yad edərək,
Aciz qalsan, istəmə qardaşlarından kömək.

Zaman sərgərdan etmiş səni, məkan – bağrı qan,
Umma fərəh, fəraqət nə məkan, nə zamandan.

Dörd yol ayrıcı dünya vəhşətlə dolmuş daha,
Ünsiyyət xəlvətini axtar, sığın Allaha.

Bu ərşin quşu səndən əgər tələb etsə dən,
O dəni topla ancaq göylərin sünbülündən.

Ey Xaqani, ümidin ipini kəsmiş zaman,
Ömr ipini kəssə də, aman istəmə ondan.

34

İndi ki, yer üzündən mərhəmət olmuş nihan,
Könül, sən də vəqt ikən hazırlaş, köç dünyadan.

Ölüm darvazasının qabağında çardaq qur,
Bacü xəracı verib, gözləmə heç bir aman.

Dünya bağında yaza qalmadı bir etibar,
Ömrünü yarpaq kimi soldurar axır xəzan.

İnləmə bu cahanda eyşü işrət naminə,
Salma həbsə ruhunu rahatlanmaq üçün can.

Yüksəkdə qanad çalan qartala yaraşarmı,
Yerdə mətbəx bacası üstə qura aşiyan.

Uşaqsan, bu yer əhli səni bahar zənn edir,
Bax, tamaşa üçündür, bil ki, vəfasız cahan.

Qəlb dərmanı istəmə sən ümmid təbibindən,
Təbaşirlə sümükdür dərdinə, bil ki, dərman.

Uyma dünya rənginə, onda gənclikdən yox iz,
Qocanı heç edərmi ənliklə kirşan cavan?

Acı sudur, üstündə buzdan körpü salmışam,
Aləm zərli səqfdir, nərdivanı işıqdan.

De, necə şəfəq saçar gün qaranlıq qəlbinə,
Xızrın axıb keçərkən çeşmə suyu başından?

Nə vaxt qurtaracaqsan fələyin qəzəbindən –
Ki, göy səma altında rahat keçə güzəran?

Yoxdur yaşıl yelkənin görən yaş olduğunu,
Çox gəmilər batırmış girdabında bu ümman.

Ey həkim! Nə anladın fələyin gərdişindən,
Atəşpərəstsənmi de, ki odla oynayırsan?

Rəngi od üfləməkdən qızaran atəşpərəst –
Qara üzlə gələcək qiyamət günü, inan.

Bir günbəzdir bu səma, yer onun döşəməsi,
Yoxsa nücum elmindən xəbərin, bunu bil, qan!

Yoxsulluq üz verdikdə sufilərə yaxınlaş,
Yoxsuldan şad olurlar, varlıdansa pərişan.

Get, onlardan xəbər tut, yoxsulluq gör nə şeydir,
Əsəri ki, ən yaxşı müəllif edər bəyan.

Yoxsulluqda taparsan əbədilik nəqşini,
Ondan başqa nə varsa dünyada puçdur, inan.

Cahü cəlal arzusu hələ ki, qəlbindədir,
Yoxsul deyilsən hələ verməkdə sən imtahan.

Qıcanda dişlərini qara geyimli fəqir,
Ağ geyimlinin varı olacaq yerlə yeksan.

Xoşdur guşənişinlik, zorla zərə uyma gəl,
Qəm yemə dövlət üçün, yoxsulluqdar şərəf, şan.

Şahlıq tacın var ikən nə lazım həsir papaq?
Sənin Bərbəd sazın var, qoy tütək çalsın çoban.

Cahanda bir kimsədə insanlıqdan əsər yox,
Əgər varsa, di gəlsin, əslindən versin nişan.

Harda bir əhl adam var – alçaq da onunladır,
Bəli, qarışmış artıq mal ətilə zəfəran.

Saf qızıl yer tapıbdır qatıran palanında,
Kafur dənəsi artıq seçilməyir darıdan.

Püxtələşdimi insan, soltandır insü cinnə,
Hələ ki, püxtə deyil ya vəhşidir, ya şeytan.

Nə qədər arpa çiydir, eşşəyə yemdir, fəqət –
Bişdikdə şərbət kimi edilməkdə nuşi-can.

Ruzigar ətəyindən kəramət gözləmə gəl,
Ey Xaqani, əl götür mövhumi xülyalardan.

Tuğan fərmanlarına, təxtü tacına baxma,
Yoxsulluq yazısıdır çalmandakı bu fərman.

Bir şerində dediyin o hikməti xatırla:
“Can verərəm təbimə, ona gərək deyil nan”.

Sənəti tacidarısan, odur yerin başdadır,
Başqaları qapının ağzında salmış məkan.

İraq əhli sözündən ərəq etmişdir sənin,
Çatmış şöhrətə, xeyrə adınla yurdun Şirvan.

Ona görə xoş gəlir şerin bu vəhşi yerdə,
Şəbnəm içib ətirli güllər açıb al-əlvan.

Yenə də atan, anan xeyirxah övlad kimi,
Çağırmadadır səni, bax, ey atılmış oğlan!

Tərpən, nədən yer kimi tərpənməzsən belə sən,
Tərpən ki, dünya bir gün uçub olacaq viran.

Qəlbin həsrətlə qaynar, tıxanıbdır boğazın,
Füta sürahısı tək etdi səni bu cahan.

Qövm də müxtəlifdir qovmuş hərfləri tək,
Üzü ağ, qəlbi qara eyləmiş onu dövran.

Siçan kimi yer qazan, pişik tək hiyləgərdir,
Hörümçək kimi ancaq qan içməyə tor quran.

Dinə inanmasan da, başçısan dindarlara,
Atəşpərəst kahin tək dəvət yerindir damqan.

Məhəmməd Əbu-Cəhdi xəcil etdiyi kimi,
Onları xəcil etsin səndəki şirin zəban.

İlahi, Xaqaninin qəlbi xeyli sınıqdır,
Sağalt fəzilətinlə, ya çarə ver, ya dərman.

Qəbul etməsələr də bəziləri, məni sən –
Qəbul elə ki, olsun qəlbim bir az şadiman.

35

Nuş edərəm fələk qəmin ağlamadan, yazıq mənə!
Çərxi-fələk kəməndinə bağlı qalan, yazıq mənə!

Odlu günəş doğar, sərin sübh nəsimini qovar,
Könlüm alovlanar, fəqət çəkməm aman, yazıq mənə!

Qurdu cəfa ilə fələk köksümün üstə körpünü,
Mən bu su rəngli körpünü qırram haçan? Yazıq mənə!

Qəlbdən arzu rişəsin təmin belilə kəsmişəm,
Can yoluma əcəl töküb sanki tikan, yazıq mənə!

Yoxluğun arxasınca mən qaçmadayam külək kimi,
Mən yoxam, amma hər vücud əndən əyan, yazıq mənə!

Yel necə köynəyin gəzər dövrəsinə, o yel mənəm,
Köynəyim oldu varlığa təkcə nişan, yazıq mənə!

Ağzıma hər qədər gələr abi-həyat təbdən,
Ağzıma od təpər yenə ahü fəğan, yazıq mənə!

Yanğımı əql çeşməsi söndürüb, indi qorxudan –
Əql bulağına atım daş bu zaman? Yazıq mənə!

Süfrəmin artığını yeyər özgələri, rəvamıdır –
Nakəsə əl açıb, olam mən pay alan? Yazıq mənə!

Kəbədəki qara daşı öpmüşəm, indi mən necə –
Nakəsin ağ əlin öpüm? Çıxmadı can, yazıq mənə!

Tacım ilə günəş kimi torpağı nura çulğaram,
Lüt gəzərəm özüm, batar nura cahan, yazıq mənə!

Dostlarımın həyatına mən süpərəm, əcəb budur –
Düşmən ölərsə, həm mənəm mərsiyəxan, yazıq mənə!

Harda qalıb qılınc, kəsə başımı, ta olam xilas,
Dərdli ciyər edib məni paslı suhan, yazıq mənə!

Öz vətənimdə bir güləm, dövrəmi çulğamış tikan,
Oldu canım həmişəlik odda yanan, yazıq mənə!

Gəlsə kərəm sözü dilə gözlərim ağlayar mənim,
Cismimi qanda qərq edər əşki-rəvan, yazıq mənə!

Ağladı qan, kərəm gözü, gör dedi qarə bəxtimi,
Yasəmənəm, qırıb tökür badi-xəzan, yazıq mənə!

İnlədi bu cahan, dedi: – Yox bu çəməndə gül, çiçək,
Verdi kərəm əli sənə qum, ye, dolan! – Yazıq mənə!

36

Mal və şöhrət sahibidir bu gün alçaq adamlar.
Nəfsə əsir olanların bazarıdır bu bazar.

Bu ötərgi qəm evində varsa şadlıq əsəri,
Onlar olar şad ki, yoxdur insanlıqdan xəbəri.

Tərk et dünya məclisinin o yuxarı başını,
Alçaqlardır o məclisin yeyən dadlı aşını.

Yaxşı adam pislik görür bu dünyaya gələndən,
Neyləsin bu dünya, ancaq pislik gəlir əlindən.

Çalış, alçaq adamlardan tikə alma dünyada,
Onlar səni rüsvay edər, gedər hörmətin bada.

Üzdən parlaq olsalar da, içləridir qapqara,
Ayna adı vermək olar bu cəhətdən onlara.

Qanmazların əlindədir var-dövlətin hamısı,
Sanki İsa süfrəsinə qonub eşşək arısı.

Namərdlərlə xadimlərdir tutan bu gün cahanı,
Bu dövrandır xacələrlə xəsislərin dövranı.

Ey Xaqani, pak duyğuyla bəzə hər bir sözünü,
O dünyada bir məqama çatdır barı özünü.

37

Kim rahatlıq nişan verər? – verməz,
Kim bəladan aman verər! – verməz.

Bircə azad nəfəs dilərkən mən –
Ruzigarım bir an verər? – verməz.

Qəlbimizdə aləm düyünləndi,
Çərx onu bir açan verər? – verməz.

Bir kəs, axır, ürək qəmi dağıdan –
Bir xeyirxah nişan verər? – verməz.

Axırı odlu ahımın gəmisi –
Sahilə doğru yan verər? – verməz.

Dalğalar qırsa gəmimi, bir kəs –
Yelkənə bir təkan verər? – verməz.

Axtarır ədli göydə Xaqani,
Haqqını asiman verər? – verməz.

38

Qəlbimdəki bu dərdimi dərmanə satmaram,
Sağlıq da üstəlik verələr canə, satmaram.

Dərman məni əritdi, fəqət dərd bəslədi,
Xoşdur bu dərd-qəm, onu dərmanə satmaram.

Ey xacə, biz əbəs yerə bazarə gəlmişik,
Sən şadlığı, mən isə qəmi anə satmaram.

Dərd ilə könlümü yaşadan müştəri hanı?
Bu sirri mən dodaqları xəndanə satmaram.

Ney tək, dodaqlarından alıb sirri dostların,
Ol sirri həmdəmim olan insanə satmaram.

Dilsiz neyəm, gözümdən olar faş sirlər,
Başqa yol ilə onları cananə satmaram.

Məhv olmuşam bu məhvdədir varlığım mənim,
Bir böylə yoxluğu iki yüz canə satmaram.

Kəskin qılınc hanı ki, verə başıma nicat?
Mən ol qılıncı, tac verə, sultanə satmaram.

Zəhrini nuş edib o qılıncın gülə-gülə –
Balda dəyişsələr, onu yüz şanə satmaram.

Əmmaməmi qadınlar üçün çadra eylədim,
Adəm geyən o xələti-əlvanə satmaram.

Bəhramə şah verdi ləçək, bir telin onun –
Rüstəm geyən dəbilqəyə, xüftanə satmaram.

Yanmış ciyərlərimə olan örtü xam gönün –
Bir zərrəsin yüz ətləsi-tabanə satmaram.

Hər həftə bir gecəm ki, keçər yar ilə mənim, –
Altı günü əvəz verə biganə, satmaram.

Şah xidmətindəsənmi? – soruşdun, dedim ki, yox,
Bir an azadlığı şaha, xaqanə satmaram.

Xaqani istəməz verə alçaqlara könül,
Bələmdə kəhf itini o şeytanə satmaram.

İsanın iynəsini qara qəlbə vermərəm,
Məryəm telini pərdəni yırtanə satmaram.

39

Var idi mənim vəfalı yarım,
Xoş keçdi onunla ruzgarım.

Yıxdı evimi bu bədnəzərlər,
Soldu mənim bu bağım, baharım.

Varlı, bərəkətli, bollu süfrəm,
Oldu nə yaman bu gün güzarım!

Oynardı əlim xəzinə ilə,
Yoxdu yaşayışda intizarım.

Zövcəm var ikən şirin gülüşlü,
Gözyaşları oldu indi yarım.

Mən ki, belə kimsəsiz deyildim,
Varımdı mənim bir həmfikarım.

Yar yox, o bir ömrə yadigardı,
Var idi, demək ki, yadigarım.

Bir sirrimə kimsə olmaz agah,
Sirdaşdı mənə o gülüzarım.

Qəm qorxusu bilməyirdi könlüm,
Qəmlər dağıdandı qəmgüsarım.

Qəmsizliyimin qəmin çəkirdim,
Əldəydi mənim hər ixtiyarım.

Şadlıq atını çapardım onda,
Artırdı o yarla bu vüqarım.

Əsdi nə zaman bu qəm xəzanı,
Soldu bu gözəl könül baharım.

Dərd şaxəmi kəsdi, qəm kökümü,
Qaldı nə köküm, nə bərgü barım.

Bir ney kimi, öz odumla yandım,
Var idi könüldə çün şərarım.

Hər bir kəsə söyləsəm, inanmaz:
Olmuşdu mənim də bir nigarım.

Yarsızlığımı görüb düşündüm:
Varmış görəsən, mənim də yarım?

40

Bu dünyanın zatında, bax, heç insafdan yoxdur əsər,
Rahatlıqçün, səadətçün yaranmayıb sanki bəşər.

Bu aləmdə dərdü qəmdən azad, rahat yaşamaqçün
Zəmanənin anasından doğulmamış bircə nəfər.

Fəlakətin dalğasından təkcə onlar qurtarar ki,
Hələ varlıq dənizinin limanına gəlməmişlər.

Kim içmişdir zəmanənin qədəhindən bir şərbət ki,
Öldürücü zəhərlərlə olmamışdır o bərabər?

Söylə, necə qorusun ki, aləm səni bəlalardan,
Onun özü bəlalardan qorunmaqçün qalxan gəzər.

Fələk ömür sarayına lağım atan bir oğrudur,
Əbəs yerə əyilməmiş onun boyu kaman təhər.

Asudəlik axtarma sən, mavi çadır altında gəl
Aləm bilir, olmamışdır bir kimsəyə bu müyəssər.

Döz aldığın yaralara, çünki bütün insanlara
Yara vurar, məlhəm verməz mürüvvətsiz bu fələklər.

Matəmsəra yaranmışdır, bax, bu aləm, anla bunu!
Sən fələyin mavi rəngli paltarına sal bir nəzər.

Ey Xaqani, bu dünyanın vədinə sən qulaq asma!
Qayda budur, vəfasızın vədəsində olmaz kəsər.

41

Neylim, zəmanə dərdinə məlhəm tapılmayır,
Dərmançün axtarır bütün aləm, tapılmayır.

Heç bir ürək bu göylərin altında bir zaman
Şümşad kimi tazəvü xürrəm tapılmayır.

Hər kim otursa pəncərəsində bu göylərin
Cəngi-zəmanədən o müsəlman tapılmayır.

Yoxdur sevinc, ol qəmilə həmnişin, könül!
Cəmşid, qoşul bu matəmə, xatəm tapılmayır.

Əfsus, ömr sazını kökdən salıb əcəl,
Matəm yaxınlaşır, amma neyi-matəm tapılmayır.

Xaqani, ol nəfəs ki, həyatın qənimidir,
Bəsdir, sinəndə qəbrə göm, həmdəm tapılmayır.

42

Günəşə bənzəyən bir oğlum vardı,
Basdırdım mən qara torpağa nagah.

Anası dözmədi oğul dərdinə,
Əlimlə dəfn etdim onu da, ey vah!..

Ulduz tək bir qızım var idi, onu
Qabil bir oğlana verdim bir sabah.

Qızımı damadə verərək, dedim:
Qızılı torpağa tapşırıram, ah!

Mən qaldım, bir də ki, Əbdul Məcidi,
Bir Allah qoy olsun ona da pənah.

Yoxsa da Şirvanda havadarı heç,
Bəsdir yar olarsa ona bir Allah.

43

OĞLUM RƏŞİDƏDDİNİN ÖLÜMÜNƏ

(Tərkibbənd)

Dərd bir dərd deyil, yazmaq üçün dəftər açım,
Ömr çatmış başa, mümkün daha olmur pər açım.

İki ciddi gileyim vardır əlindən fələyin,
İki dünyaya sığışmaz, hər birini gər açım.

Yolçular sübh fərəhlə çatar öz yüklərini,
Mən şikayət yükümü sübh gözümdə tər açım,

Sarmaşıq tək sarınıbdır canıma dərd-bəla,
Mən bu candan gecə-gündüz necə möhnətlər açım?!

Həlqə tək sardı məni, ah, mən o həlqə ilə –
Döyüb ümmid qapısın istəyirəm çənbər açım.

Köynəyim oddur əgər, üst geyimim gözyaşıdır,
Can hövlilə gərəkdir yaxamı yeksər açım.

Səbr əgər istəsə də indi ciyərparəsini,
Səbirsiz bu ciyərin dərdini kim dinlər, açım?!

Bir vəfa əhli hanı, qəlbimə təskin olsun,
Qəm çəkən dostum hanı, ta ona mən qəmlər açım?!

Can telim bir düyüm olmuş qısalıb barmaq tək,
Qalmayıb məndə hünər dırnağı, müşküllər açım,

Vurmaram təbli qürur ilə damında hünərin,
Qəm divarını gərək aşmaq üçün şəhpər açım.

Yuyuram qanım ilə dam-divardan suvağı,
Mən bu hal ilə rəvadırmı üzə sellər açım?

Döşənibdir yola qəmlər tikəni, mən naşad;
Əjdaha verməz aman-xəznə tapıb gövhər açım.

İstədim qırğı kimi bir də şikarə qalxım,
Sam yeli vermədi möhlət mənə artıq pər açım.

Açmaram bir daha dünyaya baxan gözlərimi,
Kor olum, gözlərimi bir də cahanə gər açım.

Qeyrətimdən tikərəm gözlərimi əqlim ilə,
Çarə yoxdur ki, gərək almağa ibrətlər, açım.

Bağladım yeddi qapı xalq üzünə aləmdə,
Ta durub yeddi qatında fələyin azər açım.

Gözümün nurunu söndürdü yaman bəd gözlər,
Nə rəvadır gözümü, görməyə pis üzlər, açım?!

Qəlbi məhzun, canısa sanki dəmir Xaqani –
Yandı, kül oldu, bu dərdi kimə, ay ellər açım?!

Mən başıdaşlı necə qəbirdə qanlı kəfəni –
Oğul üstündən alıb, görməyə gül peykər, açım?

Ey təzə bədr, qaranlıqda buraxdın atanı!
Ey Ütarid, nə yaman odlara yaxdın atanı!

* * *

Firqətində, bala, bundan da betər yansın atan,
Söndü şəmin, kor olub, qüssədən odlansın atan.

Dostların çıxmaya ta qarşısına yolda onun,
Tərk edib aləmi, öz qəbrinə yollansın atan.

Çün ərəbcə, dəricə söhbətini dinləməyir,
Gözü çıxsın, qulağında civə daşlansın atan.

Qəbrinin torpağı nur ilə mina çeşməsidir,
Qəbrinin başına qurban kimi fırlansın atan.

Saf o ruhunla gömüldün, bala, torpaqlara sən,
Qana dönsün, ciyəri, qəbrini hey ansın atan.

Torpaq altında yatırsan bu gün, ey mehri-giya!
Torpaq üstündə bitən ot kimi tapdansın atan.

Yusifim, aləm üçün abi-həyatdınsa əgər,
Qurd qapanlar kimi sənsiz su deyib, yansın atan.

Gül kimi qanə boyandı dodağın, gözlərinə –
Xurma tək qan yerisin, xar ilə oxlansın atan.

Kəkliyim! Qanlı dodaqlar ilə uçdun, gözü qan,
Bir turac tək sənin ardınca qanadlansın atan.

Dərdinin güclü əli, bax, belə məcbur etmiş –
Ki, çilik barmağa dönsün, iki qatlansın atan.

Çün qəzanın əli qapmışdır əlindən qələmi,
Bir kağız köynək ilə dad çəkib odlansın atan.

Cana sən bayram idin, tərk elədin dünyanı;
Sənin ardınca əcəl Rəxşinə atlansın atan.

Hünərin canı – kamalın, gövhərin kanı – xətin,
Canımın gövhəri, sənsiz nə hünər qansın atan?!

Tabutun zinəti, zərbaf kəfənin telləri tək, –
Bükülüb qəddi, saralsın üzü, tablasın atan.

Torpaq altındasan, ağlar sənə üstündə fələk,
Fələyin dövrü kimi tərsinə fırlansın atan.

Üzdə yaşıl tətüvü, əldəki qarə xətüvün –
Həsrətilə, bala, tər xətti görüb dansın atan.

Saçının xaçı görünməz, xətüvün zünnarı,
Kaş, rahib kimi zəncirlərə bağlansın atan.

Sən kimi başqa əzizi nə olub, nə olacaq,
Ta ki, sənsiz yenə öz ömrünə aldansın atan.

Atanın canı idin, cismini tərk etdin, oğul!
O başıdaşlını nalan qoyub getdin, oğul!

* * *

Qılınc kimi tabutunu, oğul, tutdurub zərə,
Şah tacı tək qərq edərəm qəbrini mən gövhərə.

Arzulardım davatını tutduram mən qızıla,
Tabutunu zərə tutdum, ey kaş girəydim yerə!

Tabutunun narıncına axıb qanlı göz yaşım,
Bir qırmızı alma kimi narınc çarpar nəzərə.

Qələmdan tək tabutuna örtük biçib tirmədən,
Başdaşının incilərlə bəzərəm zər-zivərə.

Mişkim ilə gövhərimdir siman, ayaq torpağın,
Onlarla mən təzələrəm öz eşqimi hər kərə.

Sürtüb ayaq torpağını təsbeh kimi üzümə, –
Əl yazını təviz kimi yüksəldərəm göylərə.

Sənsiz, oğul, bağ-bağçamı, məktəbimi tərk edib,
İlk zərbəni endirirəm şerə, elmə, hünərə.

Sənə qarşı vəfasızlıq göstərdi ata yurdum,
Mən o yurdun əsasını gərək verəm sellərə.

Səndən sonra nə lazımdır mənə çadır, kaşanə?
Od vuraram eyvanıma, dolandığın evlərə!

Naləm ilə parçalaram ev əhlinin qəlbini,
Var-yoxumu səndən sonra sovuraram yellərə.

Anan qırdı qələmimi, qəmin mənim belimi,
Verdim matəm paltarını qırılmış bir kəmərə.

Ayın axır gecəsi tək çulğanmışam qaraya,
Bəs haçan mən kəfən geyib, oxşayaram qəmərə?

Gecə keçər, sübhə kimi axıdaram jalə mən,
Ta gözümün qarşısında ağ tirə ritə verə.

Ey günəşim, əldə çıraq axtarıram səni mən,
Bu çıraq da ahım ilə sönər, çıxmaz səhərə.

Mənim sərin ahlarımla sönən hər bir çırağı –
Ciyərimdən qalxan atəş hər an tutar şərərə.

Qədər sənin matəmində məni salmış odlara.
Mən də gərək bu dünyanı zindan edəm qədərə.

Göz yaşımdan piyadam var, sərin ahdan səvarım,
Zəfər çallam onlarla mən fələkdən qeysərə.

Günüm qara, paltar qara, qapım üstü qapqara,
Bunu görüb bürünmüşdür fələk qara məcərə.

Sənin qəmin aşıladı növhəgərlik ruhuma,
Matəmində döndüm, oğul, bir yeni növhəgərə.

Ağlayanlar ətrafımda sıra ilə düzülmüş,
Söylədiyim mərsiyələr düşmüş artıq dillərə.

Arzum, ömrüm, cavanlığım bada getmişdi, ancaq –
Oğul dərdi üstün gəldi bütün başqa dərdlərə.

Uca sərvim, bilmirəm, mən nə əsər qaldı səndən,
Sən dünyadan köçüb getdin, bu xəbər qaldı səndən.

44

## MƏDAİN XƏRABƏLƏRİ

İbrətlə bax, ey könlüm, bu aləmə gəl bir an,
Eyvani-Mədaini ayineyi-ibrət san.

Dəcləylə güzar eylə bir dəfə Mədainə,
Bir Dəclə də sən gözdən torpağına tök nalan.

Bax, Dəclə tökər gözdən yüz Dəclə qədər qan, yaş,
Gözyaşı deyil, atəş süzməkdə yanağından.

Bax, Dəclə köpüklənmiş, hər dalğa dodağında –
Bir eylə uçuqdur ki, doğmuş könül ahından.

Gör Dəclənin həsrətdən bağrı necə yanmışdır,
Söylə, eşidibsənmi, su odda ola büryan?!

Dəryaya verir Dəclə illərlə tükənməz qan,
Sən Dəcləyə bir pay ver, gözdən tökərək leysan.

Qopsa dodağından ah, qəlbindən alov hərgah,
Tən yarı donar Dəclə, tən yarı saçar vulkan.

Zəncirə düşən Dəclə zəncir kimi qıvrılmış,
Eyvani-Mədaini görcək yer ilə yeksan.

Gözyaşları dil açsın, eyvana xitab etsin,
Bir kəlmə cavab alsın qəlbin qulağı ondan.

Başlar öyüdə hər an diş-diş divarı qəsrin,
Sanki dil açıb söylər tarixini hər dəndan.

Bayquşların ahından ağrır başımız daim,
Gözyaşı gülabıyla et dərdimizə dərman.

Hər bülbülü bir bayquş, hər nəğməni bir növhə –
İzlər bu cahan içrə, olma buna, gəl, heyran.

Biz ədl sarayıykən zülm ilə xarab olduq,
Zalimlar olan qəsrə gör neyləyəcək dövran.

Sarsıtdı kim əflaka qalxan belə eyvanı,
Göylərdəki qüvvətmi, etdi ya fələk viran?

Ağlar gözümə güldün, sordun, bu nə matəmdir?
– Çox gülməlidir burda hər ağlamayan insan.

Nə zalı Mədainin Kufə qarısından kəm,
Nə hicrəsi təndirdən naqis tutular bir an.

Kufəylə Mədaini mənada bərabər tut,
Təndir qala qəlbinlə, gözdən tələb et tufan.

Bir vaxt bu eyvanın astanasını, üzlər –
Saldıqları nəqş ilə etmişdi nigarıstan.

Burda nökər olmuşdur Babil şahı illərcə,
Bu qəsrə qulam olmuş bir vaxt şahi-Türküstan.

Etmiş buradan bir gün şiri-fələyə həmlə –
Cürətlə o aslan ki, yonmuşlar onu daşdan.

Zənn eylə o əyyamdır, fikr ilə nəzər sal, gör,
Dərgah haman dərgah, meydan haman meydan.

Söylər: ayağın bərk bas, göz yaşını tök rahət,
Biz torpaq olub getdik, sən də diri torpaqsan.

Atdan yerə en, üz sürt torpağına, seyr eylə,
Fil pəncəsi altında şahkən mat olub Neman.

Yox filləri Neman tək torpağa salan şahlar,
Fil kimi gecə-gündüz onları əzər dövran?!

Təqdirə baxın, bir vaxt fil aciz edən şahlar,
Şahmatda qalıbdır mat bir fil kimi sərgərdan!

Nuşirəvanın qanın Hürmüz qafa tasında –
İçmiş, belə məst olmuş torpaq dediyin ətşan.

Tacında onun bir vaxt vardısa nəsihətlər,
Minlərcə nəsihət var beynində bu gün pünhan.

Kəsra ilə narıncı, Pərviz ilə tərxunu –
Çoxdan unudulmuşlar, torpaqla olub yeksan.

Düzdürdü qızıl tərxun öz süfrəsinə Pərviz,
Süfrə bəzənib oldu zər səbzəli bir bostan.

Pərviz yox olmuşdur, ondan daha söz açma,
Get, "Kəm tərəku" söylə, zərdən tərə yox əlan.

Sordun: hara getmişlər indi o böyük şahlar,
Bir hamilədir torpaq, çox udmuş o, şah, xaqan.

Çox gec doğacaq torpaq, qayda belədir əslən,
Tez nüftə tutan kəslər doğmaz o qədər asan.

Meynə yetirən meydir Şirinin ürək qanı,
Pərviz cəsədindəndir ol küp ki, qoyar dehqan.

Udmuş nə qədər, bilsən, zalimləri bu torpaq,
Lakin yenə doymaz bu acgöz adam udmaqdan.

Körpə qanını sürtər rüxsarına ənlik tək –
Bu döşü qara kaftar, ağ qaşlı bu biiman.

Xaqani, bu dərgahdan sən daima ibrət al,
Ta almaq üçün ibrət gəlsin qapına xaqan.

Dərviş bu gün umsa şahlar qapısından pay,
Dərvişdən umar bir gün ruzi, onu bil, soltan.

Adət belədir: Məkkə töhfə verər hər şəhrə,
Sən töhfə Mədaindən al, qoy bəzənə Şirvan.

Hər kəs aparan təsbeh çün Cəmrə gilindəndir,
Təsbeh al o yerdən ki, torpağa dönüb Səlman.

İbrətlə bu dünyaya bax, dadlı suyundan iç!
Olmaz keçəsən ətşan bu Şətt kənarından.

Kim gəlsə səfərdən bil, bir töhfə verər dosta,
Qoy ərməğanın olsun hər dostuna bu dastan.

Bax gör ki, bu şeir içrə nə sehr yaratmışdır,
İsa kimi bir sərsəm divaneyi-hikmətdan.

45

ŞİRVANIN TƏRİFİ

Şirvan ki var, hər cəhətdən ülviyyətin anasıdır,
Onun hər cür səhər yeli dərdlərimin davasıdır.

Mən vətənə qurban olum, qurulmuşdur düzgünlüklə,
Bağdadı da dolandıran onun bollu qidasıdır.

Şirvan əhli alicənab yaranmışdır, başdan-başa
O yer gözəl təbiətli bir lətafət mənasıdır.

Bağdad isə bir əlillər ölkəsidir, orada, bax,
Hər tərəfi çulğalayan ah-nalə sədasıdır.

Vətənimin fəqirləri dözümlüdür hər zəhmətə,
Gözləri tox, ürəkləri sanki kərəm dəryasıdır.

Çörəkləri arpadan da olsa, yenə qanedirlər,
Düyü qədər pulu olsa qürrələnməz, ədasıdır.

İndi Şirvan həsrət ilə mənə qalmış intizarda,
Çünki ora ədəb yurdu, cəsur şirlər yuvasıdır.

Mərifətdə Şirvan əhli yüksək durur ərəblərdən,
Xaqaniyə həyat verən doğma yurdun havasıdır.

46

SAVALAN DAĞININ TƏRİFİ

Səadət qibləsi Savalan dağı,
Kamalda Kəbə tək qazanıb şöhrət.

Kəbə yaşıl geyər, ağ bürünər o,
Çünki ehram tutan geyər ağ xələt.

Bir yerdə oxudum fəzilətindən,
Üç ildir çəkirəm görməyə həsrət.

Getdim ki, başına dolanım onun,
Dağlar anasıdır çünki o afət.

Başdan ayağadək örtükdədir o,
Deyir – bakirəyəm, açınca söhbət.

Min illər ömr edən bu qoca qarı,
Desə – bakirəyəm, yalandır əlbət.

Gəldi daxmasına Xızırla Musa,
O fəqir dərviş tək çəkdi xəcalət.

O qarının yaman böyük burnu var,
Gizlədər burnunu örtüklə hər vaxt.

Dedim ki, çadranı üzündən götür,
Kim dedi, qız kimi üzünü gizlət?

Dedi ki, dörd aydan sonra bir külək –
Qapanda çadramı görünər surət.

Xaqani, gəl onda bu bakirəyə –
Şerini çadra et, göstər məharət.

47

## GƏNCLƏRƏ NƏSİHƏT

Fitnə törətmə, ey fitnəkar cavan!
Fitnədir elləri dərdlərə salan.

Cana məlhəmsə də vəfa, etibar,
Fitnəkarlıq edər onu tarimar.

Məhşərin sübhüdür, lağım atma sən,
Gizli lağım qazan qorxar sübhdən.

Hiylə – oğurluqdur, xoşsa əvvəli,
Oğrunun axırda kəsilər əli.

Hiylənin şişindən qızarır üzün,
O qızaran üzlər şişəndir bütün.

Nifaq xəstəsisən nə qədər ki, sən –
Əlac saymaqdan da ziyan görərsən.

Vəfa küçəsində ev tut, yəqin bil:
Vəfa mənzilidir ən yaxşı mənzil.

Bu gün yoxdursa da kimsədə vəfa, –
Vəsiyyət edirəm: olma bivəfa.

Çalış az dostluq et, etsən də əgər,
Dostluqda möhkəm ol, sözdə mötəbər.

Dostu qovanları alma yanına,
Yoxsa gözün ağlar bu əhvalına.

Dostun haqlı vursa birini zinhar,
Demək ki, layiqdir, çıxma havadar.

Dostun bir adamı ayaqdan salsa, –
Ucaltma başını, Cəmşid də olsa.

Dost müttəhim edib, kimi etsə rədd, –
Qardaşın olsa da, önünə çək sədd.

Qırsa bir budağı dost hirslənərək, –
O, cənnət ağacı olsa da, əl çək.

Dostun əkdiyi gül olsa da tikən, –
Çıxarıb yerindən onu atma sən.

Özgənin əlilə adam olanlar –
Nə dost qədri bilər, nə ülfət anlar.

İsa düzəldən gil quşdur ki, quşdur,
İdris əkən qamış qələm olmuşdur.

Həqq yolunda çalış o qədər ki, həqq –
Razı qaldığını biləsən mütləq.

İsanı narazı, keşişi məmnun –
Edəndən olarmı, de həvariyyun?!

Bir kiçik adama nəvaziş etsən,
Sənin böyüklüyün getməz əlindən.

İtə nə rəng vursan itdir, arslandan –
Qalan sümükləri yeyər hər zaman.

Razılıq etsə də səndən bir nadan, –
Gərək tərifinə aldanmayasan.

Sən onu öydükcə, o lovğalanar, –
Özünü yoldaş yox, əmoğlun sanar,

Daha boyun qoymaz işə, xidmətə,
Lovğalar yabançı olur hörmətə.

Kiçiyə böyüklər ad qazandırar,
Şaha xidmət edən bayraq ucalar.

Gördüyün hər kəsi zənn etmə insan,
İnsan var ki, əslən şeytandır, şeytan.

Boyun böyüklüyü deyildir gərək,
Hümmət böyük olsun, bir də ki, ürək.

Göz bağlar qapını yatdığı zaman,
O minnət götürməz heç bir çıraqdan.

Gavə Fəriduna çatdığı zaman –
Bilməz harda qaldı köpüklə zindan.

Dünyada ağıl tək bir ustad varmı?
O bir qul yanında şagird olarmı?

Ədəbdən canına bir tilsim düzəlt,
Kəsranın tacına ədəbdir zinət.

Nemət üçün tərif yazma nadana,
Elm–hikmət əhli layiqdir buna.

Yalnız hünərinlə sən şöhrət axtar,
Təriflə həcvdir yerdə qalanlar.

Günəşin şərəfi Həməldə deyil,
Şərəf – and içənin "vav"ındadır, bil.

Sənətdə tək olan bu Xaqanidən, –
Gəl, incə mənalı fikir eşit sən.

Qorun pis adamdan, anla ki, onlar –
Əqrəb tək kor olar, ilan tək lal, kar,

48

Günəş tək sən də, Xaqani,
Tək olmaqçün çalış hər an.

Kaman tək qəmzəsi yarın –
Atıbdır köksünə peykan.

Ağardı saç, yarın qaçdı,
Ürək qaldı cavanlıqdan –

Ki, can qurtarmağa oğru –
Qaçar sübhün tüluundan.

Başındakı bu ağ tüklər –
Deyil kinli fələkdən, qan.

Bu ağ tüklər köməkçindir,
Verilmiş bəxtinə ehsan.

Başı vaxtsız ağartdınsa, –
Ömür oldu baharıstan.

Bu ağ tükdən kədərlənmə, –
Uzun ömrə odur mizan.

Gecə qırpım tək ötmüşsə, –
Demək ki, tez sökülmüş dan.

Kamal əhlini tənəylə –
Edər rüsvay çox nadan.

Adın dünyanı tutmuşdur,
Sözündə sirlər pünhan.

49

Fəzilət, Xaqani, baş ağrısıdır,
Gör necə dərdlidir fazil adamlar.

Hünər sahibləri ağıllılar da –
Dərd-sər içində edir ah-zar.

Şahlıq tacı qoyan kədərsiz olmaz,
Xəzinə üstündə yatar şahmar.

Başçılıq zəhmətsiz əldə edilməz,
Döyüşsüz şöhrətə çatmaz bir sərdar.

Fil əgər əziz də olsa, minici –
Dəmirlə beynini döyər biqərar.

Sürməni nə qədər narın etsələr, –
Onun qiyməti də o qədər artar.

Göbəyi kəsilən zaman uşağa –
Mamanın yazığı gəlməz, aşikar.

Sözüm bal kimidir, paxıldır amma –
Bal yeyib, ağzından tökdü zəhrimar.

Arı pətəyindən bal tutan adam, –
Arı sancmasa da, onu qovalar.

Halbuki üzünü palçıqla örtər –
Bal tutmaq istəyən aqil adamlar.

Musanın əlləri palçığa batmaz,
Xızra hər kərpicdir bir xəzinədar.

Sən bilik şirinin balası ikən, –
Cəhlin qarışqası edir səni xar.

Sən fərəh sərvisən, güman etmə ki, –
Qəm sənin üstünə çiləməz qübar.

Hünərin bir ceyran müşkünə bənzər,
Nə əcəb müşkündən yaranır azar?

Ceyran göbəyindən ətir alanda –
Vaxt olar adamın burnu da qanar.

Rayihən tutmuşdur bütün cahanı,
Eylə yaradana şükrünü izhar.

Bil ki, naşükürlük kafura bənzər –
Ki, müşkün ətrini vurub dağıdar.

50

Bu göylər şahının lütfü mənə sayə salıb əlan.
Zavallı könlümə vermiş yeni qüvvət, yeni ruh, can.

Ürək dil açdı, şükr etdi ki, qurtardım fəlakətdən,
Nə yaxşı – söylədi canım – tükəndi möhnəti-zindan.

Belə olduqda şadlandım, nəhayət, arzuma çatdım;
Sənə qoy söyləyim indi qəribə bir məsəl, canan.

Gedib məğrib-zəminə bir kişi dərya kənarında,
Dararkən başını, bir tük yerə saldı o başından.

Köçüb sonra o məğribdən, səyahət eylədi şərtə,
Bu müddət çox külək əsdi, yağışlar eylədi tufan.

Otuz il keçdi bu gündən, yenə səyyah gəlib qərbə,
Haman yerdən götürdü öz tükün, oldu buna heyran.

Buna Xaqaninin halı, onun Abxazə ezamı,
Necə də oxşayır, bir bax, necə dövr eyləyir dövran.

Olub Abxaz ona məğrib, şahın dərgahı bir dərya,
Zavallı canı bir tük düşüb qalmış ora nalan.

Əgər bir vaxt o da canın taparsa tük kimi təkrar,
Ona tənə edib, bir də gülərmi nanəcib düşman?

Olub indi mənə həmdəm səsi çaşbaş vuran bir ney,
Əlimdən öz neyimi, gör, necə aldı fələk asan.

Açılmış bir gül ağzıdır mənim ağzım bu gün yalnız,
Bu dünyaya qızıl, yaqut səpər ol gül öz ağzından.

Fəqət əfsus ki, gülməz könül Rey mülkü də olsa,
O hər vaxt sadə bir sözlə olardı nəşəli, xəndan.

Bu Kür Ceyhun olar, Tiflis Səmərqəndi qoyar dalda,
O vaxt ki, Tiflisə Kürlə gələr Xaqani və xaqan.

51

Ey Xaqani, pis rəhbərdən ehtiyat et, qorx ondan!
Rəhbər əgər pis olarsa, yol düz olmaz heç zaman.

Bir nanəcib səndən ötrü iftixarla görsə iş,
Sənin fəxrin ara dönər, o iş verər min ziyan.

Nacins adam sənin yaxşı əməlini pis edər,
Sənin yaxşı sözlərinlə yaxşı olmaz o nadan.

Səni axır öz halına salar nacins adamlar,
Zər qurşunla oturarsa, rəngində tapar nöqsan.

Əgər qızıl civə ilə ağarırsa, Xaqani!
Od içinə salınanda olur necə, gör, əlvan.

52

## ANAM HAQQINDA

Ey Xaqani, bu dünyada hər zaman –
Anam vermiş zəhmətilə sənə can.

Su və çörək qıt olsa da atmadın,
Yurdun oldu bu əzablı, dar Şirvan.

Heç bir kəsə sən olmadın tüfeyli,
Kömək aldın Allahdan və anandan.

Sən oturdun, kölgə kimi, ananın –
Cəhrəsinin kölgəsində anbaan.

Ey ağ qartal! Nə vaxtadək olacaq –
Ana yanı vücuduna aşiyan?

Nə vaxtadək göyərçin tək ağzıyla –
Sənə ruzi verəcəkdir öz anan?

Nə vaxtadək, İsa kimi atasız –
Ana ilə tanısınlar səni? Qan?

Bir dəfə də Xızr kimi yola çıx,
Bəsdir oldun ananla həmxaniman!

Sən qiymətli bir dürrsən, nədəndir –
Oldun ana astanasında pünhan?

Sən ağıllı övladsansa, dilə gəl,
Ana kimi özünü danla bir an.

Hər nə etsən, ana haqqın unutma –
Anan edib sənə canını qurban.

Bu ananın xatirinə, düşməndən –
Gələn dərdə dözsün gərək hər insan.

Qorx o gündən, ki səni də tək qoyub, –
Əbədilik anan köçər dünyadan.

## QƏZƏLLƏR

53

Necə gözləyim ədalət ki, ədaləti danansan,
Necə şad olum qəmindən ki, qəmimlə şadimansan.

Mənə etdiyin sitəmdən hamı baxəbərdir, ancaq –
Deyiləm özüm xəbərdar ki, mənə vəfalı cansan.

Ürəyim yox oldu getdi, əvəzində mən nə tapdım?
Mənə təkcə bir bu qaldı ki, sən əhdə bədgümansan.

Axı bir nəfəs nədir ki, onu da əsirgəyirsən?
Elə ətrə qaneyəm mən, çiçəyim, ətir saçansan.

Saçının kəməndi içrə boğulur zavallı canım,
Mənə qanbaha özün ver ki, bir adil hökmransan.

Gülə oxşadıb dodağın, ona istədim sığınmaq,
Dedi: – Get, qan ud dolan ki, mənə sən yaraşmayansan.

Necə dəm vurum qapında ki, məhəbbət ilə bir gün –
Demədin, Həqayiqi, sən bu qapımda pasibansan!

54

Könlüm çıxıb gedibdir, bilməm nə cür bəla var,
Mən ki, əziz tutardım, bəs bunda nə qəza var?

Zənnim çatan məkandan sordum, sorağın etdim,
Əldən düşüb yoruldum, bu yolla çox cəfa var.

Hey axtarıb soruşdum, bir tapmadım nişanə,
Ya rəbb, onun başında nə gizli macəra var?

Etdim güman ki, bəlkə qaçmışdır eşq əlindən,
Eşqə düşüb o, yoxsa zənnimdə bir xəta var?

Suymuş məgər çəkildi, torpağa hopdu, getdi,
Ya quş olub o uçdu, başında nə hava var?

Üç gün sorağın etdim, car çəkdim hər tərəfdə,
Ondan bu həndəvərdə nə sovt, nə səda var.

Kimdir xəbər verən bir yorğun, qərib ürəkdən?
Aya, bu dərdə axır bir çarə, bir dəva var?

Dil açdı bir uşaq ki, Xaqani, olma qəmgin!
Bir afətin telində bir qəlbi-mübtəla var.

55

Hədisi-tövbəni at bir kənarə, badə gətir!
Xumarı dəf eləmə, mən xumar badə gətir!

Rəva deyil iki qiblə; nəmaz, ya badə,
Nəmazə hövsələ yoxdur, dübarə badə gətir!

Demə səhər gülə oxşar, qara gecə mişkə,
O ətrü rəngdə mey tap, bu zarə badə gətir!

Könüldə dini tutub, vermə yol xürfatə
Ki, mane olmaya mən meyküsarə, badə gətir!

Ömür keçir yaxasın yırtaraq, ətəklə onu,
Salıb bu məclisə, ol biqərarə badə gətir!

Şərab carçısına hazıram deyəm "ləbbeyk"
Mənimlə həmdəm olan dosta, yarə badə gətir!

Səhər duası nədir, istərəm səhər qədəhin,
İcazə al, məni-biixtiyarə badə gətir!

Behiştin arxına, Xaqani ehtiyacın yox,
Behişt ürəkdi, dur ol cuybarə, barə gətir!

56

Ay nə lazım, sən kimi məhru kifayətdir mənə,
Gül nə lazım, sən kimi xoşbu kifayətdir mənə.

Sevgilim, əqlim olubdur eşqinin divanəsi,
Çəkmə zəncir fikri, ol geysu kifayətdir mənə.

Göz yaşımdırsa buludsuz bir yağış yağdırmayan,
Bir bulud tək zülfi-ənbərbu kifayətdir mənə.

Hüsnünü seyr etməyə yox ehtiyac ayinəyə,
Əllərin tək bir zərif güzgü kifayətdir mənə.

Zülfünün rəngi mənim merac gecəmdir, şübhəmiz,
Qab-qövseynin – iki əbru, kifayətdir mənə.

Ehtiyacım yox, nə lazımdır hümanın kölgəsi,
Sayeyi-kuyində olsam, bu kifayətdir mənə.

Qəsd qılmış tökməyə Xaqaninin qanın fələk,
Qətlim üçün sən kimi dilcu kifayətdir mənə.

57

Bax, yenidən bu könül dərdin ilə yar olub,
Ömr çatanda başa eşqə giriftar olub.

Yar həyata gəlcəyin şəhrə düşüb vəlvələ,
Eşqi görərkən ağıl qaçmağa vadar olub.

Verdi həyat, sevgilim, bir gülüşün qəlbimə,
Şöleyi-hüsnünlə can yurdu şərərbar olub.

Əldə bəla xəncəri, ayrılıq etmiş hücum,
Varlığa son qoymağa hicr səbəbkar olub.

Pəncə atıb ceyranın boynunu sındırdı şir,
Göyərçin də şahinin caynağında xar olub.

Səbrimi, aramımı, dinimi də aldılar,
Təkcə qalan ruh mənim qəlbimə qəmxar olub.

58

Səndən, gözəlim, özgə kəsdə nəzərim yoxdur,
Dərdü qəmi-eşqindən başqa kədərim yoxdur.

Dünyanı bütün gəzsəm, olmaz sənə oxşar can.
Avarə bu könlüm tək heç yanda yerim yoxdur.

Baş qoysam ayaqların altında nə qorxum var,
Vəslin mənə mümkünsə, başdan xətərim yoxdur.

Tək bir gecə də olsa tərk eyləmərəm kuyin,
Hər daş ola bir darğa, xövfü, həzərim yoxdur.

Səndən mənədək canan, minillik uzun yoldur,
Məndən sənə bir addım yoldur, xəbərim yoxdur.

Milçək kimi Xaqani sərsüfreyi-vəslində
Çimçəşmə əgər gəzsə, bil ki, zərərim yoxdur.

59

Səhər açıldı, gözəl, şişə aç, gətir badə!
Günəş kimi sən badə ver bu dünyadə.

Səmada bayram ayı çün qədəm qoyur atına,
Gül üzlü saqi, tələs, meylə gəl yetiş dadə.

Açıb niqabını üzdən, məni alovlandır,
Ki, şam kimi axıdım göz yaşı bu sevdadə.

Könül ki, olmayacaqmış əlinlə abadan,
Barı xərab edib, od vur bu mülki-bərbadə.

Gülabı tərli üzündən axıt o şərbətə kim,
Şəkər ləbin mənə bəxş etdi ləli səhbadə.

Sənə sayanda mənim sevgilim günahlarımı,
Keç onları kəräminlə bu qəlbi-naşadə.

Gülabı tərli üzündən xıt o şərətə kim,
Tabaqla inci mükafat ver o ustadə.

60

Könüldə aşiyan etmiş xəyalın,
Verib can, istərəm bəzmi-vüsalın.

Qapında torpağa üz sürtərəm ki,
Nəsibim ola didari-camalın.

Kamalın qarşısında acizəm mən,
Camalından müzəyyəndir kamalın.

Üzün nuru gecəmi etdi gündüz,
Nə bədrin var sənin, nə də hilalın.

Soruşdun yarü dildarı məndən,
Müəmmadır mənimçün bu sualın.

Xəyalın canıma həmdəmdi, canan!
Xəyalından soruş, bil vəsfi-halın!

Əgər Xaqanini görmək dilərsən,
Xəyalına gətir sən öz xəyalın!

61

Ey aydan, pəridən gözəl nazənin,
Məcnuna dönürəm eşqində sənin.

Yaraşmaz zülm etmək nazlı mələyə,
Gəl mənə lütf eylə, ey nazlı gəlin!

Nə gözəl gecədir, bəs vəslin hanı?
Səni, bax, gözləyir dərdli Xaqani.

Gəl sənə söyləyim dərdimi bir-bir,
Gəlməsən, yandırram bütün cahanı,

Xaqani öpdükcə şirin ləbindən,
Hərarət içində qızışır bədən.

Yəqin ki, dodağın alovludur, yar,
Yoxsa bu hərarət haradan, nədən?

62

Gözüm yollardadır, bəlkə xəbər gəlmiş olar səndən,
Olaydı qismətim, vəslin şərabından içəydim mən.

Əgər məndən yetişməzsə mənə bir saf şərab, dilbər!
Təhindeymiş şəfa camın mənə ondan çatar hərdən.

Vəfa qasidləri məndən sənə məktub yetirməzsə,
Heç olmazsa əzabından mənə pay ver edim şivən.

Əgər vəslin bizə qismət deyilsə, dost və düşmən var,
Salamımın cavabında salam göndər, cavab ver sən.

Qurulmuş yollarım üstə məkridən, hiylədən yüz tor,
Budur qorxum, düşər, dostum, ayağın bu tora birdən.

Qaçar əqlim bir avarə kimi daim hey ardınca,
Əgər kuyinə çatmazsa, yəqin bir yer edər məskən.

Ləbin vəslinə yetməkçün bütün imkana əl atdım
Ki, Xaqani yetib kamə, olaydı könlü bir an şən.

63

Eşqinin xəyalı, sevgili canan,
Bir an da çıxmayır mənim başımdan.

Xəyalın canıma bir od salıb ki,
Söndürməz, qopsa da yüz kərə tufan.

Yüz dona girirəm, neyləyim, səndə
Eşqdən görünmür kiçik bir nişan.

Eşq ilə yaşadım mən bu vaxtadək,
Ölüncə dönmərəm əsla bu yoldan.

Dərdimi yazırkən əllərim əsdi,
Canımçün, qalmamış bu canımda can.

Xaqani dərdini şərh etmək olmaz,
Əgər yazılsa da yüz belə dastan.

64

Bilməzdim ki, başıma bəla imiş məhəbbət,
Bu cahanda tək mənə qarşı bəslər ədavət.

Bir dəstə gül göründü gözlərimə uzaqdan,
Yaxınlaşıb nə gördüm? – Yanar odmuş o afət.

Gümüş tək çıxdı əldən səlamətlik, neyləyim?
Daş altından əlini çıxarmadı fərasət.

Səbr qaçıb qurtardı məhəbbət meydanından,
Gördü hərif güclüdür, özündə yox mətanət.

Dörd barmaq yol ayırır, məhəbbətlə cəfanı,
Yüz ağacdır vəfadan əhdə qədər məsafət.

Könül qaldı geridə vüsalın karvanından,
Çünki mənzil uzaqdır, at – axsaq, yol – narahat.

Xaqaninin naləsi ötüb keçdi fələkdən,
Hər addımda eşq ona göstərdi min fəlakət.

65

Könlümü qərq edib eşqin dəryası;
Dinlə, sözlərimin yoxdur riyası.

Ayrılıq xəncəri tökür qanımı,
Canıma od salır hicran bəlası,

Eşqinin tufanı tutar dünyanı,
Könül, ağla, artmış batmaq pərvası.

Sənin topuğuna çatar bu tufan,
Bizim başımızdan aşır dalğası.

Yadı Xaqanidən yüksək tutarkən
Bilmədin sabitdir kimin vəfası.

66

Qoydun gözlərimi üzünə həsrət,
Sinəmdə ürəyim sən oldun, afət!

Səsim yetişməsin deyə bir yana,
Kəsdin nəfəsimi, qalmadı taqət.

Kimi yaralasan nazü-qəmzənlə.
Ona əlac olmaz qopsa qiyamət.

Sən üzüb aldıqca canımı əldən,
Yandım, söndürmədin, ey bimərhəmət!

Özün nicat vermək istədin qəmdən,
İpi yarı yolda doğradın, fəqət!

Məni Məcnun edib, sonra qaçırsan,
Bəlkə sərxoşsan, ey fəriştəsurət?!

Göyə qaldırırsa vüsalın məni,
Alçaldar başını ayrılıq, möhnət.

Şadlıq qədəmini genişcə at sən,
Biz dərdi-eşqinlə tutaq ünsiyyət.

Məni dəyişsə də hicran əzabı,
Necəsən, saxlaram səni əmanət.

Özünü sevənsən, xudbinsən, gözəl!
Yoxdur Xaqanidə ancaq bu xislət.

67

Ləbi yaqut, üzü gün kimi o dilbər, gecə şən,
Qapımın ağzına məst halda gəlib durdu həmən.

Çox mülayim mənə səsləndi: – Ay oğlan, bir qalx.
Mən soruşdum: – Gecə kimdir bizi narahat edən?

Dedi: – Çağrılmamış olsam da, qonağam, dostam,
Sənə başağrısı verməkliyə gəldim belə mən.

Qapıdan girdi, sevincdən uca bir səslə dedim:
– Nə qəribə gecədir, ah, nə gözəl ovdu gələn.

Meyi tərif elədim, razılıq etdim gecəyə.
Dostumu mənzilimə meydi, gecəydi gətirən.

Olmasaydı gecə hərgah, üzü olmazdı açıq,
Olmasaydı mey əgər, yar utanardı məndən.

Söylədim tövbəliyəm, nazlı gözəl, çoxdandır,
Bataram cürmə sənin xatirin üçün yenidən.

Ey gümüş üzlü, qədəm haqqı qəbul etsən əgər, –
Əlinə canımı verrəm, bunu bil yaxşıca sən.

Dedi: – Xaqani, zərə oxşamayır üz vermə.
Dedim: – Əfv eylə, görünməz gecə zər, bilmirsən?

68

Can bəxş edərəm cana, gər ləblə şəkər versən,
Ləbdən mənə, dildarım, bir cani-digər versən.

Qızdırmalıdır qəlbim, ləlində də neyşəkkər,
Qızdırmamı dəf eylər neyşəkkər, əgər versən.

Səndən belə bir dərdlə xoşdil deyiləm, canan,
Razı olaram bundan bir dərdi-betər versən.

Kuyindəki itdən də əskik mənə ad verdin,
Xoşdur mənə tac versən, yainki kəmər versən.

Pərvanəsiyəm eşqin, şəmində pərim yanmış,
Çırpınmadayam, cana, rəhm et, mənə pər ver sən.

Qəmzənlə, dodağınla qarşımda dənizsən, bil,
Gah canıma qəsd eylə, gah dürrü gövhər ver sən.

Xaqaniyə söz verdin bir vaxt gövhər verrəm,
Mən bəxşişə möhtacam, nolar bu səhər versən?

69

Məhəbbət bir bəladır ki, yoxdur onun dərmanı,
Aşiq canı tərk etsə də, ata bilməz cananı.

Məhəbbətin zəncirinə bağlanandan, hər gecə –
Salar zülfü halqasına qəlbimdəki halqanı.

Dedi: – Bütün ömrü qoysan, yetişərsən vəslimə,
Məmnun etdi məni, amma tutmadı bu peymanı.

İndi necə bel bağlayım o dildarın əhdinə?
Ömür gödək, fələyinsə yoxdur bizə ehsanı.

Ondan gələn məzəmməti çəksə bilmir bu könlüm,
Axı onun karvanına bizdən layiq yük hanı?

Onun bəla kamanının yayı bikar qalıbdır,
Ürəyimin sağ yeri yox – yaralaya peykanı.

Dünya: bina olan gündən o dilbərin hüsnünün –
Bərabəri yoxdur əsla, gəzsən bütün cahanı.

Özü məni rüsvay edib, özü mənə deyir ki:
– Ey Xaqani, sus ki, deyil şikayətin zamanı.

70

Biz qəmə öyrəşmişik, ey dost, göndər qəm bizə,
Qüssədən bir töhfən olsa, yolla sən hər dəm bizə.

Yırt libası əynimizdə, evimizi döndər külə,
Xələtin dərdü qəm olsun, peşkəşin – matəm, bizə.

Yad edərkən bizləri göz gəzdir öz ətrafına,
Gözyaşı tapsan, unutma, göndər ondan həm bizə.

Xəstədir canım, xəyalın dərdimin dərmanıdır,
Hicrinin bimarıyıq, ver vəslini məlhəm bizə.

Çəkmisən zəncirə zülfünlə sən itmiş Yusifi,
Halqalanmış zülfünün sirrini aç kəm-kəm bizə.

Bax, sənin zülfün aparmışsa, Süleyman xatəmin,
Qoy o qalsın, öz ləbindən yolla bir xatəm bizə.

Sığmayır Xaqani bu dünyaya qüssəndən sənin,
Qəmzən ilə öldür, olsun məskən ol aləm bizə.

71

Məhəbbət aləmində eşqin olanda pünhan, –
Fitnə-fəsad verdi baş ruzigarda çox yaman.

Ömründə hər kəs sənə bir dəfə rast olarsa, –
İnan ki, hər nəfəsdə o min dəfə verər can.

Min bir neştər batırdı qəlbə hər işvə, qəmzən,
Dodağın min iş açdı canın başına, canan.

Pələng təbiətini adət etcək özünə, –
Qoymadın bu çəməndə azad gəzə bir aslan.

Söylədin: – Səbirli ol, işin düzələr əlbət,
Vay olsun, o işə ki, onu səbr edər asan.

Sən yasəmən budağı olursan başqasına,
Ancaq mənə çatanda neçün tikansan, tikan!

Sənin eşqinin odu gizli düşdü könlümə,
İndi aşkar od çıxar Xaqaninin başından.

72

Nə olar, söylə, gözəllərdə cəfadan başqa?
Hər nə istərsən olar, təkcə vəfadan başqa.

Belə əyyamla onun bəslədiyi kəslərdən
Nə gələr ellər üçün dərd-bəladan başqa?

Hər qədər çox qınasan, çox da yəqinin olacaq:
Yox imiş heç nə gözəllərdə, ədadan başqa.

Yaxşılarda, ola bilsin ki, tapılsın pislik,
Pisdə çox şey tapılar, zövq-səfadan başqa.

Meyi çox saxlasalar sirkə olar, ancaq ki,
Nə var o sirkədə bilməm ki, qadadan başqa?

Könlü boşlarda, könül, umma ki, peyman olsun,
Yox təbillərdə yalan hayla sədadan başqa.

Tək pərilərdə olar zülm-cəfa dünyada,
Olmaz insanda nəfəs xalqa ətadan başqa.

Yenə Xaqaniyə, ey dərdli könül, sən yar ol,
Yar olanlarda nə görmüş o, xətadan başqa?

## QİTƏLƏR

73

O köç günü ki, mən etdim vida Şirvana,
Təəssüf eylədi qəlbim, ciyər alovlandı.

Yanıb fəraq oduna, mən Arazla uzlaşdım,
Araz görüb halımı od tutub, o da yandı.

Ahım kimi iti axdı, qəmim kimi coşdu,
Xüruşə gəldi könül tək, kədərlə çalxandı.

74

Soruşdun ki, ürəyində rəğbət yoxdur şahlara?
Bəli, yoxdur sultanlara rəğbətim zərrə qədər.

Rey valisi qoymadısa Xorasana gedim mən,
Nə eybi var, bundan mənə yetişməz heç bir zərər.

Lakin vali heç kəsə də verməsəydi icazə, –
Gərək mənə fərq qoyaydı özgələrdən bir qədər.

Mən gedirəm Xorasanda alimlərin yanına,
İşim yoxdur oradakı əmirlərlə, müxtəsər.

75

Xaqanidən yuxarıda oturdunsa, nə olar,
Nə bu sənə hünərdir, nə də Xaqaniyə ar.

Çünki göydə qara üzlü, pis əməlli Zühəl də –
Xoş sifətli Müştərinin üstündə tutmuş qərar.

Harada ki, su neft ilə birləşərsə, qaydadır,
Aşağıda su yerləşər, yuxarıda neft qalxar.

Görmədinmi, xırmanda da döyüm vaxtı həmişə,
Ağır dənlər alta yatar, boş saman üstə çıxar.

76

Məndən tərif görər hər yaxşı insan,
Söyləmərəm nacinsi şerimdə bir an.

Bütün divanımda yoxdur iki həcv,
Mənim gülzarımda tapılmaz tikan.

77

Xaqaniyəm, dünya nədir, çəkə məni varına o?
Kimi qoyub beşcə günlük nemətindən barına o?

Gündüzüdür – ağ gümüşü, gecəsidir – qara quruş,
Bundan artıq, ömrün boyu qıymaz sənə para quruş...

Bu dünyada varın yoxsa, nə olsun ki, vardır ağlın,
Varın yoxsa, ağıl nədir, suya dönmüş qardır, ağlın?!

Bağındakı salxımdakı qoraya da əsər fələk,
Əl uzatma, bir cəlladdır, əllərini kəsər fələk.

Bir uşaqda kişmiş görsə, mələr keçi kişmiş üçün,
Hara getsə, arxasınca gələr keçi kişmiş üçün.

Sanma bir gün kişmiş üçün gəzər uşaq keçisini,
Kişmişinə dadandırıb, kəsər uşaq keçisini.

78

Xaqaniyəm, sərvət eşqi ağlı başdan ala bilməz,
Sərvət-dövlət bir kölgədir, çıxar yoxa, qala bilməz.

Dövlətinə qürrələnən kamillikdən bil, uzaqdır,
Od içində qarğı atla cövlan edən bir uşaqdır.

Əvvəl sübhün al şəfəqi, sonra qızılgüldü dövlət,
Əriyərkən yoxa çıxar yana-yana, küldü dövlət.

Aldatmasın bu fələyin küpündəki boya səni,
Yas paltarı geyən gözəl dəvət etməz toya səni.

Sanma verər muradını, bir sərabdır kama fələk,
Şərbətini qıyan deyil, zəhər tökər cama fələk.

Sərvət eşqi – canın odu, kükrəsə də sönən olar,
Şölə saçıb yanan atəş axır külə dönən olar.

Çox möhnətin sonu bir gün səadətdir bu dünyada,
Qış gedəndə bahar gələr – bir adətdir bu dünyada.

Əzəl başdan oyuncaqdır, çox şirindir var-dövlətin,
Bir gün dövran haram edər, qan-irindir var-dövlətin.

79

Xaqaniyəm, alçaqları ucaltmaram bir daha mən,
Quduzları tərifimlə eyləmərəm şir daha mən.

Gürzələrin ağzına mən abi-həyat süzüm neçün?
Rəzillərin qabağına gövhərimi düzüm neçün?

Mələklərə döndərmərəm bundan belə iblisləri,
İblis kimi tanıtdıram gərək elə iblisləri.

## RÜBAİLƏR

80

İstəsən güzgü tək saf olsun ürək,
Sinəndən on şeyi atasan gərək:
Haram, qeybətlə kin, paxıllıq, tamah,
Kibr, riya, həsəd, ədavət, kələk.

81

Məni öldürməyin vacibsə əgər,
Bircə xahişimi dinlə, a dilbər!
Ləblərin meyilə məst edib əvvəl,
Sonra kirpiklə vur canıma neştər!

82

Zənn etmə fələyin çərxi düzələr,
Ömür dolandıqca artır dərdi-sər.
Fələyin başına demə kül olsun, –
Bir ovuc külə də dəyməz fələklər.

83

Xaqani, hümmətə sığındıqca sən,
Alçaqlar tək cəlal, şöhrət güdməzsən,
Bir piyada olub düz getmək xoşdur –
Bir vəzir olaraq əyri getməkdən.

84

Gözəllər şahısan, mən sənə bəndə,
Acı ağlayaram sən xoş güləndə.
Mən tozam, torpağam, sənsə bir külək,
Göyə sovrularam sən bərk əsəndə.

85

Xaqani, bu sitəm evini at get!
Qəmi qəm evində buraxıb, şad get!
Fələyin verdiyi bu can zəncirdir,
Canı qaytar ona, özün azad get!

86

Xaqani, dünyada rahatlıq varmı?
Fələklə çarpışmaq mümkün olarmı?
Cəmə, Firiduna qalmayan dünya,
Bir düşün, zavallı, sənə qalarmı?

87

Ürək yanğım asimana sığan deyil,
Odlu ahım heç bir yana sığan deyil.
Deyirsən ki, bu dünyada yoxdur qəmin,
Dərdim-qəmim bu cahana sığan deyil.

88

Mey canıma namərd ağı süzsün mənim,
Gərdənimə həmayillər düzsün mənim.
Mərd boynumu namərd əli qucmaqdansa,
Mərd qılıncı qoy başımı üzsün mənim!

89

Ey yar, eşqin atəşlərə yaxıb məni,
Dərdim şam tək şamdanlara taxıb məni.
Gözyaşımdan, yanmağımdan xəbərsiz yar!
Hər gecə an, yanan şama baxıb məni.

90

Amansızdır – candan camı umar gözün,
Cəllad kimi qılıncıyla cumar gözün.
Elə sərxoş bir saqidir xumar gözün,
Gözlərimi bu həyata yumar gözün.

91

Tənə oxu qəlbə dolmaq – fəlakətdir,
Həsrət ilə qəmdən solmaq – fəlakətdir.
Gözəl yarın ayrılığı öz yerində,
Alçaqlara möhtac olmaq – fəlakətdir.

92

Könül sənin oldu, mən qaldım tənha,
Gövhəri bəxş etdi, boş qaldı dərya.
Demə ki, səbr elə mənim yolumda,
Bizləri səbr ilə göyərtdi dünya.

93

Keçirtdim zillətlə ruzigarımı,
Güzgü də istəməz bu rüxsarımı.
O qədər istəyir bu səyyad məni,
Bağlayıb qəfəsdə qanadlarımı.

94

Nəfəsin İsadır, üzün gün, ey yar.
Saçların çəlipa, xəttinsə zünnar.
Sən qoşun çəkirsən əsir tutmağa,
Xaqani əsirdir, de, nə əmrin var?

95

Hicran gecəsində dərd arasında,
Necə yatmaq olar qəm dəryasında?
Könlümdə xəyallar dalğa kimidir,
Dalğalar xəyaldır göz qarasında.

96

Sinədə ağır daş ötdük sel kimi,
Üstündə çör-çöplər getdik sel kimi,
Axır ki, vətəndə bir dincəlmədik,
Getdikcə fəryadlar etdik sel kimi.

97

Taleyim Xosrov tək doymaz uyqudan,
Gözlərim Şirin tək qan ağlayar, qan,
Bədənim Məcnun tək dərdlər yatağı,
Leylinin zülfü tək halım pərişan.

98

Ləbin Xaqaniyə verdi busələr,
Ləbindən uzaqda o çəkdi nələr!
Ləblərin atəşdir, gülür fərəhlə,
Yeri var, bizləri yandırsa əgər.

99

Ləblərin tutidəm, dünyanişandır,
İkiüzlü, qəmzəli bir can alandır.
Adımı çəkməsin əsla o ləblər,
Başqa dodaqlarla həmdasitandır.

100

Xaqani, dünyada yox zövq-səfa,
Köç, dəni fələklə etmə sən dava.
Nə Cəmşidə qaldı, nə Firiduna,
Kasıba qalmayır, qalmasın dünya.

101

Kişidir sözündə Xaqani, ancaq –
Müxənnəs əlində olmuş oyuncaq.
Hansı bir hünərlə tanındı kişi, –
Başına o hünər bəla açacaq.

102

Xaqani, dağlarla yanmış ürəyin,
Duzsuzdur bu fələk verən çörəyin.
Əyridir yer üzü, bir düz tapılmaz,
Kiminlə birləşsin sənin diləyin?

103

Könül yox, Xaqani, mən şad olmaram,
Fələyin zülmünə nə söz, nə kəlam?
Hər nə ki, fələyin əlində bişdi, –
Ya şordur, ya da ki, duzsuzdur tamam.

104

Xaqani, bu ali hümmətinlə sən,
Gəl, ruzi istəmə alçaq fələkdən.
Ondan nə yaxşı gün, nə ruzi istə,
Ona da pay verir ruzini verən.

105

Qəmlərin oduyla odlandı ciyər,
Səbr tükəndikcə çoxaldı kədər.
Səbr ilə yaşayır ciyər, doğrudur, –
Yanmış bir ciyərdə səbr olar məgər?

106

Səni harda gəzim, ey itmiş gövhər?
Bəla küçəsində? Ordasan məgər?
Soruşum birbəbir hər bir ağızdan?
Yoxsa, hər diyardan mən tutum xəbər?

107

Dəhşətli alovdur, oddur xəyanət,
Xainə verərmi alovdan fürsət?
Bir böyük xırmana bir şölə bəsdir,
Bir zərrə xəyanət, bir aləm xidmət.

108

Mənim cavanlığım kədərli keçdi,
Günlərim ağulu, zəhərli keçdi.
Ağladım öz ölən ruzigarıma,
Həyatım həmişə qəhərli keçdi.

109

Əgərçi zahirdə yoxdur iqtidar,
Könüldə Xızr tək tutmusan qərar.
Gecəmlə gündüzüm vəslini istər,
Ay buna şahiddir, gün də xəbərdar.

110

Hər yana baxırsan, bir Bu-Ləhəb var,
Qəflətlər içində neçə səbəb var.
Hər nəfəs önündə bir gecə durmuş,
Hər addım başında bir biədəb var.

111

Şam kimi bədənim yandı ürəkdən,
Yanıb külə döndü odda canla tən.
Pərvanə gördü ki, o tamam yandı,
Dedi: nəyə gərək bu zərli bədən.

112

İncitmə bu qədər, ey yar, canımı,
Bəlalar əlindən qurtar canımı.
Can verdim ki, səndən könül alam mən –
Sevda baş tutmadı, qaytar canımı.

113

Kölgə düşməlidir sənin səqfindən,
Süfrəndə qarışqa gərək yesin dən,
Möhtaca, yoxsula çörək vermirsən,
Bəs neçün gəlmisən bu dünyayə sən?

114

Qəlbimdə qalıbdır o köhnə dərdlər,
Əl çəkər qəlbimdən o dərdlər məgər?
Sakit bir guşənin sorağındayam,
Tapmıram, nə edim bir iz, bir əsər.

115

Yarısı qaradır, yarısı ağdır.
Cavanlıq günlərim zolaq-zolaqdır,
Bu soyuq ahımla ağ saçlarımdan,
Ömrümün bağına qar yağacaqdır.

116

Üzünün önündə ayda tab hanı?
Yox aşiq gözündə uyqu nişanı.
Baxanda çöhrənə günəş həsəddən,
Göylərdə od tutur, alışır canı.

117

Xaqani, başında ağıl var əgər,
Bil, döyüb-döyülsəm hədərdir, hədər,
Boynuna, kimin ki, ağıl tacı var,
Zəncirlər salıbdır qəzavü qədər.

118

Gəmiçi məst olub bənzədi oda,
Gəminin cilovu verildi bada.
Sevgilim oturub gəmi içində,
O, suda üzərkən mən düşdüm oda.

119

Ağıl köç eylədi eşqin gələndə,
Ürək qəmə batdı qəmlər güləndə.
Vüsalı xəyalə gətirmirəm heç,
Xilqət yaratmayıb bu fikri məndə.

120

Adətin bir yandan, hicran bir yandan,
Acizlik bir yandan, dövran bir yandan.
Mənə min dərd verdi o ləli-ləbin,
O zülmün bir yandan, cəfan bir yandan.

121

Xaqani əlinə bir çiçək düşüb,
Xalı da, ətri də çox göyçək düşüb.
O güldən ürəyi bənövşə təkdir,
Adı qafiyə tək şerə tək düşüb.

122

Gözəllik bağında zülfünlə çöhrən,
Bərabər yaranıb, əhsən, min əhsən!
Gecəyə, gündüzə zinətsən yaz tək,
Yazda artıq deyil gecə gündüzdən.

123

Günəşin tilsimin sındırdı üzün,
Utanıb gizlətdi kölgədə özün.
Getdi günbatana solmuş üz ilə –
Matəm zülmətində o yumdu gözün.

124

O iki həftəlik sevimli qəmər,
Gəlib Xaqanidən üzrlər istər,
Günəş ki, zərrəyə meyl göstərdi,
Zərrə günəş sarı uçmazmı məgər?

125

Bu eşqin atəşi od vurdu mənə,
Ürəyim qan olub hey dönə-dönə.
Mən fikirləşmirəm ki, dərdim vardır,
Dərd budur ki, fikrim çatmayır sənə.

126

Zəncinin zülfü tək gecə pərişan,
Bəzəndi ulduz tək sevimli canan.
Məstanə-məstanə gəldi yanıma,
Taledən onunla olduq kamiran.

127

Necədir nərgizin, o məxmur camın?
Necədir tər püstən, zərif badamın?
Ey mənim canımın günəş dərmanı,
Necəsən, necədir istəyin, kamın?

128

Gözəlim gəmiyə olubdur səvar,
Küləyin əlinə vermiş ixtiyar.
Məni qəm küləyi salıbdır əldən,
Onu da aparır əsən bir ruzgar.

129

Bir gözəl eşqilə könlüm olub qan,
Bir düz söz deməyib bizə heç zaman.
Bu səhər qarşıma çıxdı, söylədim,
Nə etsən etgilən, sənindir fərman.

130

Ürəyim quş kimi əsirdir çoxdan,
O qoşa ləlinə aşiqəm, canan.
Adına təng olub büsbütün cahan,
Dinclik yox, ta ki var o cananda can.

131

Fələkdən bəlalar, nakəsdən böhtan,
Bunlardan ağırdır, ayrılıq, hicran.
Çətindir dilbərdən ayrılmaq, ancaq
Alçağa möhtaclıq ondan da yaman.

132

Nə oldu hasilim dünyadan, heç nə,
Mənimçün nə verdi bu dövran, heç nə.
Cəmşidin camıyam, sınarsam, heç nə,
Bir şamı söndürsə bir tufan, heç nə.

133

Bir heçdir bu vücud, zindəganlıq da,
Bu saray, bu dəsgah, bu soltanlıq da.
Ömür sərmayəsi bu cavanlıqdır,
Görürəm ki, heçdir bu cavanlıq da.

134

Bu ömrün əsası qəmdir, Xaqani,
Zülm ilə ülfətin birdir meydanı.
Zülm ilə gəlibdir bu can bədənə,
Zülm ilə çıxacaq hamının canı.

135

Fələk öz kinində möhkəmdir hələ,
Namərdlər əlilə qurur min tələ.
Onlarla əlbirdir, çalışır bəlkə, –
Məni də alçaldıb gətirsin ələ.

136

Yanmasın, neynəsin qəmdə Xaqani?
Nə desin, yağdırır fələk bəlanı,
Şam kimi oddadır həyatı bütün,
Nə cürə yanmasın atəşdə canı?

137

Xaqaniyə tərif deyir asiman,
Sən onu söyürsən, ey alçaq, nadan,
Nə desə qoy desin səninkimilər,
Yaxşı sirkə olur yaxşı şərabdan.

138

Ədalət göstərib guya ki, soltan,
Deyib Xaqaniyə eylərəm ehsan.
Deyin ki, bu bəxşiş nədir mənimçün,
Ömrümdən bircə gün qaytar, bacarsan.

139

Yolunu oğru tək kəsərsə qəza,
Səni öz evində çulğayar bəla.
Gələrsən köməyə haqq mərhəməti,
Sənə hasar olar açıq bir səhra.

140

Dəyişməz üzümün rəngi, ey saqi,
Ayrılmaz könlümdən bu qəm sorağı.
Badənin ləbaləb, ya bir az kəm ver,
O sellər tərpətməz bu nəhəng dağı.

141

Qəmlərin qəlbimə sarı yol alır,
Dərdlərin sinəmdə gəlib yurd salır.
Könlümü qapında qurban eylədim,
Torpaqdan eşqimin ətri ucalır.

142

Nakəslər əlindən ağlayır cahan,
Hərdənbir tapılır dərd bilən insan.
Xaqani, onlardan yox bu dövrdə,
Gözləmə, uzaqda qalıb o karvan.

143

Əfsus, könül getdi can da qalmadı,
Sayə də ardımca kölgə salmadı.
Mən sənin qəminlə məhv olub getdim,
Bir kimsə halımı xəbər almadı.

144

Rafizi bir rəhbər görür şeytanı,
Atıbdır dünyada dini, imanı,
Qələtdir əməli, xətadır işi,
Xarici görünür ona Xaqani?

145

Tapşırdı hicrana o canan məni,
Saldı min bəlayə bu hicran məni.
Olmuşam yarımın ləbindən məhrum,
Ayrılıq eyləyib pərişan məni.

146

Qulağım kar olub, gəlməz bir xəbər,
Yoluna baxmaqdan kor olub gözlər.
Könlüm adətini başa düşmədi,
Odur ki, ardınca çırpınıb titrər.

147

Ömrümün bağında oxumaz bülbül,
Nə lalə qalıbdır, nə sərv, nə gül.
Əyyam xırmanında qəm küləyindən –
Nə danə qalıbdır, nə də ki, sünbül.

148

Elə ki üz qoydu dərdin könlümə,
Sıxıb dişlərimi, dalmışam qəmə.
Yalnız bu dişlərdir könlümlə mənim –
Dar gündə olubdur şərik dərdimə.

149

Bəxtimi fələklər geri göndərə,
Dərbədər könlümdən bir xəbər verə.
Sənə bu sinəmdə hicran odları,
Vüsal xəcanımı yaza döndərə!

150

Telin bənövşəyə dedi, qulumsan,
Baş əydi önündə o, heyran-heyran.
Bağda bənövşənin artdı şərəfi,
İltifat göstərdi belə bir canan.

151

Gecəydi məktubun gələndə mənə,
Oxudum, bir daha oxudum yenə.
Parladı hər sözdən mərifət nuru,
Mənə həyat verdi günəş yerinə.

152

Xaqani, kamına çatdırmaz dildar,
Bir ümid işığı saçmaz ruzigar.
Ömrün arzularla yetişdi sona,
Əlində olmadı heç vaxt ixtiyar.

153

Yaxşı, pis, nə etsə yar özü bilər.
Öldürər, bağışlar, yar özü bilər.
Nə qədər diriyəm, dönmərəm ondan,
Sonra da nə qılar, yar özü bilər.

154

Məni bir busəylə şad etmədin sən,
Yandım dərd içində, yad etmədin sən.
Halımız nə cürə, de, yaxşı olsun,
Yanırkən mən odda dad etmədin sən.

155

Öpərkən inciyib dodağın məndən,
Od tutdum özüm də səni öpərkən.
Dişlərim incidib dodaqlarını,
Bəs mənim təqsirim nə olub görən?

156

Ayla gün bir quldur gül rüxsarına,
Zülfün qoşun çəkib can diyarına.
Dağıtdın zülfünü könül tutmağa,
Qoşunun xoş gəlib qurbanlarına.

157

Xaqani səninlə bağlamaz peyman,
Çox etmiş əhd üstə səni imtahan.
Biganə çıxdılar köhnə tanışlar,
Yaxın olmayacaq təzə onlardan.

158

Ey məni ləlilə öldürən canan,
Aşiqlər qəlbini qan eylədin, qan.
Nə qədər imkan var yapış əlimdən,
Nə qədər yıxmayıb qorxulu tufan.

159

Saçların üzündən uçar naz ilə,
Könüllər ovlayar bu pərvaz ilə.
Qan oldu könüllər sənin nazından,
A zalım, bir azca nazın az elə.

160

Xaqani, qəlbinə qəm vurdu yara.
Ahından dünyalar geyibdir qara.
Fələk mərd çöhrənə şillələr çəkib,
Dönmüsən boğulmuş asimanlara.

161

Ey gözəl, gecəni, bax, yendi səhər,
Dur gətir badəni, gülsün könüllər.
Aç xumar gözünü bir dəm uyğundan,
Nə üçün yaşayaq belə bixəbər.

162

Xaqani, hər gecə şəbistan olmaz,
Bu nemət müflisə, bil, asan olmaz.
Hər axşam sən vüsal xəyalındasan,
Həmişə Ay doğmaz, yar mehman olmaz.

163

Fələk göy atını çapırdı yenə,
Xaqani, dövranda meydan yox sənə,
Baxma ulduzlara, baxma aylara,
İlişmə səmanın zər həlqəsinə.

164

Xaqani, zəmanə qəddardır, qəddar,
Kimlərə tapşırır gör qızıl açar?
Sən onun evindən çək ayağını,
Qalsın Xızır üçün qoy hər nəyi var.

165

Xaqani sənətdə sayıldı soltan,
Qızıl bir təxt üstə o verdi fərman.
İndi bir sozalan çıraq kimidir,
Titrəyir ruzgarın dalğalarından.

166

Sənə yar olubdur göylər, fələklər,
Bəxtinin bağçası yetirir bəhər.
Şor yerin gül verir, qoran da şərab,
Zəhər də lütfünlə olur qənd-şəkər.

167

Lütf elə, gözəlim, sən Xaqaniyə,
Əsərinin hakimi, sultanı deyə.
Qəsrindən quyuya işıq saçırsan,
Kölgəni quyudan çıxartdın göyə.

168

Xaqani, saraydan kənar ol, kənar.
Başqa bir fel üçün ver fərman, qərar.
Günəşə qulluq et nilufər kimi,
Vermə pərvanə tək oda ixtiyar.

169

Ey fələk, yarımı gətir səfərdən,
Salmasın bizləri söylə nəzərdən.
Könlümün halını söyləyib bir-bir,
Cavab al mənimçün o şux dilbərdən.

170

Yandırdı könlümü qəzəb oduyla,
Yudum yeddi çayda, bəlkə pak ola.
Sənsə, ey zamanın mənəm deyəni,
Bir tuluq zəhərsən öz varlığınla.

171

Könül torpağını yandırma odla,
Qıyma ki, yerində küllərim qala.
Şad etmək gəlməyir əgər əlindən,
Barı qəm-kədərlə salma gəl yola.

172

Adına şəhərdə bəslənir hörmət,
Çəkirlər minləri vəslinə həsrət.
Üzündən nur alır göylərdə günəş,
Şirvanı, ey mələk, eylədin cənnət.

173

Günlərin çıxacaq bir gün bacadan,
Bu quşun uçacaq bir gün buradan.
Tutaq ki ilboyu dostun ilə sən, –
Bir gün də nakəmsən, görəcək düşmən.

174

Gözünün fitnəsi tutdu göyləri,
Tülküyə döndərdi hicranın şiri.
Gözəllik tacıdır o zülfün sənin,
Əmr edib hökmünlə aldın hər yeri.

175

Gecədir, üzünü göstər, ey qəmər,
Xaqani pərdəsiz yetirsin nəzər.
Gecənin qapısı bağlansın deyin,
Bu vüsal çağında yubansın səhər.

176

Gecəyə qaranlıq versin o saçlar,
Ey gecə, səbr elə, dayan, nə olar?

Buludlar, bağlayın Ayın üzünü,
Ey səhər, çöhrəni çulğasın qübar.

177

Aşiqin könlümdür, mən neyləyim, mən?
Sən məndən əl götür, yapış könüldən.
İnsaf et, zülmündən gəlmişəm cana,
Dostunam, deyiləm mən sənə düşmən.

178

O könül Kəbəsi qəmlidir hələ,
Bizimlə qəzəblə cəng edir hələ.
Nəyimiz var idi, qurbanı etdik,
Düz gəlmir yenə də gəc gedir hələ.

179

O getdi, könlüm də getdi onunla,
Ömürlük bir səfər etdi onunla.
Gözlərim yoldadır, qulağım səsdə,
Fərəhim, həyatım bitdi onunla.

180

Əsirdir Xaqani, öldürmə, ey yar,
Düz olub peymanı öldürmə, ey yar.
Bir quşdur, düşübdür sənin toruna,
Sənədir gümanı, öldürmə, ey yar.

181

Buğdayı gözəldir, behiştə bənzər,
Aşiqlər Adəm tək önündə gəzər.
Xaqani, nə üçün qovur o məni?
Cənnətdə buğdaya əl atdın məgər?

182

Xaqani qapında torpaqdır sənin,
Məğrurdur həyatda bir atəş təkin.
Başında o qədər sevdası var ki,
Od ilə, su ilə o sönməz yəqin.

# MÜCİRƏDDİN BEYLƏQANİ

*XII əsr Azərbaycan poeziyasının görkəmli nümayəndələrindəndir. Doğum və ölüm illəri dəqiq məlum deyildir. Ədəbi irsindən dövrümüzə bir "Divan" gəlib çatmışdır. Azərbaycan atabəylərindən Şəmsəddin Eldəgizin, Cahan Pəhləvanın və Qızıl Arslanın saraylarında yaşayıb-yaratmış, ədəbiyyat tarixinə Xaqani Şirvaninin şagirdi və davamçısı kimi daxil olmuşdur. Dövrünün bir çox elmlərini – o cümlədən tibb, astronomiya, riyaziyyat, tarix, coğrafiya, fiqvə ilahiyyatı mükəmməl öyrənmişdir. Divanında müasirlərinə, xüsusilə Xaqani və Fələkiyə həsr etdiyi şeirlər də vardır. Xaqani yaradıcılığını yüksək qiymətləndirmişdir. 1979-cu ildə Təbriz universitetinin professoru Məhəmməd Abadi müxtəlif ölkələrin nadir əlyazmalarına əsasən "Mücirəddin Beyləqaninin divanı" adlı kitab nəşr etdirmişdir. "Divan"a şairin qəsidə, qəzəl, şikayətnamə, qitə, müləmmə, tərkibbənd və rübailərdən ibarət 5469 beyt şeri toplanmışdır. Səlcuq hakimi Rüknəddin Arslana və Dərbənd hökmdarı Seyfəddin Arslana mədhiyyələr həsr etmişdir.*

*Qəbri Təbrizin Sürxab məhəlləsindəki qəbiristanlıqdadır.*

## QƏSİDƏLƏR

1

### XAQANİNİN VƏSFİ

Bu dövr edən fələk, üzdən gümüş kimi görünən,
Üzümə gözyaşımı simu-zər edibdir həmən.

Üzüylə gözyaşı altun-gümüş olar, əlbət.
O kəs ki, kəc fələyə bağlı olmuş əvvəldən.

Fələk həm oğru və həm hoqqabaz, oyunbazdır,
Çıxar o yüz oyun ilə bir anda mərəkədən.

Vurar o dövrə, əzər dənləri dəyirman tək,
Su, od ümmidi ilə, mənsə düşmüşəm əldən.

Xilas olsam əgər bu ağır dəyirmandan,
Məsih tək edərəm göyləri yəqin məskən.

Sən ey kədər kölgəsi, çirkinüzlü, bədtiynət,
Sədaqətini danan, məclisə xələl gətirən!

Çırağı söndür, edə cilvə qoy gecə gəlini,
Namaza dur ki, xoruz banladı səhər tezdən.

Götür silah kimi "lahövlə"ni qorunmaq üçün,
Təkəbbürün dibinə yoxsa qərq olarsan sən.

Cahanı çulğadı tufan bəlası Nuh kimi,
Gəmini sal dənizə, et iradəni yelkən!

Saqınma odla sudan, xalq üçün hədəf olsan –
Məzəmmətə, qaxıca, yüz bəlaya tuş gəlsən.

Cəfa əlindən ucalmış fələklərə İsa,
Sığındı Qafa o Simurğ zülmü möhnətdən.

Götür uzaq yola, azuqə eylə təqvanı,
Çalış bu yolla həna mənzilinə tez yetəsən.

Qənaət ilə enişdə dayan ki, Cəfər tək
Bu nərdivanla uca bir məqama yüksələsən.

Zəburu sidqlə Davud əgər tilavət edir,
Sənə nə faydası vardır, dilin ki bilməzsən?!

"Necə? Neçün?" arasında qalıbsan, ey qafil!
Qəbula, rəddə cavab istəmə "Neçün? Necə?"dən!

Ayıq iş əhli deyilsənsə, söyləmək olmaz, –
Məqami-xovfü ricanı belə sual edəsən.

"Neçün? Necə?" tələsindən xilas olaq axır, –
Sonuncu şair ilə kirdigar fəzlindən.

Fəzilətin atası, hikmətin ulu günəşi,
Fəzilət əhli alar fəzl Əfzələddindən.

Onunla fəxr eləyər yer üzündə cümlə bəşər,
Qoyar göy əhli başa tac nüzmü nəsrindən!

Zəmanəmizdə Məsihü Kəlim Xaqani –
Ömürdə Xızrdan üstün, həyada Yəhyadən!

Ədəb bir əbcədd olub eşq məktəbində onun,
Ağıl yanında inan qətrədir damlacıqdı dəryadən.

Rəqəmləri onun ağlı olub nizama salan,
Cahanı elmi onun qurtarar düyünlərdən.

Olubdur ağ-qaranın naməsinə çün agah,
Açıb o pərdəni ki, gündüz ayrılır gecədən!

Hünər kitabına nəqş etdi yeddi iqlimi,
Ədəb səhifəsi doqquz səmada səb edilən.

Qəzəb səmumi edər düşmənini xar, həlak,
Vəfa nəsimi sevər dostları dalınca çəkən...

Önündə şeir bahadırları olub təslim,
Sözünə valeh olur bu cahanda hər düşünən.

Nəsihətiylə o pəhrizə səsləyir, əmma –
Şəfa şərabı içirdir o, xəlqə şerindən.

Quru damağına din, ənənə ifadəsinin –
Odur sözüylə lətafət dəvasını yeridən!

O, bidət əhlini, müşrikləri hidayət üçün –
Təbib tək necə məcun yaratdı nəcmindən!

Böyükdür izzəti, çox sadə xanəgahində –
Açıldı süfrəsi islamın, oldu dəvətedən.

Böyük həkimsən, olmuş biliklərinlə sənin –
Fəzilət aləmi abad bağı-cənnətdən.

2

Ey Ay kimi gözəl üzünün çakəri günəş!
Ay bir qulun, rəvamı ola digəri günəş?

Ay tək üzün önündə utanmış yəqin, odur –
Atmış başındakı hamı nəxvətləri günəş.

Müşk ətri zülfünün fələyə qalxmasın deyə, –
Min yerdə şöləsiylə yaxar telləri günəş.

Eşqində paltarı qara, rüxsarı sapsarı,
Ey simbər, sayıb ötürər illəri günəş.

Rüxsarın həsrətiylə mənim tək səhər-səhər –
Hər gün saralmış üzlə atar bəstəri günəş.

Kim görməyib üzünlə saçın, dərk eyləməz –
Ənbər necə qucar günəşi, ənbəri günəş.

Süsənbərin üzü günəşindən cila tapar,
Hərçənd ki soldurar gülü, süsənbəri günəş.

Nərgiz gözün üzün günəşindən ki süslənər, –
Süsləndirər necə güli-nilufəri günəş.

Çox hüsn dəftərini edibdir mütailə,
Yalnız üzündə tapmış o sərdəftəri günəş.

Bir ömr şərqdən gedər hey qərbə, axtarar –
Yaş göz, quru ağızla, belə dilbəri günəş.

Şərq ilə qərbi gəzdi, üzündən daha işıq,
Adil şahımda tapdı bu rəyi, fəri günəş.

Şahlar şahı olan o Qızıl Arslandakı –
Hüsnü iradədən alıb o zivəri günəş.

Qüdrətli şahın naminə xütbə üçün seçib –
Cövzanın üstündəki o uca minbəri günəş.

Qorxmuş o sədmədən ki, yetişdi vücuduna,
Altun kimi sarıüz edər kürkləri günəş.

Sikkə vurar səxavətinin namına onun,
Daş sinəsində ləli, suda gövhəri günəş.

Ey lütf kanı, ey kişilik rəmzi, görməmiş –
Min mədən içrə sən kimi bir cövhəri günəş.

Amal qibləsi qapını xalq bilir, odur –
Astanana sərər o qızıl telləri günəş.

Xülqün o bəhrəni ki, qılıb xəlq üçün əta –
Qərq etməmiş o cür işığa elləri günəş.

Hökmündən istəsə qaçıra çərx əgər boyun, –
Bil, zərrə-zərrə doğrayar o peykəri günəş.

3

Arzu atını çapma ki, ömrün qaçağandır,
Yoxluq işinə başla ki, köçməklik əyandır!

Aşiqsən əgər torpağa, ardınca sürünmə,
Var yolda rəqibin, ona məşuqun həyandır.

Dünyada bu gün kim özünə yer tapacaq, kim?
Varsa o qənaət bucağında oturandır.

Meydandı bu dünya evi, dövran dəli köhlən –
Minmə ona, saxla yaradan başın, amandır!

Yoxdursa rahat dayçası, gəl etmə təəccüb, –
Əvvəldən ala at nə doğulmuş, nə doğandır.

Bu yeddibucaq aləmi yağlı tikə sanma, –
Yeddi dənizi, yağsa da, əslən o sudandır.

Məlhəm hanı ki, yer üzünü tutdu naxoşluq?
Rüstəm hanı, Bijən quyuda halı yamandır!

Zalım fələyin, bax şəfəqə, zülmünü bir gör,
Qanınla sənin hər gün onun daməni qandır.

Dörd ünsür o şəmi hazır etmiş ki, yağından –
Yeddi abı tağı fələyin nur saçandır!

Xoşhal kişi axtarma cahan içrə, fələkdə –
Şən varsa, qadındı, o da ki rud çalandır!

Qaldırma yaxandan başını, xeymə quran çərx –
İplər uzadıb xeymədən, insanı boğandır.

Zənn etmə fəna iynəsi batmaz gözünə, bax, –
Kirpik özü də şəklcə bir iynə, tikandır.

Vəsf etmə cahan bağını, bir güllərinə bax, –
Süsən – kar edən, nərgizi də göz çıxarandır.

Dövran mənim ahım kimi yüngüldür, həm isti, –
Dəhr isə dəmir kimi soyuq, həm də girandır.

Yoxdur qəmimiz, könlümüzə fərqdi sultan,
Kavus niyə qorxsun, onu Rüstəm qoruyandır.

Kök quş yeməyir qəm, yeyirəm mən ki, qəmim həm –
Qəlbini yeməkdən kökəlib, sanki qabandır.

Çəkdimsə təmənna dişimi, illət odur ki, –
Göy atlanaraq, hirslə ardımca rəvandır.

Bir qəlbiaçıq qalmadı, versin səsimə səs,
Dünya nə gülüstan, xaraba, külsovurandır.

Ah, öldü könüllər, bu ölücanlılar üstə –
Hər sübh xoruzlar banı şivən qoparandır.

Dünya qəmi bağrın qana döndərdi Mücirin,
Bir arpası var, xərmən üçün bərk nigarandır!

4

Mənim könlüm cavanlıqda kədər, qəmdən cüda olmaz,
Məgər aləmdə şadlıq barədə söhbət rəva olmaz!

Gülər üz, şad olar xatir səmimi dost olan yerdə,
Belə dost olmasa, şadlıqdan əsla səs-səda olmaz!

Cahanda hər qədər nemət bir insan etsə də hasil,
Vəfalı dost qədər qiymətli nemət ortada olmaz!

Tapılmaz bir elə kəs ki, ola bir an mənə həmdəm
Gədanı qılmaram həmdəm, xətasız çün gəda olmaz!

Zəmanə yoxsa əhd etmiş, bu haqda bağlamış peyman,
Bizim dövranda şadlıqla könüllər aşina olmaz!

Hanı bir öylə dost ki, söhbəti qəlbə səfa versin?
Tapılmaz bir elə həmdəm ki, təbində cəfa olmaz!

Nəhayət, bir düşün, düşmənlərindən sən nə gözlərsən –
Elə dövranda ki, dostda səmimiyyət, səfa olmaz!

Ürəkdə qəm, kədər, nə bəhrəsi var padişah olsan?
Könül şad olsun, aləmdə ki, hər kəs padşah olmaz!

Ağıl qəlbi murada çatdıran ömrə verir qiymət,
Muradı verməyən bir ömr üçün qiymət vəfa olmaz!

Əlindən dost getmişsə, fərəhdən bir əsər qalmaz,
Külək tüğyan edərsə, lalə ömründə bəqa olmaz!

Tələb qılma əbəs asudə ömr etmək bu dövrandan,
İlan ağzında qəlbin dərdinə, bil ki, dəva olmaz.

Bütün aləmdə bir üns məclisi tapmazsan, axtarma –
Ki, onda əhl naəhlin əlində mübtəla olmaz.

Mənə göstər, cahanda bir elə xoşhal vardır ki, –
Keçən hər xoş günündə min məşəqqət, min bəla olmaz?

Cahanı fəth edibdir şöhrətim, əmma yenə əfsus, –
Muradım hasil olmaz, mətləbim əsla rəva olmaz.

Özün insaf elə, yaxşı düşün, bil ki, mənim könlüm –
Deyil asudə aləmdə, yəqin məndən səva olmaz.

Görüm bu işləri Tanrı, Nəhayət, xeyrə çatdırsın,
Dilimdə xalq üçün bundan daha yaxşı dua olmaz.

5

Sənin camalını görməkçin Ay hədiyyə verər,
Canım gedib, yox hədiyyəm, mənə üzün göstər.

Mənəm ki, qıldığın hər cövrdən xəbərdarəm,
O sənsən, hali-dilimdən mənim yoxundu xəbər.

Əcəb deyil, mənə qəm ordusu hücum etmiş,
O yerdə ki, şah oturmuş, qoşun səlamə gələr.

Olub otuz gecəlik bir ay, itmişəm gözdən –
Sənin o bədr üzünün möhnətindən, ey dilbər.

Mənəm ki, səndən uzaq, könlüm isə məndən uzaq, –
Uzaq bu fasiləni yol deyil, könül ölçər.

Qaraldı bağrım aləmdən görəndə ay üzünü,
Qara saçın o gülün üstünə qübar səpər.

Qaraldı ahlarımın tüstüsündən güzgün, yar!
Bu rəsmdir, qaralar güzgü, tüstü versən əgər.

Gün olmasın əməlindən sənin şikayət edəm,
İran şahı Seyfəddinin yanında zərrə qədər.

Sən ey şüuru zaman halına olan agah!
Verən sitarələr əsrarını dünyaya xəbər!

Verər o xoş nəfəsin məclis əhlinə şənlik,
Qədəmlərinlə sənin təxt yüksələr, bəzənər.

Bu bəllidir, atının dırnağı dəyən yerdə –
Tikan yerinə açar gül, daş üstə lalə bitər.

Ədalətinlə hava etidalını pozmaz,
Nə kəhrəba samanın qapmağa cəsarət edər.

Günəş çıxanda xitabı budur sənə sübhün –
Ki, sən aləmə həm padşahsan, həm rəhbər.

Ədalətindən olub qırğı kəkliyə həmdəm,
Şirə vurar dağını, tülkü eyləyər çarək.

Bu şeir şənini vəsf eyləyən qəsidə deyil,
Var onda bəxtim əlindən şaha şikayətlər.

Aparsalar günəşə nuru, bu cəhalət olar,
Balıq atılsa dübarə suya, dənizdə üzər.

Məni cahan tanıdı xidmətində, ey şahım!
Ağıllılar arasında adım olub əzbər.

Sənin, mənim kimisi hər qədəmdə yüz mini var,
Yoxumdu səndən əlavə kəsim, kəlam bitər.

Mən olmadımsa əgər xidmətində bir neçə vaxt, –
Demək deyildi ki, ruhum dəxi uzaqda gəzər.

Uzaq atan məni şahın soyuqluğu oldu,
O nazənin ürəyin, var güman, yenə isinər.

Həmişə izzətü cahü cəlalü mərtəbətin, –
O bəxtin ilə ucalsın ki, kamına yetirər!

Birisi günbəgün, o digərisə vaxtaşırı,
Birisi aybaay, o digəri uzun illər.

6

## TƏRKİBBƏND

### MÜƏYYƏDƏDDİN FƏLƏKİ ŞİRVANİNİN ÖLÜMÜNƏ

Görməmişdir bir kəs aləmdən ümidinə vəfa,
Tapmamışdır bir ürək dərdinə torpaqdan dəva.

Bu abı xərmən fələkdən kimsə bir dən tapmadı,
Dən kimi bağlandı torda, qisməti oldu fəna.

Dəhr ikiüzlü, fələkdir üzgörən, bax, neylədi, –
Xeyrlə başlandı hər iş, axırı oldu xəta.

Bərbəzəkli səhnəsindən aləmin ayrılmadan –
Kim səadət sahilində saldı məskən daima?

Göz önündə qəhr əliylə baş kəsər çərxi-fələk,
Qəddini əymişsə, cəhd eylər kəsik baş qapmağa,

Kim rübab tək başını bir ləhzə dik tutdu, fələk –
Bir qulaqburması ilə tez ona verdi cəza.

Heç kəsin əmriylə aləm çəkmədi əl fitnədən,
Heç kəsin cəhdi dəmirdən etmədi hasil tila.

Qəhrəmanlar tacını qan içrə qəltan görmədən –
Geymədi matəm libası, tutmadı dövran əza.

Toxluq axtarma cahandan, bu evin bir rəsmi var:
Hər gələn gəlsin susuz, ac etsin ondan əlvida.

Həmdəm olma aləmə, gör həmdəmini, ey Mücir!
Olmadı sani Məsihə, bu vəfasız aşina.

Canlara dərman Fələki, harda o sahib-cəlal,
Bədnəzərdən zülm gördü ondakı fəzlü kamal.

Bir könül ki, dəhr oxundan çəkməsin qəm, kim görüb?
Bu cahanda ömr edən asudə bir dəm, kim görüb?

Bu fələk altında ki, zahirdə ayna gəzdirir, –
Ayna tək saf qəlbə olsun çərx həmdəm, kim görüb?

Bu dəyirmandan əgər itmişsə bir qəm danəsi, –
Bəhrəsini dadmasın övladı-Adəm, kim görüb?

Mən mən oldum, könlümü bir an da qəmsiz görmədim,
Bəlkə məndən özgə var xoşbəxt, biqəm, kim görüb?

Bir gəmi yoxdur bu aləmdə verə xəlqə nicat, –
Varsa da, aləm arasında onu həm kim görüb?

Görmüsən yüz xəstə göy altında, ondan söyləmə –
Söylə ki, bir xəstəyə dünyada məlhəm kim görüb?

Qan içində qərq olub itdi əgər yüz min könül,
Bir könül bu ruzigarda şadü xürrəm kim görüb?

Qan içində qərq olub itdi əgər yüz min könül,
Bir könül bu ruzigarda şadü xürrəm kim görüb?

Harda insan var, o yerdə yox insanlıqdan əsər,
Bir şəhərdə korlar ilə güzgü bahəm kim görüb?

Çox bina keçmiş zamanlardan qalıbdır yadigar,
Qəm binasından daha abadü möhkəm kim görüb?

Qanlı göz yaşında qərq olmuş Mücirin çöhrəsi,
Mən kimi əldən verən Sədri-mükərrəm kim görüb?

Canlara dərman Fələki, harda o sahibcəlal,
Bədnəzərdən zülm gördü ondakı fəzlü kamal.

Canların dərmanı axır bu cahandan getdi, ah!
İncə söz sərvi küsüb, baği-bəyandan getdi, ah!

Lütfü yüksəldi günəş tək yoxluğun dağ başına,
Axdı saf su çeşməsi, bu bustandan getdi, ah!

Hər nəfəsdə nitqi ilə xalqına can bəxş edən,
Can kimi sıxdı onu, sarsıtdı dövran, getdi, ah!

Cah-calalın riştəsində o misilsiz dürr idi,
Riştə sarsıldı, qırıldı dürri-qəltan, getdi, ah!

Bu oyunbaz dəhr əlində o gözəl bir nəqş idi,
Bir əli göstərdi, bir əl qıldı pünhan, getdi, ah!

Sözdə məna gəzmə, artıq söz əmiri qalmayıb,
Olma gövhər arzusunda, gövhəri-kam getdi, ah!

Nurlu bir məşəldi, feyzin baş yolunda xatiri;
Söndü məşəl, feyz də çıxdı o yoldan, getdi, ah!

Ağlı qüdsiyyət dilini əzbər etmişdi, odur, –
Torpağın kamında dil tək oldu nalan, getdi, ah!

Möcüzə kim göstərər, atmış müəyyəd aləmi,
Ox necə uçsun, kaman ayrıldı yaydan, getdi, ah!

Bu qoca çərxi, bilirsənmi nədən göz-göz olub?
Bir cavan sərvi-rəvanı gülistandan getdi, ah!

Canlara dərman Fələki, harda o sahibcəlal,
Bədnəzərdən zülm gördü ondakı fəzlü kamal...

Mən onun dərdiylə qəlbimdə cığırlar açmışam,
Gözlərimdən tökməyə ulduzlar, arxlar açmışam.

Ahlarımla çəkmişəm pərdə ayın rüxsarına,
Çadırı Zöhrə üzündən mən əzadar, açmışam.

Qəddini əydi fələk yerdən gövhərlər yığmağa,
Gördü ki, mən gözlərimdən dürri-şəhvar açmışam.

Qəm yeli başımdakı səbrin papağını alıb,
Mən papaqsızlıq üzündən başımı xar açmışam.

Çör-çöpəm, gözdən axan qanlı yaşı silsəm əgər,
Bağlanılmaz o yaxam ki, ağlayıb zar, açmışam.

Dəhrdə yanlış görən varsa, mənəm, yoxsa neçün,
Gözdə nurum yoxdur, əmma görsə də tar, açmışam.

Yeddi dərya, səkkiz olsa, sən təəccüb eyləmə,
Dost qəmində gözlərimdən qanlı çaylar açmışam.

Düşmənin torpağı bildim dün gecə Cövzanı mən,
Ahım ilə qurşağında sanki zünnar açmışam.

Göydəki Nəsrin gərək mən qol-qanadını qıram,
İndi ki, əflak qəsdində qanadlar açmışam.

Lütf dünyası gedibdir görməməkçün aləmi,
Qarşımda bağlı qapı ardında tumar açmışam.

Canlara dərman Fələki, harda o sahibcəlal,
Bədnəzərdən zülm gördü ondakı fəzlü kamal.

Ey vücuduna qəmü möhnət xədəngi tuşlanan!
Tutdu ruhun barigahında səfanın aşiyan!

Görmədi çünki üzün, oldu üzü pul-pul günəş,
Sən ki, getdin, qalmadı sözdə vəchətdən nişan.

Kəsdi ömrün kisəsindən bəndi bu zalım fələk,
Kasə kimi bir ağızdır varlığı, insan udan.

Dönmüşəm dərdinlə Nahidin yanan mizrabına,
Matəmində çəngini Nahid cırmışdır, inan.

Çərx ayaq üstə dayandı, görmədən əyləşmədi,
Qəddinə oldu kəfən, tələt ki, vermiş hökmran.

Həftənin ehsanına Nəsrü Əsir ilə Şəhab,
Şiş, yanar təndir quş olmuşdur, məkanın asiman.

Pak təbindən apardın töhfə xaslar kuyinə,
Ey özü getməklə şeri burda rövnəqdən salan.

Ruzigar bağında gördün yan-yana güllə zəhər,
Lalə tək üz göstərib, tez qaçdın o gülzardan.

Sən gecə tapdın ətək altında yer, olcaq səhər –
Gəl səninlə yerləşək bir köynək içər mehriban.

Çıxmasın daim əlindən həqq rizasının teli,
Ey əlimdən qaçması ilə məni ağlar qoyan!

Canlara dərman, Fələki, harda o sahibcəlal,
Bədnəzərdən zülm gördü ondakı fəzlü kamal.

7

ŞİKAYƏTLƏR

Ruzgarın qəlbində bir zərrə məhəbbət qalmayıb,
Atmış ulduzlar həyanı üzdən, hörmət qalmayıb!

Camını xalqın qanıyla doldurandan ruzigar, –
Bir kəsin camında xoş, ləzzətli şərbət qalmayıb.

Dəhr üzündən dostluğun gül rəngini silmiş tamam,
Ömr zülmündə səadətdən əlamət qalmayıb.

Torpağı gəzdim asudəlik, dövran dedi:
– Gəzmə, bu tordan o quş uçmuş, fərağət qalmayıb.

Sübh qəndili gecə manqalına daş vurdular,
Şölə, tüstü gəzmə, artıq səndə taqət qalmayıb.

Bir zaman ehsan qazanı asdısa dünya əgər, –
Nə bişirmiş, xam xəyaldan özgə nemət qalmayıb.

Dəhrdən vardır nicata iki yüz il yol, fəqət –
Məhvdən ümmidə bir addım da vüsət qalmayıb.

Oxşarı Simurğə var insanlığın bir barədə:
Bir quru addan savay onlarda izzət qalmayıb.

Qəm odunda qəlblər yandı, məgər ölmüş fərəh,
Sustalıb Cəmşid, məgər camında ləzzət qalmayıb?

Hər nə arzu istəyi vardısa, göz çəkdi Mücir,
Dünyadan kam almağa ümmidi, əlbət, qalmayıb.

8

Hər kim ki, dedi: – babamdır Adəm,
Şadlıqdan onun nəsibidir kəm.

Göstər mənə bir könül cahanda –
Min dərdə düçar etməsin qəm.

Vurdu yara könlümə zəmanə,
Min dərdimə sanki qoydu məlhəm.

Söylə, elə qəlb şad olarmı,
Bir ildə görə o iki matəm?

Qəm sağərinə nələr deyim ki, –
Könlüm əlinə keçər dəmadəm?

Can heyran olubdur, əqlim aciz,
Hər hadisə öz yerində möhkəm.

Dəhrin dönük olduğu o gündən,
Qəm könlümüz ilə oldu həmdəm.

Duz tökdü fələk gözünə xəlqin,
Şadlıq beli oldu qüssədən xəm.

Nə bir günümüz sevinclə keçdi,
Nə bir gecə işrət ilə bahəm.

Kamınca, bəli, zəmanə dönməz,
Hər kim ki, deyir, – babamdır Adəm.

9

Tezlik ilə bu ağır günlərimiz son tapacaq,
Qəlbimizdən qocaman dağ kimi möhnət qopacaq.

Şadlığın cah-calalın növbəsi axır yetəcək,
Qorxulu qəm-kədərinsə evi viran olacaq.

Ömrümüz, günlərimiz oldusa əzvaydan acı,
Çox şükür, əzvayımız indi şəkər bal dadacaq!

Meyimiz, sağərimiz həm sifət, həm saflıqda –
Quru su, yaş od olub, məclisi canlandıracaq.

Hər kəsin vardı cahanda qəmimizdən xəbəri, –
Könlümüz şad olan dəmdə xəbərlər tutacaq.

Eyşü işrət qurulub, şən keçəcək məclisimiz,
Aləmə fəthü zəfər ulduzumuz nur saçacaq.

Qıracaq qəm oxunu onda qəza şəmşiri,
Düşmən öz köksünü bu oxlara qalxan tutacaq.

Qan içirmişsə də dünya bizə çox, eyb etməz, –
Öz ciyər qanını düşmən yeyərək odlanacaq!

Bəxtimiz parlayacaq, şah qızıl sikkəsi tək,
Sarı altun kimi düşmənlər həsəddən solacaq.

Qəm ilə şadlığa yoxdur bu cahan içrə səbat,
Şad olan qəmlənəcək, qəmli olan şadlanacaq.

Hər nə cür olsa əgər, ömrümüzü xoş keçirək,
Həm kədər, həm də sevincin sonu bir gün çatacaq!

10

Ah, əfsus, o ləyaqətli cavanlar getdilər,
O səmimi dostlar, o dostluq qananlar getdilər.

Qəm də vardı, qəmduyanla çəkməyi asan idi,
İndisə qəmlər çoxaldı, qəmduyanlar getdilər.

Bir zərif insan haçandandır, cahana gəlməmiş,
Bu əcəbdir, minlər ilə incə canlar getdilər.

Məncə, bundan sonra yoxdur ləzzəti mey içməyin,
Əldə sağər, mey içib xoşdavrananlar getdilər.

Eşqbazlıq da itirmiş ləzzətini, doğrusu,
Gülyanaqlı, hüsnü dilbər, can alanlar getdilər.

Son on ildə tərsinə dövr eylədi doqquz fələk,
Çox cavan şahzadələr, mərd hökmranlar getdilər.

Harda şadlıq axtarım ki, qəm tutubdur aləmi?
Kimdən imdad istəyim ki, əl tutanlar getdilər?

O əzizlər ki, könül onlarla daim şad idi, –
Qaldı bir xoş xatirə, dərdə yananlar getdilər.

Halbilənlik qalmamış dünyada dostluq naminə,
Bircə-bircə dostluğa sadiq qalanlar getdilər.

Ox atır yoxsa o yaylarda bizə zalım fələk,
Oxlara tuş gəldimi, o qəhrəmanlar getdilər.

11

Kədərdən aləm içrə könlümüzdə yüz düyün vardır,
Quraq şənlik büsatı, şadlanaq, fürsət bu gün vardır.

İçək mey, davranaq azad, ki mey hər qəlbə dərmandır,
Edər xoşhal o qəlbi kim, kədərdən dopdolu qandır.

Fələk hey işvə göstərsə, ona biz verməyək qiymət,
Fələkdəndir – bizə olmuş cahanda dərd-qəm qismət.

Bizi tutmuş girov, nərd oynayır, bax, şadlıq ilə qəm,
Əgər şadlıq qəmi udsa, bizə şadlıq olar həmdəm.

Ağıllı eyş-işrətdən sipər sazlar bu anlarda,
Xüsusi indi ki, möhnət oxu vardır kamanlarda.

Zəmanə fitnəkardır, hiyləgərdir, həm də alçaqdır,
Onunla üz-üzə durmaz o kəs ki, əyni çılpaqdır.

Gərək cəngin sədası saf şərabdan, yar zülfündən,
Zireh hazırlayaq, ta qurtaraq dövran zülmündən.

Pisindən, yaxşısından aləmin qəmgin və şad olmaz –
Məgər bir kəs ki, dövran halına yaxşı nəzər salmaz!

12

Aman, ruzigarın əlindən, aman!
Tapmazsan vəfadan onda bir nişan!

Xoşbəxt o insana deyərəm ki, mən –
Azadlıq zəmanə köləliyindən.

Çalış etməyəsən ömrə istinad,
Deyil bünövrəsi bu tağın abad.

Xalqın ürəyində, düzünü desəm, –
Rahatlıq – əzabdır, ədalət – sitəm.

Açıq qapıları bağladı dövran,
Açdı bağlı olan yolları hər an.

Bütün yer üzünü dörd yana axtar,
Şad könüldən savay hər şey tapılar.

Deyəsən, qəmləri zəmanə bütün –
Yaratmışdır ancaq insanlar üçün.

Keçmişdə bizimlə dostlar ki, vardı, –
Könlü xoş, azadə, mərd adamlardı,

Gah əldə mey dolu cam tutardılar,
Gah polad qılınca əl atardılar.

Şirinin vəslinə onlardı məhrəm,
Fərhad qəmlərinə şərikdilər həm.

Bu fani dünyadan getdilər bir-bir,
Onları illərlə bir kəs yad etmir.

Dostlar məclisində könül olar şad,
Bəzəyi Dəclədən almışdır Bağdad.

Başımız bəlalı olmuş hər zaman,
Bu bəla hər şeydən ağırdır, aman!

Dostlar fərağıdır böyük müsibət,
Bu möhnət heç kəsə olmasın qismət.

13

Ayrılıq dərdinə kaş aləmdə bir dərman olaydı,
Qatlanılmaz dərdi hicranın bizə asan olaydı.

Çox könüllər var, dözər dərdə, yeyər hicran qəmi,
Kaş qəmlər də, könüllər də hamı yeksan olaydı.

Olmaya kaş vəsldən sonra acı hicran qəmi,
Dostların vəslində insanlar gərək soltan olaydı.

Dünyada bir kəs tapılmaz görməsin firqət dağı,
Firqətin öz bağrı, ey kaş, dağ ilə büryan olaydı.

Mən çəkən dərdin qəmin məcmusunun yüzdən biri
Yüklənə bir dağa kim, dağıma dağ heyran olaydı.

Kaş fələk dostlar qəmindən bir içim nuş eyləyə,
Naləsindən yer üzündə daima əfğan olaydı.

Canımı yandırmayaydı kaş getmişlər qəmi,
Şadlığımdan kəhnəşan mülkü mənə meydan olaydı.

Onların ayrılmasından qüssə çökdü bağrıma,
Dərdim olmazdı, əgər onlarla bu dövran olaydı.

Vurdu onlar toplarını tez bu meydandan kənar,
Kaş mən meydanda top, onlar hamı çövqan olaydı.

Dərd əlindən parçalardım çəmbərini göylərin,
Kaş əlimdə bircə günlük göylərə fərman olaydı.

Əql üzündən yoxsa da bu dərdə dərman, kaş, kaş!
Bir elə xoş gün gələ, bu dərdə də dərman olaydı!

Bağrıma qəmlər əlindən dalbadal dəydi yara,
Tab gətirməzdi, sınardım, qəlb əgər zindan olaydı.

Tanrının fəzli bizə sonsuz dözüm etmiş əta,
Yoxsa dözməzdi bu dərdə, səbr əgər ümman olaydı.

14

Bir gün, ey kaş, çataydı mənə həmdəmdən xəbər,
Diz çökərdi önümdə cəlalıyla fələklər!

Bircə ürək dostudur mənim arzum dünyada,
Dost olsaydı, mənimçün dəyişərdi dünya da!

Dostlar getdi, xəyalı getməz ancaq gözümdən,
Əgər getməsəydilər, qorxmazdım heç nədən mən!

Əzizlərim gözümdən itməsəydi, hər zaman –
Şən keçərdi həyatım, kam alardım dünyadan.

Gecə-gündüz bağrımı ayrılıq dərdi dələr,
Yoxsa işim olardı şənlənmək axşam-səhər.

Fəraq dərdi şadlığı silməsəydi təbimdən, –
Eyş-işrət dalınca gedərdim həvəslə mən!

Asanlıqla yol tapdım mən abadlıq mülkünə,
Kaş elə də çataydı əlim şadlıq mülkünə!

Bağrıma qəm yükünü yükləməsəydi dövran, –
Həyat şirin olardı mənə beçə balından!

Müqbiləm, olmasaydım müqbil əgər dünyada
Belə hakim olmazdım quruda, həm dəryada!

Bizə şahlıq tacını verən istəsə əgər, –
Ümidvaram, şadlıqdan yeni bir tac da verər!

15

Yaxşı düşməz, fələkdən şikayət etsəm əgər,
Acıqlansam fələyə, acıq nə bəhrə verər?!

Hər cürə yüz qəmim var, onun cövrü səbəbdir,
Hər cəhətdən yüz dərdə onun dövrü səbəbdir.

Bir qılıncla bölünsün, görüm fələk belindən,
O məni ayrı saldı diyarımdan, elimdən.

Qəza gözüm önünə qara bir pərdə tutdu,
Dostlar getdi, görmədim, hamı məni unutdu.

Nəciblər məclisindən uzaq düşmüşəm, odur,
Nanəciblər söhbəti ürəyimə od vurur.

Bu köksümdən asılı qəmli ürək odlanar,
Necə mehrab önündən asılan qəndil yanar.

Əgər qanın çoxluğu yuxu gətirir, nədən –
Qan dolu gözlərimlə yuxuya həsrətəm mən?!

Lövbər kimi ağırdım, indi bircə yolum var:
Ürəyim dənizlərdə batmağımı arzular!

Zirək quşdum, aldanıb düşdüm sənin toruna,
İndi məni yandırsan, nə çıxacaq uğruna?

Şən könlümü zəmanə savaşla dərdə saldı,
Gəncliyimi ruzigar oyunla əldən aldı.

Canım qanadı sınmış bir şahinə oxşayar,
Bir çadıram ki, onun iplərini qırıblar.

16

Cahanda qismət edibdir zəmanəmiz bizə qəm,
Fələkdən halımız olmuş fələk kimi bərhəm.

Könül cahanda əsər görmədi rahatlıqdan,
Məgər rahatlıq üçün var cahandan özgə cahan?

Uşaqlıq illəri, gənclik çağında da günümüz –
Əzab-əziyyət ilə keçdi, gülmədi üzümüz.

Öz istəyincə ürək vurmamış bir an da hələ,
Zəmanə, hadisələr verdi arzusunu yelə.

Bir istəyim var idi, xoş nəfəs alım bir an,
Dedi zəmanə: o qıtdır cahanda, tapmazsan.

Səadətin üzüyü olsa da əlimdə əgər, –
Möhür kimi yazılıb onda tərsinə sözlər.

Zəmanəmizdə mənə bir həqiqət oldu əyan:
Cahanda az tapılar könlü şad olan insan.

Hanı o dərdə qalan dost, o sirr duyan dildar,
Edim ürəkdə olan qəmləri ona izhar?

Cəfada həddini aşmış, fələk, tükən, ey qəm!
O qoz beli ilə edib şadlığı bizə matəm!

Həmişə qüssə yedik, şad olaq gərək bu zaman,
Yara vurub ürəyə fitnə, axtaraq dərman!

Cahanda qüssə ilə şadlığı bölüblər əgər,
O qəm ki çəkmişik, insafla de, bir ömrə yetər!

17

Şadlıq artıq büsbütün üz döndərib dünyadan,
Göy də öz insafını qaldırıbdır aradan.

Şadlıq eldən, insafsa ortadan getmiş təmiz,
Yaşamaqdan dünyada necə ləzzət alaq biz?

Aləmi başdan-başa gəz, bir ürək tapmazsan,
Qəm-qüssə zərbəsindən ona verilsin aman!

Yer üzünü bir ağır vəhşət tutub sərbəsər,
Bir nəfər tapa bilməz asudəlikdən əsər.

Padişahdan başlamış keşikçiyə qədər sən,
Xatirini bir kəsin qəmdən azad görməzsən.

Bəlkə heç asudəlik olmamışdır dünyada
Ya ki, bizdən gizlənib, bir zamanlar olsa da!

Varmı bahar nəsimi bir kərə duyan insan –
Xəzan yeli etməsin xatirini pərişan?

18

Gecə-gündüz edərlər dərd əlindən ah-zar –
Yaxşı, pis, qadın, kişi, gənclər, həm də qocalar.

Bütün qəmlər dünyada, düşünsən, canüzərdir,
Qəmlərin hamısından dost fərağı betərdir!

Bütün qəmlər insanın ürəyinə qəsd edər,
Əzizlərin dərdidir cana qəsd edən kədər.

Haqlıyam, canımdakı ayrılıq əzabından, –
Zalım fələk əlindən çəkdim ney kimi əfqan.

Elə böyük kədərim var ayrılıqdan yana, –
Bəlkə bircə zərrəsi sığmaz bütün cahana.

Bəlkə də ulu Tanrı mənə səbr etdi əta,
Yoxsa, bu ağır qəmə çətin ki, səbrim çata!

19

Zəmanənin qəlbində məhəbbətdən yox əsər,
Fələklərin üzündə həya yox zərrə qədər.

Dolduralı camını xalq qanıyla ruzigar, –
Qədəhində xoşməzə mey görməyir insanlar!

Dostluq ənniyi yoxdur ruzgarın yanağında,
Nə də xoşluq halqası dəhrin zülmü tağında.

Rahatlığı torpaqla gəzdim, dedi zəmanə:
– Gəzmə, o quş bu torda salmamış aşiyanə!

Gəzmə tüstü, gəzmə köz, hadisə daş vuralı,
Nə sübhün şamı qaldı, nə gecənin manqalı.

Əvvəllər bu dünyanın bişirdiyi qazandan –
Xam tamahdan başqa bir tikə qalmamış, inan!

İki yüz illik yol var zəmanədən nicata,
Məyusluğa çatar tez hər kəs bir addım ata.

Simurğ ilə insanlıq bu gün bir məna alıb,
Birindən əfsanələr, o birindən ad qalıb.

Ürəklər qana döndü, şadlıq məgər ölübdür?
Can qalmamış, Cəmşidin bağrı qana dönübdür.

Çəkdi tamah dişini Mücir köçdü dünyadan,
Təsəllimiz budur ki, yox cahandan kam alan.

20

Vəslində könlümüz sənəma, tapmasa aman,
Canan, könlümüzdə fəraqın qoyarmı can?

Ağlım çəkər həyat ətəyindən ümid əli,
Ahım yaxar vücudumu alğıma çatmadan!

Gəl içmə qanımı ki, bu qanan nəticədə –
Sən fayda görməsən də, bizə çox yetər ziyan.

Bir gün gələr ki, səbr-qərarım yetər sona,
Sinəmdəki kosu edərəm mən iki cahan.

Şad eylədin məni, necə tufanlı bir gecə –
Karvanını tapar, sevinər çöldə yol azan.

Az qaldı ki, qonağım ola, kamına çata –
Tuti quşun o ləli ləbindən şəkər uman.

Ənbərli xətdən sənə yüz namə çatsa da,
Aludə olma xəttə, xəta eyləmə, aman!

Bir busə istədimsə, dedin: Durma, can gətir!
Şəksiz bu istəyin olacaqdır: bu sən, bu can!

Lütf eyləməzsə Tanrı, Cahan Pəhləvan əgər,
Al canımı, apar ki, yox imdadıma çatan.

Onda olan hünər bu cahan xaricindədir,
Dünyaya əl tapar bu hünər sahibi olan.

İşrət quranda, məclisi zinət tapar – deyə,
İstər bahar fəslinə təbdil ola xəzan.

Şahim xəbər tutarsa qulundan bu gün əgər, –
Eylər cəhənnəmi mənə nemət dolu cahan.

Bədbəxt bir qərib itirib xanimanını,
Sayəndə istəyir tapa lütfünlə xaniman.

Dövlət quşusan çox ucadır şənü şövkətin,
Bir qarğa qoy tapa qanadın altda aşiyan.

## QƏZƏLLƏR

21

Gəl əyləş, getdi sənsiz könlüm əldən,
Bir an ram et bizə daş qəlbini sən!

Düşündüm ki, sənə qurban edim can,
Yerindən olma, yersiz söz dedim mən!

Bizə cövr eyləyirsən – et, rəvadır,
Mükafat istəyirsən, istə məndən!

Zəhər verdin, şirin bal kimi uddum,
Nə sevda, nə zərafətdi bu səndən?

Dedin can istərəm, bir can nədir ki!
Gəl əyləş, can çıxart, çıxsın bədəndən!

Başıma sayə sal, sənsiz düşübdür –
Ayağa sayə tək işlər, qəmindən.

Mücir ömründə səndən vəsl umardı,
Ömür getdi, o dönməz istəyindən!

22

Gözəlliyin bağı, arxından, ey gözəl, sulanar!
Günəşlə Ay işığı nur saçan üzündən alar.

Bahar olanda tutar xoş ətir gülüstanı,
Nəsim o ətri telindən alıb cahanə yayar.

Misirdə Yusifə məxsus olan o cah-calal,
Bu gün səninkidir, ey kuyi-möhtəşəm dərbar!

Gözün görübmü fəzada Ayı qara gecədə?
Saçın qara gecəyə: surətin Aya oxşar.

Sənin əgər mənə bir zərrə meylin olmasa da,
Həmişə, bil, sənədir meylim, ey sevimli nigar!

Mənə dedin, hələ də səbr qıl, sən ey boyu ox,
Kəmanə döndü boyum, al, ox atmağa yarayar!

23

Şəkkərin bazarını ləli-şəkərbarın qırar,
Qaniçən qəmzən fələklər qəsrü dərbarın qırar!

Qızdı, aşiqlər cəfa çəkdikcə, bazarın sənin,
Qan dolu çox şişəni, ey şux, bazarın qırar!

Hüsnünü bir kəs öyə bilməz sənin qarşında, Ay
Bəhsə girsə, güzgüsünü kahi-rüxsarın qırar.

Dərk edən hər bir ağıl, zövqü səfalı hər könül,
Kuyinə valeh olarsa, şövqi-didarın qırar!

Bir tikansız gülsən, ey dilbər ki, dövranın əli –
Qəlbimə yüz ox vurar, söyər, sənin xarın qırar.

Eşqinin dərdində bədnam olsa, qəmlənməz Mücir,
Təkcə qoy zənn etməsinlər, əhdini yarın qırar.

24

Səninlə bir gecə olmaq əzizdir yüz şirin candan.
Sənin nazın mənə qiymətlidir mülki-Xorasandan.

Mənə çox yaxşıdır can bəxş qılmaqdan ki, minnətsiz –
Alım bir busə, lütf etsən, şəkər kanı dodağından.

O qıvrım saçlarında ağlımı saldın əcəb bəndə,
Gözəldir, bəndə salmışsa, oyunda bir topu çovqan.

Sağalmazdır mənim könlümdəki eşqin ağır dərdi,
Sənin dərdin mənimçün yaxşıdır yüz qat o dərmandan.

Ucuzlaşmış qəmi-eşqin sənin əhdində, xoşdur ki, –
Ucuz olsun o şey ki, çoxları ondan yeyir, canan!

Mücir öz canını təslim edib, səndən qəm almışsa, –
Deyil peşman bu sevdadan, qəmin şirindi canımdan.

25

Kuyində əql ki, biqərardır,
Sənsiz peşəm, ey gül, ah-zardır!

Hər kirpiyi nərgizin bir oxdur,
Hər tük hörüyündə şahmardır.

Vəslin dalısınca vardır hicran,
Hər bir meyin ardı, bil, xumardır!

Vəslindən ümidi kəsmədim mən,
Dövran öz işində bərqərardır.

Bizdə hanı eşq üçün dəyanət?
Nə möhkəm ürək, nə vəqt vardır.

Keçmiş qəm ilə günüm, şadam ki, –
Eşqin bu Mücirə yadigardır.

26

Eşqini könlüm mənim bir can kimi pünhan tutar,
Bağrımı yandırma, onda can tək öz eşqin də var.

Əvvəl-əvvəl zənn qıldım eşqini yumşaq tikə,
Çün yedim, onda sümük varmış, boğazım yırtılar.

Bircə ad çəkdim qəmindən, odlanıb yandı dilim,
Sən demə, ağzında od var bu adın, yanğın saçar.

Çox gözəl bir quş göründüm şaxə üstə könlümə,
Bilmədim ancaq yuvanda qəm, kədər məskən salar.

Faydalı dərman adı qoydum, tutuldum eşqinə,
Fayda yox, verdi ziyan, qopdu canımda ağrılar.

Bir quru canı əlindən getdi bir avarənin,
Var-yoxum tək o quru candı, apardın, ey nigar!

Şux qəmzəndən elə bir halə düşdüm ki, Mücir –
Bağrına sanki kamandan qanlı bir ox sancılar.

27

Elə bir qəm varımdır ki, kəm olmaz,
Sənin könlündə bir zərrə qəm olmaz.

Cana vursan yara, məlhəm taparmı?
Yarandan başqa dərdə məlhəm olmaz.

Könül qalmış hələ aləm torunda,
Ona dərdindən özgə həmdəm olmaz.

Dodaqdan sil bu səfamı, çəkinmə,
Bununla heç kəsə toy, matəm olmaz.

Qırıldı yüz könül tək bir tükünlə,
Camalından yenə bir tük kəm olmaz.

Bizi xatırlayırsansa, cəfa qıl,
Vəfa yurdu bugünkü aləm olmaz.

Mücir heç kimsədən şad olmamışdır,
Xoş əyləş ki, səninlə şən həm olmaz!

28

Başına and ola, qəlbində yox insafdan əsər,
Şad o kəsdir ki, qəmində canı qurban eləyər.

Yarı sən olmayanın bəs kim olar həmnəfəsi?
Sormasan halını, o dərdini kimlərlə bölər?

Mən xəcalət çəkərəm, başına gövhər töksəm,
Daşı yağdır başıma, qorxma, rəva görsən əgər.

Yox vəfa səndə, təbii ki, "əlif" qəddin var,
Bilirik biz ki, "əlif" heç nəsiz asan görünər.

Nə sayırsan sözünü barmağına sən o kəsin, –
Ki, qəmində günü barmaqla sayar, ey dilbər!

Cövr qıl sən, mən edib səbr, qılar çarə fələk,
Səndəki cövr bitər, onda ki, səbrim tükənər.

Vəslinin sayəsinə şövq ilə can atdı könül,
Günəşüzlüm mənə o sayəni artıqmı görər?!

29

Dünya bəzənib, yenə bahardır,
Aləm elə bil ki şux nigardır!

Bağda nə qədər ki, cah-calal var,
Bülbül ürəyi məlala dardır.

Lalə ürəyində var qara xal,
Hicran qəmi ilə dağidardır.

Əymiş başını dizə bənövşə,
Köksündə yarın əzası vardır.

İndi ki, çəmən açıq üz ilə, –
Əllə, ətək ilə gülnisardır.

Avarə sayılmalı o kəs ki, –
Qəmlə ürəyi cadar-cadardır.

Xoşbəxt odur ki, şənlənir hey,
Həmməclisi şanlı şəhriyardır.

Şahzadə, o şah Pəhləvanının –
Əldə qələbə qılıncı vardır.

30

Yandı könül, kül oldu, yetişmiş vüsalına,
Can xəstələndi, yetməz əli həsb-halına.

Vəsfi-cəmalın həddini aşmış ki, var yeri:
Acizdir ağlımız, verə qiymət kamalına.

Ay at çapır fələkdə, fəqət varmı bəhrəsi?
Çatmaz gözəllik ilə sənin ay camalına!

Əmr eylədin ki, vəsfə könül ver, varam buna,
Verməz qəmin aman, yetə könlüm vüsalına.

Öldük xəyalın arzusu ilə, yenə könül –
İstər vüsal, qalsa da həsrət xəyalına.

Qəm xəttinə çatıbsa könül, həll əlindədir,
Nöqtə qoyar o xəttə, əli çatsa xalına.

Açmaz qanad Mücir səninlə fəzada, bil!
Simurği-əql yol tapa bilməz cəlalına!

31

Ağır ol, eşqini yol vermə hər bifər düşünə!
Bir addım atdımı, yüz yol durub xətər düşünə.

Hədəf alanda bəla oxlarına müjganın,
Sayılmaz aşiq o kəs ki, oxa süpər düşünə.

Könül ləbini umarsa, canın bahası nədir?
Rəvamıdır görə pərvanə şəmi, pər düşünə?!

Diləklə bir kəsə vəslin sənin nəsib olmaz,
Olarmı ağzı şirin, kim ki, hey şəkər düşünə?

Biçəndə başları sən, ey gözəllərin şəmi,
O baş gərək yana şəm tək, “gedir hədər” düşünə.

O qəlbi döndərərəm mən qana ki, anlamadan –
Yolunda canı yox, özgə hədiyyələr düşünə.

Mücirin arzusu tək bir nəzər olub səndən,
Yəqin ki, Zöhrə bacarmaz elə nəzər düşünə.

32

O hüsn ki, səndə var, əldən ixtiyarı alar,
Könül alındı, ürək candakı qərarı alar.

O sən, o gül tək üzündə yenilməyən işvən,
Xərac hüsnünə istərsə, novbaharı alar.

İki cahana necə mən verim sənin qəmini?
O kəs ağıllımıdır, gül verib də, xarı alar?

Gileylənib demisən, canı almaram səndən,
Sən almasan, çəkəni vardır intizarı, alar!

Biz ömr gövhərini qoyduq hüsnünə qiymət,
Ver, al o gövhəri, sənsiz də ruzigarı alar.

Qəmin şirinsə də, qorxum zəmanədəndir ki,
O paylayanda qəmi, eşq qəmküsarı alar.

Mücir bağrına firqət oxu o gün dəysin –
Ki verdiyi ürəyi tərk edib də, arı alar!

33

Lalə bir şuxluqla ki, saldı cahana şurü şər,
Pərdədən çıxdı zühura xatiri pəjmürdələr.

Zülfünü, rüxsarını gördü bizim məşuqənin –
Hər o kəs ki, sübh vaxtı laləyə saldı nəzər.

Qanını uddu keçən il yer yazıq aşiqlərin,
Lalə şəklində bu il bitmişdir o qanlı ciyər.

Lalə ki, öz ömrünə xoşhal idi, birdən əcəl –
Bağrına tökdü qara qan, eyşini qıldı kədər.

Açdığı gündə süpər hazırladı yaqutdan,
Solduğu zülmət gecə düşdü əlindən o süpər.

Bir əcəb quşdur zamanın şaxəsində lalə ki, –
Gecə tüklənsə, qanadlansa, səhər tez tük tökər.

Lalə ilə istədi könlünü şad etsin Mücir,
Verdi üz bir hadisə, oldu büsatı dərbədər.

34

Fəraqın qəm əliylə canımızda bir tikan qırdı,
Deyərdin, uçdu bir ox, zindana dəydi, haman, qırdı.

Vüsalın cövhərini gəzdi könlüm eşq kanında,
Tapılmazdır, qıranda könlümü sən, onu kan qırdı.

Könül bənd oldu zülfündə, gedib zülfünü kəsdirdin,
Mənim də könlümü zülfünlə birlikdə qıran qırdı.

Yara aldıqda səndən qəlbim, ərşə qalxdı əfğanım,
Fələk qəddimi, kövrək qəlbimi bircə yaran qırdı.

Ləbin peymanı vardı, gözlərin iymanı, bəs indi?
Bu öz iymanını atdı, o peymanı yaman qırdı.

Verib can nəqdini, bir busə səndən istəsəm, vermə,
Deyərlər, qiymətini gövhərin bir xəstə can qırdı.

35

Getsə ey dilbər, gözümdən xoş xəyalın bircə an, –
Salmaz ənbər zülfünə könlüm tamah bir də, inan!

Yoxsa qalxar ah-naləm asimana hər gecə,
Səs verər fəryadıma göylər, qopardar yüz fəğan!

Qəmlərim yüklənməsəydi çiyninə, yüngülləşib –
Yer də qalxardı fəzaya, necə qalxmış asiman!

Yar vəfasız, mən də olsaydım vəfanın düşməni,
Bil, vəfa rəsmini çox tez tərk edərdi bu cahan!

İşvənə can qorxusundan könlüm olmuşdur əsir,
Könlüm olsaydı könül, mətləq edərdi tərki-can!

Çox ağırdır, yolda düşdü qaldı könlüm laşəsi,
Bu ağır yükdən necə xoşbəxtdir azad olan!

Qəm içində qərq olub, candan xəcalətdir Mücir,
Kaş ki, ya xəstə Mücir, ya qəm çıxaydı ortadan!

36

Nə pislik eylədim, peymanı qırdın?
Ümidi-vəsli kəsdin, canı qırdın.

Cırıb işvənlə səbrin pərdəsini,
Nazınla məndəki iymanı qırdın.

Mən eşqin meydanında bir top oldum,
Çalıb zülfün olan çovqanı, qırdın!

Çətinliklə məni yaqut tək aldın,
Vurub işvə daşı, asan qırdın!

Nə pislik etmisən, məndən soruşdun,
Könül verdin özün, peymanı qırdın.

Fəğan etdim, dodaq təqdim qıldın.
Dodağımdan qopan əfqanı qırdın.

Mücirə, ey könül, nə söyləyərsən,
Desə, işvənlə bir insanı qırdın?!

37

Sən hüsndə, bu doğru sözümdür, yeganəsən!
İşvənlə, hiylən ilə cahanda fəsanəsən!

Pakizəsən, qızılgül ilə tər bənövşədən,
Qiymətli incilərlə dolu bir xəzanəsən!

Dilbərlik olsa şux, sən onda şükufəsən,
Dildarlıq olsa tuğ, ona sən şah danəsən!

Şadsan buna ki, bir kəsi sən şad qılmadın,
Yüz can fəda sənə ki, qəmə bir bəhanəsən!

Əlbir deyilsən aləm ilə girmə qanıma,
Qəsd etmə canıma, kömək olma zamanə sən!

Görmək üçün səni qapına gəldiyim o gün, –
Çıx bir kənarə mənsiz, əgər əhli-xanəsən!

Sən söylədin Mücirə ki, könlüm sənin deyil!
Ağlım, huşum ki, yox, mənə ey məhliqa, nəsən?!

38

Pərdə qıldın şəkərə ləli, nigar!
Müşkdən ay üzünün haləsi var.

Qəmzən ilə kimin açdın qanını,
Bağlanıb gülşəkərinlə o damar.

Qəmi-eşqin məni döndərdi tükə,
Susamışsan qanıma, ey qəddar!

Yuxuma gəlməsin hətta vəslin –
Gecələr saxladı qəmzən bidar.

Könlümü qırdı qəmin bir qapı tək,
Vəslinin bağına yox məndə açar.

Ah oxu atdım, əsərsiz qaldı,
Qayıdıb köksümə dəydi oxlar.

Can telindən düyünlü açdı Mücir,
Gördü ki, vəslinə yol yox, dildar!

## MÜXTƏLİF ŞEİRLƏR

39

Hər gecə təfəkkürə, xəyala dalaraq mən,
Fələyin örtüyünü yırtıb keçirəm göydən.

Göy günəşin qürsünü mənim lovğalığımdan –
Güzgü kimi göstərir qarşımda mənə hər an.

Qırılsa qənatlə əgər zamanın zəhri,
Mən olaram o zəhrin, şübhəsiz ki, pazəhri.

Mənim yolum üstündə fəza, hava bərabər,
Vaxtilə yasəməndim mən, indisə Səməndər.

Əritdi məni duz tək gözyaşı, acı duyğu,
Duzsuz dünya oduma səpmədi bir ovuc su.

Qələm tək iki dilli oldusa zaman əgər,
İkiüz kağız oldum mən, yüz könüllü dəftər.

Zamanla, kərtənkələ olub, keçinməz susuz,
Abrımı tökmərəm mən, yaşamaram duyğusuz.

Su təbimin odunu söndürüb qoysa minnət,
Susuzluqdan ölərəm, suya baxmaram əlbət.

40

Fələyin bəzəyini qırdı göyün güzgüsü,
Gecənin saçlarını yandırdı işıq üzü.

Güzgünün üzü kimi mən bilmərəm qaranlıq,
Bəzmimdə kəhkəşən tək noql eylər hökmranlıq.

Güzgü kimi üzümdə qaranlıqdan yox nişan,
Noql ilə dolu olan məclisimdir kəhkəşan.

Saqidir isa mənə, qızıl günəşdir sağər,
Zöhrə güzgüsü dəfdi, bağdır mənimçün göylər.

Qızıl kəmərli Xosrov alınca dünən kəman,
Yarım güzgü şəklində ay çıxdı asimandan.

Aynalaşan dəniz tək göründü günəş bizə,
Sanki atəş içindən çıxdı qırmızı kuzə.

Odda oturan hindli, tuti görmək istəsən,
Bax güzgüyə, saçınla üzünü seyrə dal sən.

41

Gülüm, dodağıma dodaq uzatsan,
Atəş çeşməsində kövsər olarsan.

Baxşış ölkəsində tubaya oxşar
Sənin göy budaqlı bir ağacın var.

Baş versə qəzadan bir gün hadisə,
İki düşmən ordu meydana girsə,

Ərlərin atəşli həmlələrindən –
Bir səməndər kimi yanar yasəmən.

Əcəl üz verəndə, ayrılıb düşər –
Cövhər ərəzindən, ərəzdən cövhər.

Cəsur igidlərin qılınc qalxanı –
Söyüd çətri kimi açar meydanı

Yırtar dəftər kimi səfləri ərlər,
Açar şah oxuyan Cəbrail şəhpər.

Şah qılınc vururkən, edərkən savaş –
Ulduzlar üstünə tökülər şabaş.

42

Hər şey ki, ayağına cidardır, onu pis san,
İpək sənə bəzəkdir, öz qurdunasa zindan.

Görüncə göy altında bir halqadır bu aləm –
Arqtur ulduzu çəkdi nizəsini haman dəm.

Boğazını yırtmamış arqtur nizəsilə,
Başını bu halqanın içindən çıxart çölə.

Əgər göy çeşməsilə İsa tək həvəsin var,
Otu ver eşşəklərə, özünü burdan qurtar.

Qəlbin safsa, özünə həmdəm etmə heç kəsi,
Ayinəni qaraldar həmdəmlərin nəfəsi.

43

Kəşmir sərvi səcdə edər görsə sərv boylu yarı,
Türfə sünbül bitirmişdir süsən üzü, gül üzarı.

Kim görmüşdür bi gözəlin üzündə müşk silsiləsi?
Kim görmüşdür dilbər, uca sərv başında gün çeşməsi?

Yana-yana aşiq deyər: halqa kimi əydi beli –
Qızıl halqa üstündəki qıvrım-qıvrım qara teli.

Ləlin qanlı qəlbi kimi dəli könlüm döndü qana,
Əqiq kimi dodaqları işvə satdı yenə mana.

O sənubər qamətini, ay üzünü gözüm görcək,
Mən ay kimi suya düşdüm, oda girdim sənubər tək.

Ciyərimin qanı ilə bəsləmişəm gözəl yarı,
İçsin ürək qanımı qoy şəkər kimi dodaqları.

44

Alınmamış gecənin başından ayın tacı,
Saqi, mey ver, kef çəkək, meydir qəlbin əlacı.

Örtüyünü götürsün, oynasın şən gözəllər,
Çalğıçılar oxusun məhəbbətdən qəzəllər.

Noql alsınlar yarımın şəkər dodaqlarından,
Oxunsun yeni qəzəl bir şərab içən zaman.

Tutulsun çadrasından, tutulsun tellərindən,
Aşıqlar məclisinə ensin zöhrə yerindən.

Çalsınlar min şövqlə hay-haraysalan dəfi,
Qamaşdırsın gözləri onun parlaq sədəfi.

Yüksəlsin doqquz gözlü yanqılı neyin səsi,
On barmaqla çalınsın, eşidilsin naləsi...

Göz yumaraq dünyanın yaxşısına, pisinə,
İçin, müzəffər şahın övcünün xətrəsinə.

Onun övciylə daşdan göyərir yasəmənlər,
Onun öncü qılıncla tutar sudan Səməndər.

Həmləsini yüz Dara ordusu tək sanırlar,
Yüz İskəndər səddinə bərabər vəqfləri var.

45

Səhərin küləyimi öpür yasəmənləri?
Yoxsa İsa dəmimi gəzir göy çəmənləri?

Nafə, ya müşk ətrimi bu gələn?.. Yox, heç biri!
Bu ancaq mənim odlu ahlarımın əsəri.

Torpağın qəfəsində quşlar ötüşür yenə,
Gözəl bağlar bürünmüş nəstərənin ətrinə.

Süsənin ağzındadır səbahın döşü hələ,
Ona görə ağzından süd iyi gəlir belə.

Süsənin on dili var, heç danışmayır, ancaq –
Bilir ömrü qısadır, nə üçün danışacaq?

Onun əqiq rəngində sərxoş bir qılıncı var,
Çünki o yəmənlidir, orda doğulmuş, yaşar.

Rum alan yəmənlinin qorxusundan fələklər –
Qıvrım-qıvrım burulmuş həbəş telinə bənzər.

Düşmən milçək qanadlı uçar, sərt qılıncından –
Qorunmaqçün hörümçək pərdəsi qurur hər an.

Çünki düşmən arvaddır, çəkir üzünə pərdə,
Qadınlar oturarlar daim örtülü yerdə.

Gizlədir kölgəsini günəş qorxaraq ondan,
Çünki əslən qılıncdır, rahindədir o, qalxan.

46

Qapdı sevgi daşımı oyun ilə asiman,
Çırağımı söndürdü fələk şamı, əlaman!

Altı qapılı yerdən çıxa bilmərəm, çünki –
Bağlamışdır şam kimi ayağımı Həftxan.

Yarın dodağındadır İsanın can dərmanı,
Şam kimi əriyirəm qəminin alovundan.

Səhərin şamı kimi qütb tutqun və sabit,
Dolaşır səyyarələr başına zaman-zaman.

Şam kimi dirilib mən ayaqda durram, çünki –
Bu sözləri dinləyən bir şahdır sahibqaran.

Çıxdı Balıq bürcündən alovlu nur çeşməsi,
Səfirdən süfrə saldı ay üzünə asiman.

Dadmış ömründə eşqi lalə və şam mənim tək,
Birinin bağrı yanıq, birindən çıxır duman.

Bağ ünsiyyət məclisi, gül, bülbül, mey ayaqdır,
Qızıl rəngli lalə şam, nərgiz – noğula qənddan.

47

Yar, gözlərin qanımı içsə də, deyirəm mən:
Yarəb, sən özün saxla o gözlərin nəzərdən.

Ağzın yarım dinarə oxşayır, ey gözəl yar,
Min könül alsan, yenə əskilməz yarım dinar!

Sənin nazını çəkmək ağırdır mən yazığa,
Könlüm xərvar nazından batır palçığa, zığa.

Yanıldım, könül nədir əsirgəyim canandan,
Sevgilimin yolunda keçərəm şirin candan.

Gül üzünü görüncə dilim deyir qərarsız:
O verir sevincimi, şad olmaram mən yarsız.

Qara telli gözəlim, qulam o tellərə mən,
Min yazığın naləsi gəlir hər bir telindən.

48

Bədənim eşqinlə əl çəkdi candan,
Can da ümidini kəsdi cahandan.

Dedin əsirgərəm səndən kölgəmi,
Kölgəsiz qalarmı bu torpaq bir an?!

Sən məni gözündən saldınsa, ancaq –
Şahın kərəmindən oldum kamiran.

Qızıl Arslan şahın əli, ürəyi –
Qoymadı nə mədən, nə də bir ümman.

Bir addım atınca yerin üzündə –
Qalmadı fitnədən, fəsaddan nişan.

Qüvvətlə bağladı Öküz bürcünü,
Aldı Qövs bürcünün əlindən kəman.

49

Sərv boylu, ay qabaqlı, bulud saçlı, incə dilbər,
Dodağı ləl, dişi inci, gül yanaqlı, zülfü ənbər,

Ud qoxulu saçlarını düyün-düyün görüncə mən –
Dedim düyün-düyün olar daima ud gözəllikdən.

Sevgisinin halqasından qurtarmaqçün çəkdim kədər,
Vücudum bir ipə döndü, boyum oldu əyri çənbər.

Yenə gözüm, könlüm sənin həvəsindən, gözəl sənəm, –
Sinəmdəki oddan quru, ciyərimin qanından nəm.

Çünki qədrin doqquz fələk, səkkiz cənnət qədər yüksək,
Altı cəhət, yeddi ölkə ola bilməz kərəmin tək.

50

Dodağını şəkərçin bağlayan nazəninlər,
Saçarlar səhər kimi gülüşlərindən şəkər.

Bir al qədəh uğrunda səhərin sirdaşları,
Bağlamış bu müdəvvər fələyə çox daşları,

Havanın yəcucunu dəf eləməkçün hər an,
Yaş oda sədd çəkmiş yer əhli quru sudan.

Ədalətli şah üçün qurban kəsilsin deyə,
Çərx öküzü bəslənir, veriləcək hədiyyə.

51

Nə dözürəm hicrana, nə qovuşur mənə yar,
Diləyim başa gəlsə, mənim nə kədərim var?

Bir udum şərab kimi qanımı töksə canan, –
Öpərəm qarşısında onun torpağı naçar.

Can qoxusu verməyən bir dodaq tapılmaz heç,
Cananın hicrindən can gəlib dodaqda durar,

O döyüş meydanında bir can alan əjdaha,
Atəşli qılıncıdır hünər gəncinə açar.

Düşmənin boğazına dörd pərli oxu girsə,
Uçar düşmənin ruhu, ox dəliyindən qaçar.

İki səf arasında mühüm işi görünsə,
Almaz kimi qılıncı hünərlər edər aşkar.

İgidlərin qanından, kəklik ayağı kimi,
Ölüm quşu Simurğün ağ dimdiyi qızarar.

Fələk kitabxanası danışır indi ondan,
Rüstəmin dastanını atıb bir küncə əttar.

52

MƏDH

Haqq yaratmamış, sanki səni torpaqdan, sudan,
Fəzilətdə, ağılda mükəmməl bir adamsan,

Təbin su, sözün inci, üzün nur, dilin şəkər,
Rəhmətdən, şəfəqqətdən, ismətdən yaranmısan.

Qullarının nizəsi andırır qamışlığı,
Yer, göy birləşir sənin qoşununun tozundan.

Yaramaz düşmənləri məhv etmək istəyirkən,
Qəza bir qılınc olur əlində, qədər peykan.

Görcək yağış yerinə yağdırır təbərzin, ox,
Qullarından şübhəyə düşdü yağışlı neysan.

Basıb gəldin düşməni, çıxdı bu dəm elə bil –
Dürr sudan, müşk nafədən, işıqlı ay buluddan.

53

İsanın anası olduğumçün mən –
Övladsız fələkdir qəlbimə düşmən.

Mən də zəmanəyə hərifəm indi,
Onun da kədəri qəlbimə endi.

Möhnətdən isanı möhnət qoruyar,
Dəmirdən aynanı dəmir qayırar.

Azuqə verməsə fələyin şamı, –
Çatar şam tək mənə qəlb ehtişamı,

Şerim zəmanəni bəzəyən inci,
Odur ki, könlümün artır sevinci.

Təbimin sapanı atdı nişanə,
Söz daşım yetişdi ta kəhkəşanə.

Bir sıra anlamaz azğınlar da var, –
Qohuma eyibdir, məhəlləyçün ar.

Onların səsindən qulaqlar dəngdir,
Ancaq ki, dərmansız boş bir həvəngdir.

Bilinməz sərxoşdur, ayıqdır onlar,
Nə qadındır, nə də kişiliyi var.

İkidilli qayçı olmuşlar mənə, –
Eybimi görməyə təkgözlü iynə.

Uzundur dilləri şam kimi gerçək,
Lakin dedikləri mənadan pəltək.

54

NƏSİHƏT

Yenə üz döndərib cahandan vəfa,
Bir nişan qalmayıb vəfadan əsla.

Yer odlu külxandır, göy hamam tağı,
Sənsə bir cünübsən, sevdiyin hava.

Yüyür, keç buradan, ağıllı insan –
Hamamda, külxanda tikərmi yuva?

Ölümü həyatdan xoş bil, qarğı ol,
Diriykən qənd verir, ölüykən nəva.

İlan yataqdadır, yatma, qalx, oyan,
Şir kəsib üstünü, işrətə uyma.

Əlinə almışdır fələk çırağı,
Ömrünün varını sovurur suya.

Söndür bu çırağı səhər ahıyla,
Tamahkar oğruya mal vermə əsla.

## RÜBAİLƏR

55

Dövran səni göndərdi, nə xürrəm gəldin,
Ey huri mələk, sən mənə həmdəm gəldin.
Heç fikrimə gəlməzdi səni görrəm mən,
Hardan yel əsib, dərdimə məlhəm gəldin.

56

Gördün ki, gözüm dünən necə qan tökdü,
Büllur cama o badəni əlvan tökdü.
Qanla qanı istərdi yusun, bir bax sən,
Qan üstə qanı gör necə asan tökdü.

57

Ey qoynu səmən, ey üzü tər güldən tər,
Hər kəlməsi şirin, kəlamı bal, şəkkər.
Hərçənd unutdun məni sən biryolluq,
Ömrün-günün olsun daha xoş, ey dilbər.

58

Fərman verən oldun, sənə bəxt olmuş yar,
Səndə nə kərəm, bu gün nə bir insaf var.
Bir gün ki, yatar bəxt gözün aləmdə.
Hər tutduğun işdən necə etməzsən ar?

59

Kuyində yanan könlümə tufan düşdü,
Ayrıldım üzündən, araya qan düşdü.
Bir gün belə bir gün görərəm, bilməzdim,
Dərdinlə sənin ömrümə talan düşdü.

60

Könlüm ki, daima işrət sevərdi,
Gözüm ki, üzünə səcdə edərdi,
Odlu pərvanəylə, sulu peymanə –
Eyləmiş onları, ayrılıq dərdi.

61

Saqi ki, tökərdi badə minadan,
Mütrib ki, incilər saçardı hər an,
Biri qan alandı, biri təbibdi,
Bu, nəbzi yoxlardı, o tökərdi qan.

62

Firuzə göy kimi üzük qaşım var,
Yəhərli atımdır mənim ruzigar.
Şerimin, nəsrimin sünbüllərindən
Minlərlə Xaqani başaq toplayar.

63

İsfahan əhlinin düz olmaz əhdi,
Görməzsən iş vaxtı onlarda cəhdi.
İsa dəmli Mücir, uyma bu xalqa,
Olmuş çünki Dəccal onlara Mehdi.

64

Ey gecə, neyləyim Allah üçün, mən?
Darıxdım təklikdən, kimsəsizlikdən,
Ömrüm olsan belə, açıl, ey səhər!
Qaranlıq pərdələr çəkilsin göydən.

65

Ey saçı səhəri tutan güləndam,
Gün üzün min günü eyləyib axşam.
Haram qanımızı sanırsan halal,
Öz halal vəslini edirsən haram.

66

Dedim kömək allam mən İsfahanda,
İnsaf mədəninin ləli var onda.
Nə bilim İsfahan əhli kor imiş,
Sürməsi var ikən belə cahanda.

67

Kuyində qəmə dözməyimə fərman var,
Ağlar bu gözümdə hər gecə tufan var.
Qəlbim yaşadır dərdlərini dərmansız,
Dözmək gərək, hər qədr bədəndə can var.

68

Könlüm baxaraq, gördü yarın zülfünü xəm,
Addımladı, tutdu həlqəsindən möhkəm.
Biçarə göz açdı, bir də baxdı, gördü,
Hər həlqəsi zülfün qapıdır, hasili qəm.

69

İstərsə də, ey könül, tökə qanını yar,
Çaşma yolunu, ağılla eylə rəftar.
Batində qan ağlasan da, zahirdə xoş ol,
Gül! Bil ki, bu gülməyinlə düşmən ağlar.

70

Kuyində yanar sinəmlə məskən saldım,
Bədxah elədi, hüsnünə həsrət qaldım.
Qalmaq bu günə xəyalıma gəlməz idi,
Çəkdim gecələr qəm, bu günə alçaldım.

71

Ey haqqı, mürüvvəti, səxanı unudan!
Bəxtin gətirib, bu gün sənindir fərman.
Səndən ki, sabah səadət üz döndərəcək, –
Pisliklərə yaxşılıq, de, kimdən umasan?!

72

Şad ol, ürəyim, gəlir uzaq yoldan yar,
Pişvazına çıx, qoy sənə olsun dildar.
Ey səbr, onun qəmində küsdün, getdin,
İndi geri dön ki, yar da yoldan qayıdar.

73

Bir gün yara söylədim ki, ey şəhdü şəkər!
Dişlərdim o bal ləbini, lütf etsən əgər.
Diş basdı o mərcan kimi tər ləblərinə,
Yəni ki, ləbim sənin, sənindir dişlər.

74

Şad eyləmədin könlümü vəslinlə bir an,
Hər arzumun əksinə olursan, canan!
Gözlər tutulub qəminlə, bağrım yandı,
Canım da gedir, indi nədir bəs fərman?!

75

Bu dövrdə min qəmə giriftarıq biz,
Qəm-həmdəmimiz, qəmə havadarıq biz.
Ömrün evi adlanan cahan kuyində –
Qəmlə qapıbir, kədərlə həmdivarıq biz.

76

Çün sərv azad kölgəsini saldı suya,
Gül açdı, onun əksi dəxi daldı suya.
Su oldu bahar eşqi ilə divanə,
Zəncir olaraq külək qanad çaldı suya.

77

Gül sübh çağı yelə sataşdı, soldu,
Könlündəkini səbaya açdı, soldu.
Gör ömr necə dönükdür, on gündə o gül –
Göyərdi və qönçələndi, açdı, soldu.

78

Axdı üzümə dünən gecə gözdən qan,
Tökdü qədəhimə qırmızı meh canan.
İstərdi yusun qanı gözümdən qanla,
Amma bu bəhanə ilə qatdı qana qan!

79

Asudə ol, ey könül, yəqin yar gələcək,
Bir dost kimi işlərinə səhman verəcək.
Varsa aramızda bir qədər indi qubar, –
Qəm çəkmə, gələrkən o qubarı siləcək.

80

Ey müftəcə bu könlümü çənginə salan!
Yüz növ əlindən canıma çatdı ziyan.
Salmış araya qəmin elə inciklik, –
Ancaq əcəl ilə qalxacaqdır aradan!

81

Gördü o gözəl sənəm məni halı yaman,
Rəngim saralır ürək qəmindən hər an.
Qəndi qoyaraq dodağına verdi mənə,
Gülqəndi ürək dərdinə bildi dərman.

82

Bülbül gözü qan dolu bağa gəldi səhər,
Bağrındakı dərd idi dilində əzbər.
Gül, naləsinə pərdə dalından çıxdı,
Güldü, dedi: Gül ki, etdiyin nalə yetər!

83

Könlüm ki, bütün ili camalın istər,
Çatdıqda əli sənə, vüsalın istər.
Gəlmişsə bu yol könül əgər xidmətinə,
Üzr ilə aparmağa xəyalın istər!

# MƏHSƏTİ GƏNCƏVİ

*XII əsr məşhur Azərbaycan şairəsidir. XI əsrin axırlarında Gəncədə doğulduğu ehtimal olunur. Həyatı və yaradıcılığı barədə qədim təzkirələrdə qısaca məlumat və əsərlərindən nümunələr vardır.*

*XIII – XIV əsrlərə aid cüng və təzkirələrdə iki yüzə yaxın rübaisi və bir neçə başqa lirik şeri saxlanmışdır. Rübailəri dünyəvi mahiyyəti, humanizmi, nikbinliyi ilə seçilir. Yaradıcılığında məhəbbət lirikası əsas yer tutur.*

## RÜBAİLƏR

1

Bir dilənçi mənə əl açsa əgər,
Bağışlaram ona zər, ziba, gövhər.
Gəncənin iki min xətib oğlunu –
Bir yoxsul babaya könlüm bəxş edər.

2

Sünbül laləzara olarmı mehman?
Yaraşarmı gözəl gülşənə tikan?
Üzünün ki, qəşəng bir rəngi vardı, –
Nəyinə gərəkdir bu saqqal, oğlan?

3

Kişi ol, əgər sən qadın deyilsən,
Bir an oxşamazsan başımı nədən?
Zər verər busəmə dünya şahları,
Zərsiz də bir busə almazsan məndən?

4

Hər iki dünyanın kərimi sənsən,
Qocaya, cavana kömək edənsən!
Sənin rəhmətinə əminik, Allah,
Könlümüz şad olur sənin feyzindən.

5

Məni kam almağa qoymadı zaman,
Gücü çatan qədər elədi divan.
Deyəsən, əhd etmiş, dolandıqca hey –
Məni də özüylə hərlətsin dövran.

6

Xidmətdən qovulmuş bir kəsdir ürək,
Adın-sanın yoxsa, həyatdan əl çək.
Bu dünya elə bir karvansaradır –
Ki, qara pula da dəyməzmiş, gerçək.

7

Qəlbinə eşqdən söz yazan bir kəs,
Bir ləhzə ömrünə puç deyə bilməz.
Bir həmdəm aradıq, ömrümüz boyu –
Bizə həmdəm oldu yanıq bir nəfəs.

8

Eşqin mənbərinə çıxan gündən biz –
Eşqdən başqa söz bilmədik hərgiz.
Bizim bu mənzilə ayaq qoymasın –
Eşq ilə yanmayan, buz kimi hissiz.

9

Aşiqlər evinin dərvazəsi, bil,
Olmuş çoxdan bəri bizim bu mənzil.
Məhsulumuz qəmdir, bihuşuq müdam,
Şadlıq bu xanənin qonağı deyil.

10

Özgədən heç zaman gözləmə kömək,
Quru budaq kölgə salmaz, ey ürək!
Qənaət əzizlər, tamah xar edər,
Az olan şeylərə qənaət gərək.

11

Başqa mədəndəndir eşqin gövhəri,
Seçmişlər aşiqlər bir özgə yeri.
Eşq dəni yeyən quşun yuvası –
Bir yerdir bu iki dünyadan qeyri.

12

Bir qəlp pulu bizdən almırlar, inan!
Süpürər hamını əcəl dünyadan.
Xərabatdan çıxıb dedi bir qoca:
“Şad yaşa, torpaqda çox yatacaqsan”.

13

Dad ürək əlindən, dad eşq əlindən!
Çoxları tək düşdüm bu möhnətə mən.
Ürəkdir səbəbi bu ah-zarın,
Dad ürək əlindən, dad eşq əlindən!

14

Ey ürək! Ömrünü vermisən bada,
Gülüb yetməmisən kama, murada.
Kimsə yetişmədi dadıma, heyhat!
Mən sənin əlindən gəldim fəryada.

15

Qəmindən ürəkdə qalmadı həvəs,
Cavanlıq şövqü də keçəcək əbəs.
Eşqin bir ölümdür, qalmışdır yalnız –
Yaşamaq adına bir quru nəfəs.

16

Xalqın başında gər olsan da bir tac,
Ağladar səni də bir gün ehtiyac.
Xalqın dərdinə qal, ona həmdəm ol,
Sən o gündən qorx ki, olasan möhtac.

17

Bu dünya bir qızıl kuzəyə bənzər,
Suyu gah şirindir, gah da ki, zəhər.
Çox da öyünmə ki, uzundur ömrün,
Əcəl köhlənində hazırda yəhər.

18

Havada, səhrada olan toz, torpaq –
Keyqubad, Firidun torpağıdır, bax!
Fələyin təknəsi deyil bu dünya,
O bir qan teştidir, qan tası ancaq.

19

Qoca, bir guşədə əlində badə,
İçib ağlayırdı, gəlirdi dadə:
– Tövbəni kim pozdu, yarəb, mənəmsə, –
Barı sən rəhmini pozma dünyadə!

20

Qızıl dedi: "Mənəm hər günə gərək,
Duz kimi möhtacdır mənə hər xörək.
Məni ölü kimi basdırmayın siz,
Həyat üçün mənəm ən yaxşı kömək".

21

Nəmli gözlərimdən axan gilələr –
Xəncərdən damlayan al qana bənzər.
Qəlbim kabab olmuş, tökür qanlı su,
Kababdan qanlı su süzülməz məgər?!

22

Hünərin səfası acıdır müdam,
Odur, hünər suyu içmir bir adam.
Alçaq adamların cəhalət odu
Hünəri küləyə vermişdir tamam.

23

Mən ki çöldə bitən bir otam, ey mah,
Nə suyum var mənim, nə taleyim, ah!..
Nəsihət əbəsdir, qızıl teşt içrə –
Kəsilmiş bir başın nə xeyri, eyvah!

24

Boy-buxunu, çiyni nöqsanlıdan dad,
Namərd kişilərdən yaxşıdır arvad.
Bivəfa dostlardan düşmən yaxşıdır,
Etibarsız dostu yadından çıxart.

25

Şam başından yanar, göz yaşı tökər,
Gəldiyi qapıdan o çıxıb gedər.
Başınla öyünmə, şamə diqqət et,
Başdan ayağacan yanar, əriyər.

26

Nədən səni belə yandırdılar, şam,
Yoldan çıxartdılar burda bir axşam?
Sən özün dilə gəl, neyləsin, əgər –
Yaranmışsa ancaq yanmaqçün adam?!

27

Olursa Misir, Rum, Çin sənin, ancaq –
Bil ki, bütün dünya sənin olacaq.
Kefini kök saxla, çünki son qismət
On arşın kəfəndir, üç arşın torpaq!

28

Qəminin eşqilə cahana gəldim,
Canımı eşqinə qurbana gəldim.
Bu könlüm qəminin məkanıdır, yar!
Qəmini çəkdikcə mən cana gəldim.

29

Xərabatdan çıxan bir ay ucaldı,
Fələyin damında bir çadır saldı.
Qəflətən ucaldı hatifdən bir səs:
“Bu dünya bir saman çöpünə dəyməz!”

30

Könülsüz Xərabat içrə sən gəlmə,
Dərvişlik rəmzini bilməsən, gəlmə!
Başından keçənin yoludur bu yol,
Bu yolda can qurban verməsən, gəlmə!

31

Xərabat – yeridir igid əsrlərin,
Burda yeri yoxdur bədgövhərlərin,
Hörmətlə qədəm qoy bu yola, çünki –
Bura yeri deyil hiyləgərlərin.

32

Sən ey işvəsiylə gözəl görünən,
Əyləş, acıqlanma, əl çək fitnədən.
Əyridir vədin də qaşların kimi,
Əysən də bu camı, gəl dağıtma sən!

33

Gözlərimdən qan-yaş axıtdım dünən,
Göylərə sovurdum torpaqları mən.
Kimin duasıdır, bilmirəm, ey dost,
Ki, ölmədim sənin dərya qəmindən.

34

İqbal gəlib bu gün kaşanəmizə,
Dünya deyir indi: bir qulam sizə,
Dövlət ki, ağıllı axtarar daim, –
İndiköməkçidir taleyimizə.

35

Qadını kişiyə bağlayar kəbin,
Kəbinə qol qoyur şəriət, ayin.
Mənimsə kəbinim bir rübaidir,
Varmı bu kəbinə yol verən bir din?

36

Daşda ol olsan da, ey saqi, əgər,
Bir gün əcəl suyu səni söndürər.
Bu dünya torpaqdır, mütrüb, qəzəl de,
Saqi, nəfəs yeldir, badə ver, yetər!

37

Xoşdur bütpərəstlik sən bir büt olsan,
Xoşdur məstlik versən şərab camından.
Elə yox oldum ki, eşqində sənin,
Bu yoxluq varlıqdan yaxşıdır, inan.

38

Ürəyim doludur eşqinlə, nə qəm!
Bir sözlə bu halı deyə bilmərəm.
Sıxılır ürəyim, yox taqət, saqi,
Bihuşluq daha xoş deyilmi bu dəm?

39

Qəmlə dost elədi camalın məni,
Qızıl tək saraltdı xəyalın məni.
Şərabı səninlə içərəm, ancaq
Əbədi məst edər vüsalın məni.

40

Camalın nur saçır bizə biqərar,
Hara getsəm, qəlbim sənə can atar.
Kənizin əlindən al iç badəni,
Qəlbimdə hər zaman sənin ətrin var.

41

Əlimdə qədəhlə sənin küçəndən –
Hər gecə, sevgilim, sərxoş keçdim mən.
Eşqi şərab kimi tökdüm qədəhə,
Huşa getdim, sındı düşüb əlimdən.

42

Gözəl, bax, bir mənəm, bir sən, nə xoş hal!
Nuş edək şərabı, coşsun qoy əhval!
Ey kaş, zülfün təki uzansın gecə,
Sübhün açarını sən quyuya sal!

43

Dur cəngi dindirmək, bir ülfət qataq,
Şərab içək, utancaqlığı ataq.
Hiylə şişəsini çalıb daşlara,
Canamazı bir cam şəraba sataq.

44

Dedim: məsləhət ver bizə, ey ürək!
Şirin meydan, yoxsa acıdan içək?
Dedi: acından iç, axı Şirinə –
Sən vurğun deyilsən bizim Fərhad tək.

45

Doyunca mey içən dolaşar çılpaq,
Keçinər dünyada bir dəlisayaq.
Əfi düşmənlərim kor olsun deyə,
Bu yaqut şərabı içirəm ancaq.

46

Laləni süsləmək vaxtıdır tamam,
Gül üstə, ey xacə, gəl qaldıraq cam,
Dəftəri sataraq, şərab nuş edək,
Gəlib mədrəsədə quraq intizam.

47

Meyxanə önündə xumar gözlərin –
Dün müjdə verirdi aşiqə min-min.
Zülfünə fərman ver, ağır zəncirdən –
Qurtarsın canını bu divanənin!

48

Qatırı satmaqçün tövləyə girdin,
Qızıl tapmaq üçün onu itirdin.
Sat, yenə o pulu sərf et məclisə,
İçək, ta deməyək, zərər gətirdin.

49

Əlimdə qızıl pul, qızıl tək üzüm,
Xərabata girdim cürətlə özüm.
Xərabət şagirdi qovladı məni,
Söyləyin, bu hala mən necə dözüm?

50

Sənə can verirəm gül dodağımdan,
Qara zülflərimdən, şux yanağımdan.
Məst, ayıq, ya xumar rəqs eləyirəm,
Cəng çalıram sənin qarşında hər an.

51

Mən tikansız, bir ətirli güləm,
Qəmlərini çəkən şeyda bülbüləm.
Şahların qolunda oturan qırğı –
Düşmüşdür toruna, eyləmə sitəm!

52

Ayla Zöhrə kimi üzünlə gözün,
Yusiflə quyu tək xalınla üzün;
Sən buğdayı, mənsə samantək sarı,
Samansız buğda heç gördünmü bir gün?

53

Zülfün camalına bir yaraşıqdır,
Xərabat əhlinə nurdur, işıqdır.
Ey Şərq günəşinin nuru, xoş gəldin!
Gözəllər şahına qapı açıqdır.

54

Bir busə ver mənə qənd ləblərindən,
Bir yox, iki, üç, dörd, beşini ver sən.
Altı, yeddi, səkkiz doqquzunu ver,
Sonra on busəni lütf eylə birdən.

55

O mim ləbindədir bu dodaqlarım,
O gümüş qoynundur güllü baharım...
İki ayrı canda bir ürəyik biz,
Bilirəm qədrini, nadir mirvarım!

56

Məni dodağınla satın al, canan!
Məkkə qapısına apar, et qurban.
Günahım var isə, qoy zindan olsun –
Mən tək günahkara çahi-zənəxdan.

57

Məni sevirmişsən doğrudan, ey yar
Qoymursan gözündən bircə an, ey yar!
Zarafat eyləyib bir yalan dedim,
Nə yaxşı onu da duymusan, ey yar!

58

Başımı yolunda qurban da versəm,
Eşqindən bu könül ayrılmaz bir dəm,
Bir gün görəcəksən, ki sənin, sənin,
Sənin ayağına düşüb ölmüşəm.

59

Gözəl, zənəxdanın zindandır mənə,
Camalın Kəbətək məkandır mənə,
O kafir zülfünün qıvrımları, yar,
Çoxdandır mayeyi-imandır mənə...

60

Yarın damarını çərtəndə, aman,
Diqqət et, incitmə, sən ey qanalan!
Qoluna vurduğun hər bir neştərin –
Ucu ürəyimə sancılır, inan!

61

Qəlbim yaralıdır, rəhm elə, ey yar,
Qalmadı könlümdə bir səbrü qərar.
Bir anlıq vəsl üçün təsəlli ver ki, –
Nə başqa bir arzum, nə ümidim var.

62

Acıqlanma, dedi, ey yar, bu gecə,
Dinlə nəsihəti, dildar, bu gecə!
Açaram qoynumu sənə səbr elə,
Gəl qisas axtarma, zinhar, bu gecə!

63

Yar oldu könlümə bu gecə dilbər,
Yalqız gecələrdən halım birtəhər;
Əcəlim olsan da, getmə, ey gecə!
Səadət olsan da gəlmə, ey səhər!

64

Ömrün bu dünyada əbədi olsun,
Könlün səadətlə, şadlıqla dolsun.
Sənin istəyinə uymayan başlar –
Sürahı başı tək bədənsiz qalsın.

65

Saçların ətrafa xoş ətir saçar,
Səhər yeli onu vurub dağıdar.
Qolunu boynumda görsə bir zahid, –
Heç ola bilərmi, o bir də dindar?!

66

De, hardan gəlirsən, ey rahəti-can,
Gözlərimin nuru, sevgili canan?
Səninlə mey içim, dedim, bu səhər,
Ey səhər munisim, gəl, gəl, hardasan?!

67

Bu vüsal gecəsi, amandır, yatma!
Murada yetməyə zamandır, yatma!
Xumar gözlərini qapama, ey yar!
Bu, ələ düşməyən bir andır, yatma!

68

Hələ mey var ikən, ey nigar, yatma,
Busəsiz qalarsa, dodaqlar, yatma!
Gecə qaranlıqdır, badələr aydın –
Xəlvət bir guşədir, mey də var, yatma.

69

O gül dodaqların səpəndə şəkər,
Can quşu qəfəsdə çırpınar, titrər.
Gəl günah işləyək bal dodağında,
Kafərsən, bu işi rədd etsən əgər.

70

Səndə rahatlanır bütün yaranan,
Yox, məşuq demirəm, sən bir məbudsan!
Qəzəldə xəttü xal adını çəksəm,
Bəhanədir, qəsdim tək sənsən, inan!

71

Dedim: “Bir gəl”, dedi: “Hara deyirsən?”
Dedim: “Qucağıma”, söylədi: “Əhsən”.
Dedim: “Gəl mey içək”. Dedi: “İkimiz”,
Keçmək olarmı heç belə dilbərdən?..

72

Gəl sıx dodağını dodağıma, yar,
Ölmüşəm, gəl məni həyata qaytar.
Neyləsən, aman ki, xəbər tutmaram
Olmuşam qoynunda xumardan xumar.

73

O günəşüzlüyə olummu heyran,
Yoxsa kam alımmı qara saçlardan?
Lətifdir, gözəldir bütün hər yeri,
Harası, nəyi var – vurulmayasan?!

74

Ey dost, o qəmzəndir belə can alan,
Saçların tər-təzə, qaşların kaman.
O çəmən sərvinə səcdə qılanlar
Dad edər o uca boynundan, aman!

75

Gül dedi: “Gözümü açmamış hələ,
Səadət bağından dərməmiş gilə,
Gülab çəkmək üçün dərdilər məni,
Görüm o əllər də kəsilsin belə!”

76

Sənə həsəd edir yasəmən, gözəl!
Ey nazı min fitnə eyləyən gözəl!
Yolunun üstündə bir çeşmə gördüm –
Ki, suyu axmaqda gözümdən, gözəl!

77

Şahlar sevincinə xəbərsən, ey gül!
Bülbülə ilhamsan, hünərsən, ey gül!
Bu lətif hüsnünlə qorxuram ki, sən –
Sərxoş ayaqlara düşərsən, ey gül!

78

Toxunma könlünə biçarə gülün,
İncitmə qəlbini avarə gülün.
Səbanın eşqiylə olmuşdur ey dost, –
O qanlı köynəyi sədparə gülün.

79

Gül yola baxırdı, rəngi solmuşdu,
Bülbülün eşqiylə gözü dolmuşdu.
Bayaq bəzəndiyi yaşıl paltarı –
İndi parçalayıb dəli olmuşdu.

80

Bağ alışıb yandı qırmızı güldən,
Bir gül köynəyidir ömrümüz həmən;
Əcəlin küləyi yırtmamış onu,
Gül ilə badəni buraxma əldən.

81

Gül dedi: “Bir sərv qamətli əgər –
Olsa, gözəl bağı bir cənnət eylər”
Meh tənə vurdu ki: “Qonşun tikandır –
Qonşudur çirkinlə daim gözəllər”.

82

Ey rəngli şəftəli gülütək olan,
Dodağının ətri dərdlərə dərman!
Çənənin altında bir bağça gördüm,
Şəftəli istərəm mən o bağçadan.

83

Mən, ey Xətiboğlu, sənə qurbanam,
İnan qəbrə qədər sənə hayanam.
Ölməyə hazırdır yolunda çoxu,
Mənsə istəyirəm od tutub yanam.

84

Yetməzmi, qəribə verdin işgəncə,
Cəfanın hüdudu olmazmı, səncə?!
Demişdin: Gəncədə kamə yetərsən,
İndi bu mən, bu sən, bax, bu da Gəncə!..

85

Gümüş bəxş edərəm hatəmtək hər an,
Hədiyyə verərəm Çini də, canan!
Sərxoşkən iki min Xətiboğlunu –
Verərəm bir şirin nəğməyə qurban.

86

Heç doymazsan, oğlan, dodağımdan sən,
Sonra bu payı da məndən görməzsən.
Mən sənin xəstənəm, ey Xətiboğlu,
Nədən bu dərdimə dərman verməzsən?!

87

Ey gözəl, əlindən tutduğum zaman,
Səadət mülkündür elə bil cahan.
Gəl, ey Xətiboğlu, bu vüsala sən
Bir şeir söylə ki, rahət olsun can.

88

Sənə çox yaraşır bu xoş lətafət,
Gəl əyləş, ey hurisifət!
Gəncə Xətibinin xudpəsənd oğlu,
Gəl, bu zahidlikdən barı tövbə et!

89

Şəhər tamaşana çıxıbdır, oğlan,
Zülmündən qorxaraq baxır uzaqdan.
Hər paltarı bir il geyib yırtanlar, –
Eqşindən bir gündə dağıdır, inan!

90

Qalx, ey ikiüzlü, işvəkar oğlan,
Bütün əməlləri fitnəkar oğlan!
Verdiyin vədini üzüm suyu tək –
Qədəhdən tökmə sən, eylə ar, oğlan!

91

Qurudu dodağım, qurudu gözüm,
O zalım oxuna mən necə dözüm?!
Eşqinin odunda su tək əridim,
Sonra öz suyumda qərq oldum özüm.

92

Vüsalınla dolu gecələr getdi,
Kirpiyimdən düşən incilər getdi.
Ürək rahatlığım, munisim, hər şey, –
Sən getdin, səninlə bərabər getdi.

93

Necə deyim eşqin nə cəfa verdi,
Hansı mənziləcən vəfa göstərdi?!
Gecə zülfün kimi uzun olsaydı,
Deyərdim hicrində çəkdiyim dərdi.

94

Ey dost, qəmlə keçir sənsiz hər gecəm,
Yandırır yuxusuz gözlərimi nəm.
Zülfüntək qarışar yuxularım da,
Nərgizlərin kimi yuxuya getsəm.

95

Bilirdim, vəfadan xeyli uzaqsan,
Bilirdim, əhdini sındıracaqsan.
Axırda etdiyin düşmənçiliyi, –
Əvvəldən mən yaxşı bilirdim, inan.

96

Neyləyim, eşqinlə xərabəm, məstəm,
Ciyərim kababdır, özüm şikəstəm.
Camalın həsrəti yandırır, lakin –
Sənə yol tapmıram, ey boyu bəstəm!

97

Camalına həsrət yaşamaq olmaz,
Eşqinlə heç rahət yaşamaq olmaz.
Sən məni anmayıb, sakit yaşarsan,
Sənsiz mənə, əlbət, yaşamaq olmaz!

98

Sən yada düşəndə ürəyim yanır,
Qanlı göz yaşıyla üzüm islanır.
Ətrin məst etdikcə hər yandan məni –
Səbrimin köynəyi hey parçalanır.

99

Olum, sabah yeli, mən sənə qurban,
Mələk balasına xəbər ver, aman!
Söylə ki, intizar içində, yazıq –
Məhsəti yol üstə gördüm verir can.

100

Səndən ayrılmama tədbir tökdülər,
Hicrində belimi iki bükdülər.
Hədər olmazmı bu çalışdıqları, –
Sabah biz səninlə qovuşsaq əgər?

101

İnanma ki, sənsiz olar qərarım,
Kəsir taqətimi bu intizarım.
Əlacım qalmamış səbirdən qeyri,
Gəl, güldür aşiqi, gülüzlü yarım!

102

Könlüm ayrı düşdü o nurlu aydan,
Bəzənmişdir vüsal ümidiylə can,
Onsuz yaralıdır ürəyim mənim,
Görünür, bu hökmü vermiş yaradan.

103

Hicrində gündüzüm gecə oldu, yar!
Zamanın əlindən könlüm qan ağlar.
Göndər xəyalını bizə bir gecə,
Görsün necə üzür məni intizar.

104

Necə gəzdim səni, andım, soruşma,
Hicrini qəmxanə sandım, soruşma!
Nə qədər vəslinə yetən əlimlə –
Öz başıma vurdum, yandım, soruşma!

105

Ömrüm fərağında qəmdir, kədərdir,
Şadlıq ürəyimdə zərrə qədərdir.
Hicrində günləri sayıram, gözəl,
Sənsiz keçən ömrüm puçdur, hədərdir.

106

Bu gecə küsüşdük, yar, səninlə biz,
Acıqlanıb getdin, qaldım kimsəsiz.
Sənsiz gözlərimə yuxu da getmir,
Qiyamətdir, sanki, bu bəd gecəmiz!

107

Gecələr ürəyim od tutub yanar,
Ahü fəğanımdan cahan odlanar.
Könlümdən xəbərin yoxdur, qorxursan, –
Dilinə gətirsən, yanar dilin, yar?!

108

Ürək xeyir görməz hicrində hərgiz,
Qiyaməti görsün gözlərim sənsiz.
Sənə böhtan deyən mənim adımdan, –
Görüm bu dünyada qoymasın bir iz!

109

Yol üstə düşüb o qalmışdı xumar,
Qaldırdım əlindən, oldum havadar.
Yenə də xəbərim yoxdur, bilmirəm,
O harda qalmışdır, hardadır o yar?

110

Dözülməz bir acı zəhərdir fəraq,
O şövqü, həvəsi yandırır ancaq.
Ölüm can qurtarır – böyük cəfadır –
Dünyada əzizdən, yardan ayrılmaq.

111

O günəş üzünə aid olsun, nigar,
And olsun ətirli saçlarına, yar!
Pərişan qəlbimin çəmənzarını –
Hər gecə gözümün yaşı sulayar.

112

Qəlbim aşiqlərin sərdəftəridir,
Verilən əzaba çox müştəridir.
Sərt bir daş kimidir ürəyin sənin,
Dözdür o bərkliyə çoxdan bəridir.

113

İstədim əcəmdən namə göndərəm,
Qəlbim qan ağladı, boğdu məni qəm.
Qəlbimin qanıyla yazdım məktubu,
Həm məktub ağladı, həm mən, həm qələm.

114

Gözəl, bu naməni alanda ələ,
Gör ki, yazılmışdır o, göz qanilə.
Əgər belə deyil, alma, at getsin,
Əgər belədirsə, oxu, lütf eylə!

115

Ey gözəl, bu dərdli məktubum ki var,
Oxu onu gündə yüz kərə təkrar.
Yoldan götürdüyün yorğun qəlbimi,
Lütf elə, yenə də yerinə qaytar.

116

İsladır məktubu gözümün nəmi,
Qan rəngə boyayır hər bir rəqəmi.
Qələm də mənimtək dərdini çəkir,
Başıyla ağlayır yazdıqca qəmi.

117

Bazara getmişəm bir cümə günü,
Gördüm, kəklik alıb sarın üstünü.
Ona tez-tez deyir: "Cəfa verənin –
Bir gün belə qalxar göylərə ünü".

118

Məni yerə yıxıb o qəssab, kəsdi,
Dedi: "Güman etmə, bu son nəfəsdi".
Düşüb ayağıma üzr istədi o,
Demə, ayağımdan soymaqmış qəsdi.

119

Sən qəssabsan, mənsə qurbanınam, bax,
Dözərəm, çatsa da sümüyə bıçaq.
Adətdir, satırsan kəsdiyini sən,
Məni öldürsən də, gəl, satma ancaq!

120

Çörəkçi yanında şagird olmuşam,
Müəzzindən qabaq yandıraram şam.
Oddan, sudan, undan qızıl çıxarıb, –
Xərabatda qızıl ələrəm axşam.

121

Mənə töhfəsini çörəkçi dilbər –
Cəhalətlə deyil, naz ilə verər.
Qəmiylə xəmirə döndərdi məni,
Qorxuram ki, oda verə bu səhər...

122

Yun əyirən oğlan mənim canımdır,
Onun zənəxdanı bir zindanımdır.
Onun dodağından busə ver, Allah,
Çünki o dodaqlar can dərmanımdır!

123

Papaqçı sevgilim şövq ilə bayaq,
Tikirdi əlində atlasdan papaq.
Hər papağa yüz-yüz afərin dedim,
Dördünə biri də bəs idi, ancaq...

124

Bənzər, dərzi oğlu, üzün qəmərə,
Sənə yüz Məhsəti dönər çakərə.
Əlindəki saptək yolum düşə kaş,
Şəkər dodağına gündə yüz kərə!

125

Ləl mədənidir, ey sap, məskənin,
Küləyin atıyla yarışır tənin.
İynəsində yarın nə azdır ömrün,
İçdiyin ki, həyat suyudur sənin.

126

Torpaq ələyənin mən aşiqiyəm,
Dilim gəlmir, açıb sirrimi deyəm.
O, torpaq əliylə qızıl axtarır,
Mən əlimdə qızıl onu gəzirəm.

127

O sərraf oğlunun aşiqiyəm mən,
Eyn, şin və qafa vurğunam qəlbən.
Mən ki, nə kaf oldum, nə sin, nə də nün
Nə istər o süzgün baxışlı məndən?

128

Hamamçı hamamı qızdırmaq üçün
Ummasın, deyirəm nə su, nə odun.
Çatar, su istəsə göz yaşım bu gün,
Çatar ocağına canımın odu.

129

Şahim, qabaqdadır, ağ günün hələ
Sən də ağ günləri bəxş et bu elə.
Sənin hər saatın həftəyə dönsün,
Hər ayın yüz günə, fəslin min ilə.

130

Ey şahım, şahlardan üstün bilərək –
Bəxt atını sənə bəxş etdi fələk.
Qızıl nallı atın batmasın deyə,
Yerlərə gümüşdən saldı bir örpək.

131

Səni mədh etdiyim, ey şahım, yetər,
Bir qadın duası bəsdir bu qədər.
Mən öküz deyiləm, buynuz nə lazım?
Olsam da, bəs deyil hər ikisi məgər?

132

Xoşbəxtdir üzünə baş qoysa hər kəs,
Üzün şərh edəni şah edə bilməz.
Mən aləmə baxım, yoxsa üzünə?
Heyranın olmayım, de neyləyim bəs?

133

Düşmən qoşununu filin dağıdar,
Vəzirin min qeysər, min xaqan yıxar.
Ən zalım şahları atdan salırsa,
Sənə qurban olum, ulu tacidar!

134

Zülmdür, riyadır işlərin tamam,
Bizə cövrü cəfa verərsən müdam.
Səni mat eyləsəm, incimə, oğlan.
Eşqin şahmatını mən oynayıram.

135

Heç pozan olmadı qəza-qədəri,
Doğmadı ümidi hicran xəncəri,
Eşqin badəsini içdim, can verdim,
Heyhat, tapılmadı eşqin gövhəri!

136

Deyirlər, püstənin ağzı dardı, dar;
Dil açsan, xar olur püstə-badam, xar.
Ağzına oxşamaq istəsə püstə, –
Demək, ədəbsizdir, yar bağrın çıxar.

137

Mənə zalim darğa rast gəldi dünən,
Günahsız qadını döyürdü bərkdən
Əlində çubuğu batmışdı qana,
Tamaşa edirdi hər yoldan ötən.

138

Tünd məcazın məni qul edib sənə,
Üzünə, zülfünə həsrətəm yenə.
Nizə oynatdımsa türklər kimi, bax,
Bir hindli qulunam, geri dönsənə!

139

Bir gün Miyanəni elədik vətən,
Ağcaqanad yedi bizi sübhətən.
Dedik: "Kim dəf edər bizdən bu dərdi?"
Qalxıb səhər yeli: – Mən söylədi – mən!

140

Düşmənlərimə həmişə sən dəm tutdun,
Gəldin mənə naz eylədin, üz turşutdun.
Göy pərdəsi ardında oyunlar vardır,
Nazınla məni yetər, yetər qorxutdun.

141

Ərlər yığan ağ boynuna bir xal qonmuş,
Boynunda o bir tilsim imiş, əfsunmuş.
Zənn etmə nişandır o gül əndamında,
Boynunda qalan ürək qanımdır, donmuş.

142

Bir busə üçün, – dedim, – ləbim mehmandır,
Bir busəm üçün, – dedi, – baha bir candır.
Ağlım gələrək vurdu mənim böyrümdən,
Yəni dedi: – Al, bu müftə mal hardandır?!

143

Zülfümlə gərək tutum səni zəncirdə,
Axtarmayım axşamkı kimi hər yerdə,
Məst olmadan əvvəl, söz açım dərdimdən,
Məst oldu deyib gülmə mənə sən bir də.

144

Axşam məni tutdu yenə sərxoş dildar,
Göz vurdu: bacarsan, yenə bir qaç, qurtar.
Dindim: "Gecədir, tutma əlimdən, gen dur,
Birdən bizi bu halda görərlər, zinhar".

145

Ta açdı sənin naməni yorğun bəndən,
Öpdü nə qədər xəttini məftun bəndən.
Vədinlə sənin könlü, gözü şad oldu,
Göz dikdi gələn yollara vurğun bəndən.

146

Bir cismimə bax: içində qəlbim viran.
Bir canıma bax: düşübdür oddan tufan.
Bir bax gözümə: bir gül üzün eşqindən –
Yaşlar süzülür hər zaman ümman-ümman.

147

Bir cüt gözün ilə nə qədər qan etdin,
Zülfünlə nə çox qəlbi, de, viran etdin.
Allah özü qoy qəlbinə insaf versin,
Bəlkə yazıq aşiqlərə dərman etdin.

148

Hicrinlə yetər, səbrimi, ey gül, qırma.
Zülfünlə, yetər, əhdini gəl sındırma.
Dəymirsə də namə yazasan bircə cavab, –
Barı oxu, odlarda məni yandırma.

149

Zülfün necə eylər üzünə naz gör bir,
Qorxum var olum paxıllığımdan kafir.
Mən bəndəsi ollam o yelin, ağ üzdən –
Qaldırmağa görsün saçını bir tədbir.

150

Axşam yenə tutdum o yarı mən birdən,
Yüz-yüz öpüş aldım o şəkər ləblərdən.
Yar istədi söysün məni, hər busəmlə –
Ağzındaca qırdım söyüşü dərhal mən.

151

İncitmə dedim – yarımı, ey qızdırma.
Allahı gör, insaf elə, get tez, durma.
Qızdırma dedi: "Əsmə ona məndən çox,
Səndən çox ona mən yanıram, üz vurma".

152

Ta düşdü bu cür ortaya hicran, könlüm,
Qorxum var, ola can evi viran, könlüm.
Gen düşməmisən sən ki, yanından yarın, –
Üzr istə mənim dilimcə ondan, könlüm.

153

Etdim dəvə üstündə yaman ah-əfqan.
Səpdim dəvənin yollarına dürr, mərcan.
Karvan su içib boşaldılan hər quyunu –
Doldurdum o dəm mən gözümün yaşından.

154

Qəmdən nə qədər silsin ürək üzdən qan,
Bir vəslinə etsin nə qədər can qurban.
Rəhm eylə ki, can yağmır axı göylərdən,
Əfv eylə, ürək göyərməyir torpaqdan.

155

Sözlə məni qəmdən o gün azad etdin,
Vədinlə dünən qəlbimi çox şad etdin.
Çıxmışsa o gün söylədiyin fikrindən, –
Bəlkə dediyin vədini bir yad etdin?!

156

Səndən nə doyar, nə dönnəm asanlıqla,
Öldürsən əgər nə dinnəm asanlıqla,
Nə özgəni yad eyləyərəm xoşluqla,
Bir qeyri nə də bəyənəm asanlıqla.

157

Çəkdim necə qəm, gör ki, sənin hicrindən,
Bir dost olub ağladı mənə hər düşmən.
Etdim o qədər nalə sənin eşqinlə,
Yandı halıma bütün gecə şam, qəlbən.

158

Bir söylə, nə olmuş o əhd, peymanlar,
Əhd etməyə cəhd eylədiyin dövranlar.
Mən bir günah etməmiş nədən bal sözlər –
Dönmüş, zəhər olmuşdur, adam peşmanlar.

159

Dərdin o buluddur, gətirər qəm, həsrət,
Dərdin o budaqdır, bitirər yüz möhnət.
Neylim bu zülümkar, bu inadkar bəxti –
Dərdi mənə zülm ilə edibdir qismət.

160

Arxında suyun axmasa da bəndən ilə, –
İnsanlığı tərk eyləmərəm mən səninlə.
Sordun ki, nə etmişəm sənə, aç söylə,
Artıq nə deyim, neylədədin sən mənilə?

161

Baxma yerə, torpaq, su görər, ey dilbər,
Baxma göyə, gün salar nəzər, ey dilbər.
Görsə, ölərəm, inan ki, mən qeyrətdən –
Bir kəs səni röyada əgər, ey dilbər.

162

Yaşlar axıdar qəmli üzümdən dərdin,
Zülm etmədə heç qalmaz özündən dərdin,
Yansam da mən odlarda sənin dərdindən, –
Qəmdən yanaram, getsə gözümdən dərdin.

163

Bilmir niyə könlüm necə dildar oldum,
Könlüm nə çəkir, gör necə ağlar oldum.
Qəh! Qəh! Nə yatırsan gecələr asudə,
Bəh! Bəh! Gecəmi gör, necə bidar oldum.

164

Qan tökməsə gözlər, yenə gözlərdim mən,
Qəlbimdə sənin sirrini gizlərdim mən.
Olmazsa bu solğun bənizim, fəryadım, –
Hər sirrini can-başla əzizlərdim mən.

165

Olsaydı əgər məndə, deyək, min-min can, –
Qarşında o min canı verərdim qurban.
– Qəlbində bu hicrana – dedin, – tab varmı?
– Qəlb olsa, gülüm, qəlbimə neylər hicran?

166

Həsrət yenə bağrımda mənim qövr eylər,
Dövrəmdə gəzər qəmin, mənə cövr eylər.
Can qurban edim eşqinə, söylər könlüm,
Beynimdə də ancaq bu xəyal dövr eylər.

167

Şəhla gözün, ey gözəl, baxsa məstanə,
Sərxoş da gələr, mey də gələr əfğanə.
Rəqs eyləsə saçların sənin bir ləhzə –
Yüz fitnə qopar, könül gələr tüğyanə.

168

Ömrüm, – dedim, – oldu daha puç, rəhm eylə,
Dünya, – dedi, – korlandı həsəddən böylə.
Bir busə verərsənmi, – dedim, – can versəm?
Busəm, – dedi, alçaldı haçandan, söylə?!

# MƏHƏMMƏD FƏLƏKİ ŞİRVANİ

*XII əsr Azərbaycan poeziyasının görkəmli nümayəndələrindən biridir. Təqribən 1120–1126-cı illər arasında Şamaxıda anadan olmuşdur. Şirvanşah II Mənuçehrin sarayında yaşayıb-yaratmışdır. Ədəbi irsindən bizə bir divan gəlib çatmışdır. 1929-cu ildə Londonda şərqşünas Hadi Həsən tərəfindən tərtib və nəşr olunan bu "Divan" 1966-cı ildə Tehranda Tahiri Şəhabi tərəfindən təkmilləşdirilib yenidən çap edilmişdir. "Divan"a şairin qəsidə, qəzəl, rübai və qitələri daxildir. Astronomiya, riyaziyyat, fiqh, ilahiyyat kimi elm sahələrinə bələd olmuşdur.*

*Təqribən 1155-ci ildən sonra vəfat etmişdir.*

1

ŞİRVANŞAH MƏNUÇÖHRÜN MƏDHİ

Göylər şərəflənir yüksəkliyindən,
Aləm nöqtəsinin mühiti sənsən.

Mənanın, səxanın dünyasısan, bax,
Adəm övladına sən oldun çıraq.

Xədivsən beşinci ölkəyə, inan,
Dördüncü Xosrovsan, misli olmayan.

İkinci Cəmşidsən, şahlar şahısan, –
Göylərin böyüyü, ey uca xaqan.

Zühəl məqamlısan, fələk izzətli,
Qədər muradlısan, qəza qüdrətli.

Şimal feyzlisən, sabah həvəsli,
İsa nəsiblisən, mələk nəfəsli.

İgid Rüstəm kimi ovlarsan düşman,
Qoçaq Ariş kimi dünya açansan.

Zal kimi eylərsən əqlə sitayiş,
Hünərdir Neyrəm tək tutduğun hər iş.

Bir şah ki, dünyanın atını bağlar,
Göyün kəhlanına vurmuşdur dağlar.

Rəyini bilməyə hazırdır fələk,
Dünya da əmrində boyun əyəcək.

Rütbəsə hərfinə, ulduzlar nöqtə
O qaşdır, fələklər üzük əlbəttə.

Zəfər bayrağilə qurdu ədalət,
Qələmilə verdi hər əqlə zinət.

Səadət nişanı olan ulduzlar –
Rəyinin bayrağı altında parlar.

Hər yanda ordusu hazır durmuşdur,
Zəfər qoşunları çadır qurmuşdur.

Alqış ki, dövründə canlar yüksəldi,
Bədənlər ədlinlə sənin dincəldi.

Fəzilət nəqşinə bəzəkdir xəttin,
Gözəllik hərfində qələm yüksəltdin.

Dövlət vara çatdı həmiyyətinlə,
Bədbəxtliklər bitdi əzimətinlə.

Qapın cənnət kimi görünür bizə,
Səxavətli əlin dönmüş dənizə.

Qəlbin ədalətdən bənzər çırağa,
Bir ruhdur bədənin başdan-ayağa.

Qəlbinin nurilə hər bir yol azan –
Şərqdən-qərbə qədər yol tapar, inan.

Bütün canlılara ruzi verənsən,
Həmi yedirdənsən, həmi içirdən.

Bəxşiş kitabının yanında Hatəm –
Bir xətcə yer tutmaz, şahidlər aləm.

Min hünər göstərsə Rüstəm pəhləvan, –
Qeyzinin bəhrindən bir qətrədir san.

O qədər səndə var ayıqlıq, diqqət –
Ki, şahin kəkliyə verməz əziyyət.

Hümayətin olmuş elə bir dayaq –
Ki, şir ata bilməz ceyrana dırnaq.

Cəhənnəmə düşsə camından qətrə,
Tapar cənnət kimi Tuba və Sidrə.

Sənin dövlətinin camından əgər –
Cəmşid içsə idi bir damla qədər, –

Zaman Bəyurəsbə verməzdi, inan, –
Cəmşidin yurdunu bəlkə heç zaman.

Elə zamanda ki, fəlakət qopar,
El rahət olmayıb əziyyət tapar.

Hər kəs öz canını, arını güdər,
Qohumlar dərdini unudar gedər.

Meydanlarda axan igid qanından –
Dünyanın paltarı olar al-əlvan.

Atlar dırnağından qalxan o tozlar –
Ulduzlar başına əmmamə qoyar.

Düşən cəsədləri axtaran qəza –
Bir iz tapa bilməz yol aza-aza.

Qədər can almaqda olar amansız,
Bir kəsin halını sormaz o qansız.

Sən nizə və qalxan axtaran zaman –
Səninçün nə ərəb, nə türk, nə filan?

Əlində sən qılınc oynatdığın dəm –
Sənə fərq eyləməz nə kürd, nə deyləm.

Eşitmişəm sənə paxıllar demiş:
Bu qul qulluğunda kahıllıq etmiş.

And olsun misilsiz böyük Allaha,
Peyğəmbərlər şahı Rəsulillaha,

Əqsa məscidinə olan hörmətə,
Kəbəyə verilən şana, şövkətə,

Peyğəmbər qəbrinə – gün tək parlaqdır, –
Heydər məzarına, – ki pak torpaqdır, –

Kəbə evindəki o qara daşa,
Zəmzən çeşməsində saf çağlayışa,

Allahı bir bilən ürəfalara,
Həqiqi zahidə, ənbiyalara,

Əsir düşən əhli-beytin canına,
Aşurada axan şəhid qanına,

And olsun soluna – müşkül açandır, –
Səxa mədəni tək gövhər saçandır,

Uğurlu sağına and içirəm mən,
– Əta zamanında dərya kimisən –

Ki, sənə dediyim sözlərdən qeyri,
Bir söz deməmişəm nə düz, nə əyri.

Tutaq ki, etmişəm mən elə günah,
Ondan ötrü mənə, ey kərəmli şah.

Layiqdir ki, çəkəm Qarun zilləti?
Bəlimə yaraşan hədsiz lənəti?

Xəta işlədimsə, bildim keçərsən,
Günahım da olsa, sən rəhm edərsən.

2

HƏBSİYYƏ

(Q ə s i d ə)

Heç kəs ilə həyatda karım yox,
Kara gəlmək üçün də yarım yox.

Öldürüb səbr-intizar məni,
Daha bir ayrı intizarım yox.

Taleyimdən cahanda naümidəm,
Ümidim yox, ümidvarım yox.

Belə nəhs ulduzumla dünyadə –
Bir üzü nurlu ruzigarım yox.

Bağımı tapdayıb xəzan küləyi,
Ah, neynim ki, novbaharım yox?!

Sanki divanəyəm bu zəncirdə,
Əlləri bağlı, ixtiyarım yox.

Kimsədən bir nicat ümidi hanı –
Ki, mənə yar olan nigarım yox.

Bu diyarda deyirdim ömr edərəm,
Sən demə, bəs ki, heç diyarım yox.

Mey içərlər həyatda şadlıq üçün,
Məstliyim yox, nə də xumarım yox.

Dərd budur, bir belə qəm ilə mənim
Qəmli bir şəxsə etibarım yox.

Yaralı qəlb ilə aman, yarəb, –
Ağrıya səbr ilə qərarım yox.

Belə bir zindanın içində daha –
Dözməyə artıq iqtidarım yox.

Öldürün, qurtarın bu zillətdən,
Etməyə naləm, ah-zarım yox.

Hər nəyim var idi fəna oldu,
Yoxa çıxmış həyatda varım yox.

Canımı saxlamağa zindanda –
Duadan başqa arzularım yox.

Ayrılıqda yaman əsir oldum,
Kuyinə vəsl üçün güzarım yox.

Var-yoxumdan bəla gəlir başıma,
Mülk-malım, həşəm-davarım yox.

Bu qalanı mənə edin məskən –
Ki, nə bağçam, nə laləzarım yox.

Bir balam, bir özüm, daha heç kəs,
El-obamdan mənim qalarım yox.

Köksümü çulğalayıb kədər-qüssə,
Nə qədər söyləyim, qubarım yox.

Düşmüşəm bəndə çarəsiz, bikəs,
Qapını açmağa açarım yox.

3

QƏZƏLLƏR

Könlümü hansı gecə ayrılığın qan etməz?
Hansı çarən bu sınıq qəlbimi nalan etməz?

Bir gün olmaz ki, sənin möhnəti-eşqin, gözəlim,
Qəlbimi atəşkədə, göz yaşımı ümman etməz.

Rahat olmaz gözüm hicrində sənin bir gecə, gər –
Kuyinin torpağını qan ilə əlvan etməz.

Çox dəyərdi zərəri ləlinə əfi saçının, –
İki cadu gözün hərgah onu heyran etməz.

Mənə vəd etdi vəfa göstərə ol ləli-ləbin, –
Etməsə bağrımı qan, əhdinə peyman etməz.

Eşqinin dairəsində cana gər olsa xətər, –
Fələkini buradan mən bir insan etməz.

Yox, yanıldım, o kəsin canı düşər qorxuya ki, –
Şah Mənuçöhr Fəriduna fəda can etməz.

Şirvanın şahı Mənuçöhr elə bir xaqandır, –
Əql onun rütbəsi tək çərxdə cövlan etməz.

Tutmasaydı o vücudu fələk aləmdə əziz, –
Kürreyi-ərzi alıb çiyninə dövran etməz.

Olmasaydı əgər İsa şərəfi, heç bir kəs –
Eşşəyin dırnağını ətləsə şayan etməz.

4

Canan, qəmindən özgə mənim yarım olmasın,
Zülmündən ayrı başqa həvəskarım olmasın.

Hər yanə seyr edəm, dolanam, bir səhər qılam,
Hicrandan ayrı burda səbəbkarım olmasın.

Vəslinlə həmdəm olmağa imkanım olmadı,
Bir ayrı qəm bu dünyada dildarım olmasın.

Sordun ki, məndən ayrı nə cürsən? – Eşit deyim:
Bir gündəyəm ki, heç belə əğyarım olmasın.

Çatmaq, gülüm, sənə, – nə edim, – qismət olmadı,
Səndən kənarda bağ ilə gülzarım olmasın.

Xar eylədin, fələk, Fələki düşdü möhnətə,
Baxsam əgər sənin üzünə, arım olmasın.

5

Vidayə olmadı imkan, gözəl yarımdan ayrıldım,
Qəm ilə dərdə yar oldum, vəfadarımdan ayrıldım.

Mən ondan ayrılan dəmdə dözərdim möhnətə, dərdə,
Bu gün tənha dözümdən yox, bütün varımdan ayrıldım.

Könül ağlar, fəğan eylər, fələk rəhm eyləməz əsla,
Sənin tək şadlığa, eyşə səbəbkarımdan ayrıldım.

6

Canan eləməz heç vaxt, heç vaxt eləməz canan –
Dərman bu qəmə bir dəm, bir dəm bu dəmə dərman.

Hicran bizi öldürdü, öldürdü bizi hicran,
Min can verər vəsli, vəslilə verər min can.

Artar nə qədər dərdim, dərdim nə qədər artar,
Ondan nə ki, var dərdim, dərdim nə ki, var ondan.

Bostan bəzənib ondan, ondan bəzənib bostan,
İnsan bu cürə olmaz, olmaz bu cürə insan.

7

Qəmin, dərdin edib heyran –
Ayırmışdır həyatımdan.

Deyərdim halımı bir dəm,
Heyif, yoxdur buna imkan.

Çəkin böylə cavanlıqdan,
Məni məhv eylədin, canan.

Sənindir can, könül vallah, –
Nə varsa aşikar, pünhan.

Nolar ki, yarım olsaydın, –
Bu dünyada mənim bir an?!

Yolunda hazıram hər dəm –
Səninçin mən olam qurban.

Fələki söyləyər daim:
Qəminlə etmişəm peyman.

8

Sanki iki həftəlik qəmərdir,
Ağ sinəsi nurlu bir səhərdir.

Zülfü o camalının üzündə –
Ay üstə buludmu, dərbədərdir?

Ay çöhrəsi altdakı buxağı,
Nur ilə dolu səhifələrdir...

Hüsn ilə cəmalına hüdud yox.
Ondan danışan bütün şəhərdir.

9

TƏKBEYT

Nə xeyri var qəmi-eşqin çəkəm bu dəhrdə mən,
Həmi fələk Fələkiylə uyuşmayır, həmi sən.

## RÜBAİLƏR

10

Zülmətlər əlindən qalmayıb səbat,
Bu sonsuz yollarda görünmür nicat,
Bəlkə də Xızr tək bir nəfər gəldi,
Verdi bizim üçün o, abi-həyat.

11

Tanıdım sağ əli ta ki, mən soldan,
Anlayan günümdən gülmədim bir an.
Qorxuram belə bir ümid içində –
Ömrümə son qoya bu zalım cahan.

12

Həyatdır bizlərə sənin vüsalın,
Gözəllik rəmzidir hüsn-cəmalın.
Bizə ki, mərhəmət eylədin dünən, –
Dünyayə sığmayır əqlin, kəmalın.

13

Verməz bizim üçün, neynək, pay ümid,
Bir belə qəm ilə verməz hay ümid.

Yoxdur ki, ümidin eşqdə yeri,
Vay deyək, vay ümid, vay ey, vay ümid!

14

Heç almadım ömrüm boyu bir kam səndən,
Bir olmadı ruhum belə aram səndən.
Hicrində qalıb həmişə bədnam oldum,
Saldı bu cürə ayrı bu əyyam səndən.

# Q İ V A M İ  M Ü T Ə Ə R R İ Z İ

*XII əsr Azərbaycan şairlərindəndir. Bəzi təzkirələrə görə Nizami Gəncəvinin qardaşı, yaxud əmisi oğlu olmuşdur. Sadə peşə sahibi* (*çörəkçi*) *imiş. Gözəl şairlik istedadı olmuş, 7000 misralıq divan yaratmışdır. Zəmanədən şikayət ifadə edən tənqidi-satirik şeirlər müəllifidir. Məhəbbət mövzularında zərif lirik şeirləri vardır. Qızıl Arslana və başqalarına qəsidələr yazmışdır.*

## QƏSİDƏ

(*bir parça*)

1

Qədrində öyünüb dayanar fələk,
Böyük qüdrətinə şükr edər mələk.

Hümmətindi girən yurdun qoluna,
Dövlətin Rəxşini saldın yoluna.

Bayrağından xanın evi alçalar,
Geniş yollar olur sən keçəndə dar.

Cəlalını görsə düşmənin gözü, –
Qaranlıq gecəyə dönər gündüzü.

Cürətini görsə düşmənin əgər, –
Əlindəki gülü tikana dönər.

Zülmün xəstəsinə səndədir çara,
Ölkə düşməninə vurarsan yara.

Düşməni himmətin o hala salar –
Ki, necə baxışın dağıdar dinar.

Din küfr olar – sevgin olmasa, inan,
Ardır öyünməkdə – rəyin olmadan.

Sənəmlər məbədə necə baş əyər –
Səadət qapıdan elə əyilər.

Balıq gözəl aya bir ziyan vurmaz,
Mayallaq vuran quş göyü uçurmaz.

Fələksənsə, neçün gizlindir düşmən?
Qəmərsənsə, düşmən incəlir nədən?

Sənin tək düşmən də yüksəkdə durar,
Sənin yerin taxtdır, onun yeri dar.

Çarpışma günündə o qəza-bədən,
O qədər yerişli atına minsən,

Hadisə yaradan dün ya ərləri,
Ayna tutan göyün bütün ülkəri.

Qapımda səcdəyə gəlib baş qoyar,
Vücuduna canlar edərlər nisar.

Dövlətinçün olmuş düşmən dərd çəkən;
Dərd çəksə yaxşıdır həmişə düşmən.

2

HİKMƏT VƏ TƏCRİD HAQQINDA

Axirət evinin fikrini etməli,
Rahatlıq mülkünü atıb getməli.

Bağlamaq vaxtıdır səfər yükünü,
Təbli çalmalıyam bu zəfər günü.

Əziyyət yurdundan xəzinə toplaram,
Yüksək aləmlərə qanad açaram.

Məni bəsləmişdir o pak girdigar,
İncitmişdir məni canbaz ruzigar.

Bəlanın xərçəngi yaralar məni,
Yorğunluğun dişi paralar məni.

Təmdən, niyazdan olmuşam heyran,
Sağ-sol bilməyirəm, qaçıram hər an.

Yeyər təmə məni iniq tək şəksiz,
Mən balıq kimiyəm, bu dünya dəniz.

Rahatlığın yeri başqadır gerçək;
Durub bir ayrı iş başlayam gərək.

Axmaqlıq deyilmi uymaq zamana,
Varlığım od tutub hey yana-yana.

Bir quşam, dünyadır mənimçün qəfəs,
Səs verməz səsimə dünyada bir kəs.

Zəmanə zülmündən ahlar saçaram,
Bu qəfəsdən haçan, haçan uçaram?

Cavanlıq gecəsi məndən ayrıldı,
Başımdan işvəkar bir sübh açıldı.

Getdi eyş gecəsi, gəldi dərd günü,
Bütün sirlərimin açdı üstünü.

Zəmanədən oldum o qədər nasaz, –
Bildir məni görən bu il tanımaz.

Olsa da bir kəklik kimi duruşum, –
Fəna ovlağında əcəl – ov quşum.

Xalis qızıl kimi olsam da mətin, –
Əcəlin ağzıdır mənə kəlbətin.

Cəhənnəm ki, hələ odlar püskürər,
Əridər, olsam da Səddi-İskəndər.

Rəhmətin yüz nazla mürəbbim oldu,
Məni cəhənnəmin qorxutmaz odu.

Onun rəhmətilə iki cahanda –
Fəxr ilə yüksələr başım hər anda.

Bəsdir, ey Qivami, söz çörəyindən –
Dünya bazarında çörək satdın sən!

Şairlikdə yoxdur mislimi görən,
Çörəkçilikdə də hələ təkəm mən.

Nə zaman toxusam bir nöqtə əgər, –
Mənim bir nöqtəmdən min fitnə törər.

3

AYRILMAQ VƏ TƏKLƏŞMƏK HAQQINDA

Könül, bir gün bir iş gör, sabah yetsin fəryada,
Qoşma arzu dalınca bu sevdalı dünyada.

Atıl tamah torundan – Yunis yeyəndir balıq,
Əzra Vamiq öldürər – naz qeydindən ol fariq.

Şöhrət qazanmış əqli dünya əsiri etmə;
Gözəl qadın ardınca pak kişini yürütmə.

Sən dünyanı izlərsən, ölüm də səni izlər,
Qabaqda heybətli şir, dalda qorxulu əjdər.

Tutmuş tamah qoşunu qabağını, dalını,
Yüz min iblis içində gör Adəmin halını.

Bəs deyilmi dostlara süzdün şərab sən, ey yar?
Çox zaman süzgəc kimi gözlərindən qan damar.

Arif o insandır ki, canında vardır iman,
Sərvətli, varlı evdə lazım olar pasiban.

Ölüm aciz eyləyər, kişi qoçaq olsa da,
Rüsvayçılıq qazanar oğru, qıvraq olsa da.

Gedəcəksən dünyadan, ya nökər ol, ya soltan,
Öləcəksən çarəsiz, ya arif ol, ya nadan.

Yusif sənin quyundan gözəl anda çıxacaq,
Qaf dağından Simurğün birdən qalxıb uçacaq.

4

Süsəni könlümdən aparmış qərar,
Nərgizi başıma gətirmiş xumar.

Onlar nərgizmidir, ya cadumudur?
Onlar süsənmidir, yainki gülnar?

Saralıb solmuşam ayrılığından,
Aşiqi sevgili dərdi soldurar.

Eşqimin bədəni qəmdən incəldi,
Bəxtimin gülünə məskən oldu xar.

Mənim gündüzümdür aydın çöhrəsi –
Qara saç altında ay kimi parlar.

Könlümün tüstüsü, gözümün yaşı –
Buludda, dənizdə qoymadı miqdar.

Saçının ətridir səbanın yeli,
Yanlış dedim, məgər yel ənbər saçar?

Mən də, saçları da başlar əymişik –
O gülün üstünə, xardır mənə yar.

Varlıdır gözüm tək dodaqları da,
Bunda su çağlayır, onda dürr parlar.

5

Yüz min qapı açar xatirim yenə:
Səbəblər səbəbiköməkdir mənə.

Xatir sarayımda yüz min qapı var,
Hər birindən könül min qapı açar.

Tanrı sənətinə hər bir qapıdan
Baxıram, qapımı bir odur açan.

Zülmət bucağında elə ustadır –
Ki, suda alətsiz naxış yaradır.

Hikmətindən nişan bu geniş göylər,
Onun qüdrətilə günəş nur səpər.

Rizvanın əlinə onun rəhməti –
Vermiş açarıyla bütün cənnəti.

Heybəti göstərmiş insan oğluna –
Bu dünya sərabdır, aldanma ona.

Sənəti yaratmış günəşi, ayı, –
Həm qızıl xirməni, həm civə çayı.

Hökmüylə qəndil tək yanar afitab;
Edər ay topunu Zöhrəyə mehrab.

Durmadan Ay, Günəş hey ötüb keçər;
Torpaq sakit durar, göylər tələsər.

Heyran dolanarlar acizlərsayaq –
Saf civə od görmüş, top isə toxmaq.

Milçəyin qanadı, ya Filin qolu –
Sınsa, yamayarmı bir insan oğlu?

Ondakı kərəmin hesabı yoxdur;
Tanrının bəxşişi bundan da çoxdur.

Apardığın nədir, məhşərə bir bax,
Boş bir səhifədir, şöhrətdir ancaq.

Burda əyanlardan alsan köməyi, –
Orda müvəkkilin əzab mələyi.

Meyə uyan cavan, qocanı dinlə!
Vermə cavanlığı mey üçün yelə.

Gözlərində oynar gözəl və şərab,
Qulağında çalar cəng ilə rübab.

Burax boş həvəsə, eşqə uymağı,
Xüsusən heyifdir cavanlıq çağı.

İşrətin əlindən, ey qəddi kaman, –
Ömrün də ox kimi uçdu kamandan.

Oxlar yaxdıraraq o kinli xəzan,
Ömür ağacını saldı yarpaqdan.

Bu qarğa qanadlı, zalım ruzigar –
Yağdırdı başını çovğunlu bir qar.

Fələk ömr evinin tirin sındırdı,
Zaman o xeymənin ipini qırdı.

Cavanlıq dövründən gəl axıtma yaş,
Qızılçün eyləmə dürləri şabaş.

Ömrü zay etdisə, fəryadını at,
Rüstəmçün Söhrabdan sonra nə həyat?

Yoxdur Qivami tək tövhiddə pərgar,
Sözündə sadəlik, mətinlik də var.

Könlündə elə bir çörək bişirər,
Zəkanın ağzında şəkərə dönər.

Könül təndirində canı var, bilin,
Buludda Ay qalmış, pərdədə gəlin.

Heyvanat tükündən, çöl torpağından,
Bulud qətrəsindən, göy yarpağından.

Əcəb zəmanədir, türfə xəlayiq –
Cəhalət meyindən tapılmaz ayıq.

Nə dindar zahid var, nə təmiz alim,
Nə adil bir şah var, nə doğru hakim.

Alıcı tək qaçar bir-birindən.
Məhşərdən qorxmazlar bilmirəm nədən?!

Cəhənnəm odundan görməzlər nişan;
Günahdan salmışlar su üzrə qalxan.

İşlər belə getsə, çəkməz o qədər –
Göylər alt-üst olar, dünya çevrilər.

Səni öz sözündə edərlər əsir,
Alıcını vurar qanadlanan tir.

Xeyirsiz bədənə heç vaxt, heç zaman –
Behiştin paltarı yaraşmaz, inan.

Görən varmı məgər dünyada şeytan –
Qoysun nüvvab kimi başına tilsan?

Özün münəccimə lənət edərsən,
Həmi də hökmünü can tək istərsən.

Münəccim kəssabsa, sən daha bədnam,
Yalançıdan pisdir riyakar adam.

Kibrdən, qürurdan lovğalanırsan,
Çünki hər şeyini müftə alırsan.

Bir kəslə ki, yumşaq danışmaq gərək, –
Yaraşarmı sənə kobudluq etmək?

Rəvamıdır versin vicdanlı insan –
Sincab sinəsində kirpiyə meydan?

Atına namənin ağırlığından –
Yer üzəngi olmuş, cilov asiman.

6

QİTƏ

Yüksək hüzuruna yetmədim bu gün,
Üzrüm var, günahım burasındadır:
Könül gəmisində fikrimin Nuhu –
Mədhin qasırğası ortasındadır.

# İZZƏDDİN ŞİRVANİ

*XII əsr Azərbaycan ədəbiyyatının tanınmış nümayəndələrindəndir. Xaqani, Fələki kimi görkəmli şairlərin müasiridir. Dövrün mədəni həyatında özünəməxsus yer tutan, ədəbi mühitlə yaxından bağlı, nüfuzlu bir şəxsiyyət kimi tanınmış, Şirvanşahlar sarayına yaxın olmuşdur. Xaqaninin İzzəddin adını öz əsərlərində çəkməsi də bu fikri təsdiq edir.*

*Əsərlərindən bəzi nümunələr ayrı-ayrı cəng və bayazlarda qorunub saxlanmışdır. Bu nümunələr onun şerin incəliklərini mənimsəyən, klassik poeziyanın müxtəlif biçimlərində əsərlər yaratmağa qadir bir sənətkar olduğunu göstərir.*

1

QƏSİDƏ

(*bir parça*)

Çəmənə badi-səba müşkünü etdikcə nisar,
Güllərin ətri məni uyqundan etdi bidar.

Bəzənib naz ilə mey camını tutmuş əldə, –
Çəmənin bir tərəfində gəzir ol nazlı nigar.

Müşkü kafur ilə etmişdi zəmanə həmdəm –
Necə ki, ağ üzünə saçlarını tökmüş yar.

Gül ilə yasəməni, susəni bu altı cəhət –
Xoş müsəlləs elədi, çəkmədi zəhmət əttar.

Qeybdən açdı mənim könlümə yüzlərcə qapı –
Çəmənin rövnəqi, sübhün şəfəqi, ətri-bahar.

Yaxası açmış idi sinəsini sübh kimi,
Nil tək çəkmiş idi gül üzünə dağı xumar.

Badə tərlətmiş idi al yanağın lalə kimi,
Sanki şəbnəmlə bəzənmişdi çəməndə gülnar.

Badədən sərv boyu gah əyilir, gah düzəlir,
Necə sübhün yeli gül şaxzələr ilə oynar.

İnciyirdi bədəni nazik ipək köynəkdən,
Nəfəsi gül ləbinə xeyli verirdi azar.

Hər güləndə dodağı, ləl kimi şəklindən –
Cəmşidin möhrü kimi hökmün edərdi izhar.

Zülm görmüşlər onun ədli ilə rahətdir,
Evlərində hamı azadə keçirdir ruzgar.

Elə şahdır bu müzəffər atası – hərb günü –
Qaldırar çərxi-fələkdən iti şəmşiri buxar.

Atının nəli yürüş vaxtı qopardıqca şərar,
Doqquzuncu fələyin sahəsi ulduzla dolar.

Afərinlər sənə, şahım, göyə bir qıy vursan, –
Heybətindən karıxıb dağ kimi olmaz səyyar.

And o Allaha ki, ən münkir olanlar dilini –
Elə bağlar ki, özü Tanrını eylər iqrar.

And ola düşməni pamal eləyən hümmətinə,
And ola bəxşişinə ki, az onunla çoxalar.

And ola nizənə, ondan ki, cəhənnəm od alır,
And ola sikkənə ki, rəng alar ondan dinar, –

O günəş rəyli, ayüzlü şahın taxtından –
Öz xoşilə bu qulun verməmiş hicrana qərar.

2

Kuyində fələk dün gecə görcək məni sordu:
"Kim saldı səni bu hala? Dur bir mənə göstər".

"Yarın o xumar gözləri" – dindim. Dedi: "Heyhat!
Çox sərxoş olublar, səni, qaç, öldürəcəklər".

# İZAHLAR

Bütün orta əsr Şərq poeziyası kimi bu kitaba daxil olan əsərlər də dövrü üçün səciyyəvi məcazlar sistemi, mifoloji, dini və folklor obrazları ilə zəngindir. Şübhəsiz, belə əsərlərin bir çoxunun bütünlüklə və dərindən dərki çoxcəhətli filoloji hazırlıq tələb edir. Oxucunun əlində bir sıra müvafiq ensiklopediya və lüğətlərin olduğu nəzərə alınaraq burada belə söz və ifadələrin, məcaz və realilərin ancaq bir qisminin aydınlaşdırılması, bəzi hallarda isə məzmun ardıcıllığı pozulmadan ayrı-ayrı beyt və bəndlərin ixtisarı lazım bilinmişdir.

## MUSA ŞƏHƏVAT

1. *Həmzə (İbn Abdulla) – xəlifə Əbdülməlik ibn Mərvana (685-705) qarşı üsyan qaldırmış Hicaz valisi Abdulla ibn-Əz-Zübeyrin oğlu. 686-688-ci illərdə İraqda vali olmuşdur. Rəvayətə görə şairlərə və başqa sənətkarlara himayə göstərmiş, səxavətlə onlara bəxşişlər vermişdir.

2. Təlhə (Təlhə ibn Übeydüllah) (?-656) – İslam dininin banisi *Məhəmmədin* (570-632)** yaxın köməkçilərindən (əshab) olmuşdur. Bir sıra döyüşlərdə iştirak etmiş, Məhəmmədin rəğbətini qazanıb çoxlu qənimət ələ keçirmişdir. Teym (Teym bin Murra) – ərəb qəbiləsi. Qüreyş qəbiləsinin qollarından biridir. İlk ərəb xəlifələrindən olan Əbu Bəkr əs-Siddiq (632-634), habelə Məhəmmədin yaxın köməkçilərindən Təlhə bin Übeydüllah (?-656) Teym qəbiləsindən çıxmışdır. Haşimilər – Məhəmmədin ata nəslinə mənsub olanlar; Haşimilər sülaləsi.

3. Səid (ibn Süleyman ibn Yəzid ibn Sabit əl-Ənsari) – VII əsrin ikinci yarısında Mədinə şəhərində qazi, İşlərində ədaləti gözlədiyi rəvayət olunur. İbn Cürmüz (VII əsr) – ilk ərəb xəlifələrindən Osman ibn Əffanla Əli ibn Əbu Talib arasında gedən mübarizədə ikincinin tərəfində çıxış edən döyüşçü. 656-cı ildə Osman ordusunun qoşun başçılarından Zübeyr ibn Əvvamı öldürdüyünə görə məşhurlaşmışdır.

## İSMAYIL İBN YƏSAR

2. Əbu Bəkr – İsmayıl İbn Yəsarın qardaşı Məhəmməb ibn Yəsarın künyəsi. Künyə – adama müsbət işinə, əlamətinə görə sonradan verilən ad. Həşr ("bir yerə yığma" deməkdir) – İslam dini etiqadına görə insan öldükdən sonra ruhu diri qalır. Axirət dünyasında Allah insanların ruhlarını bir yerə yığıb onları əməllərinə görə mühakimə edir.

---

* İzahların əvvəlində verilmiş rəqəmlər mətndəki müvafiq şerin sıra nömrəsinə uyğun gəlir.

** Mətnin içində kursivlə gedən sözlərin mənası bölmənin həmin söz işlənən müvafiq yerlərində izah edilmişdir.

3. Cinab – Mədinə yaxınlığında yer. Cinab vadisi və oradakı eyniadlı quyu bir sıra ərəb şairlərinin əsərlərində vəsf edilmişdir. Hind obası. Hind – ənənəvi ərəb poeziyasının üç obrazından (Hind, Səlma və Leyla) biri. Onlar gözəllik, sədaqət rəmzi kimi lirik şeirlərdə vəsf edilmişdir.

6. Şam – Suriya Ərəb Respublikasının paytaxtı Dəməşq şəhərinin keçmiş adı.

## ƏBU NƏSR MƏNSUR İBN MÜMKAN TƏBRİZİ

1. Mürşid – 1) doğru yola çağıran, düz yol göstərən; 2) dini təriqət rəhbəri. Davud – e.ə. XI-X əsrlərdə yaşamış yəhudi hökmdarı. Dini rəvayətə görə, müqəddəs "Zənbur" kitabını tərtib etmiş və oradakı dini nəğmələri gözəl səslə oxumuşdur. Klassik ədəbiyyatda gözəllik aşiqi, ilahi müğənni simvolu kimi yad edilir.

## XƏTİB TƏBRİZİ

1. Diclə – İraqdakı Fərat çayının ərəbcə adı. 2. Hər kimi görmüşəm, ey vay, bu gün Bağdadda – bu misrada Xətibin İraqın paytaxtı Bağdadda yaşadığı və həmin şeri də orada yazdığı bir daha təsdiq olunur.

## MƏSUD İBN NAMDAR

1. Beyləqan – orta əsrlər Azərbaycanın ən böyük mədəni şəhərlərindən biri; bir sıra görkəmli şairlərin vətəni. Dirhəm – o zaman gümüş pul vahidi.

2. Bədiüzzəman – "dövrünün bacarıqlı sənətkarı" deməkdir. Məsul ibn Namdar bu adı özünə aid edir. Müştəri ulduzu – Yupiter planeti. Süha ulduzu – çətinliklə görünən kiçik ulduz. Aran – orta əsr Azərbaycanının şimal hissəsi, Almaniya adı ilə də tanınırdı.

3. Leylətül-qədr – "tale gecəsi", "qüdrət gecəsi" deməkdir. Müsəlman təqvimi ilə Ramazan ayının 27-ci gecəsidir. Dini əsatirə görə, guya *Məhəmmədə* Quran həmin gecə "nazil olmağa" başlamışdır və hər il həmin gecə Allah hər bir adamın müqəddəratı haqqında qərar qəbul edir.

6. Mədinətüs-səlam – "sülh, dinclik şəhəri" deməkdir. Bağdad şəhərinə verilən adlardan biri.

7. Müstövfi – XI əsrdə şəhərlərdə xəzinə başçısı, Səmək bürcü bu şəxsin elə bil ki, özüdür. Səmək – "Balıq bürcü"dür. Rəvayətə görə ilin Balıq bürcü üstünə düşməsi bolluq əlaməti deməkdir. Şair bu məcazi ifadədən mədh etdiyi şəxsin səxavətini göstərmək üçün istifadə etmişdir. Sürəyya – göydə topa kimi görünən ulduzlar; Yeddi qardaş. And içib Yəzid kimi Hüseyni aldadarlar. Dördüncü ərəb xəlifəsi Əli ibn Əbu Taliblə ilk Əməvi xəlifələri arasında gedən münaqişəyə işarədir. Məlum olduğu kimi, Yəzid Əlinin oğlu *Hüseyni* aldadıb öldürmüşdür. Tənqid etdiyi

şəxsi Yəzidə bənzədən Məsud ibn Namdarın şiəməzhəb olduğu qənatinə kömək olar.

## XƏTTAT NİZAMİ TƏBRİZİ

1. Bizim böyük sahib – Səlcuq sultanları Alp-Arslanın (1063-1072) və oğlu Cəlaləddin Məlikşahın (1072-1092) vəziri, XI əsrin böyük dövlət xadimi və alimlərindən biri, məşhur "Siyasətnamə" əsərinin müəllifi, Bağdad "Nizamiyyə" darülfünununun banisi.

## QƏTRAN TƏBRİZİ

1. Əbülhəsən Əli Ləşkəri – Qətranın dövründə Gəncədə hökmranlıq etmiş (1033-1050) Şəddadilər sülaləsinin altıncı hökmdarı. Mənuçehr – İranın mifik Pişdadiyan sülaləsinin yeddinci padşahı, *Fəridunun nəvəsi, İrəcin oğlu.* Firdovsi (936-1029) "Şahnamə"sinin qəhrəmanlarından biri. Ənuşirəvan – Sasanilər sülaləsindən İran şahı I Xosrov Ənuşirəvan (531-579). Bədii əsərlərdə "adil" ləqəbi ilə məşhur olmuşdur. Bir sıra mütərəqqi islahatları ilə İran dövlətinin qüdrətini artırmağa çalışmışdır. Qudərz – Firdovsi "Şahnamə"sinin qəhrəmanlarından biri, pəhləvan. Ərdəşir – 224-cü ildə Sasanilər sülaləsinin əsasını qoymuş İran şahı. Rəvayətə görə, guya "Sasan" adlı bir çobanın nəvəsi olmuş, sülalənin adı da buradan götürülmüşdür. Mənuçehr, Ənuşirəvan, Qudərz və Ərdəşir Qətranın mədh etdiyi hakim Əbülhəsən Əli Ləşkərinin olanlarının adıdır.

2. Rizvan – dini əsatirə görə, cənnətin qapısında duran mələk. "Cənnəti-Rizvan" (Rizvanın cənnəti) ifadəsi klassik ədəbiyyatda geniş yayılmışdır. Yəzdan – Allah, Tanrı. Malik – eyni əsatirə görə, cəhənnəmin qapısında duran mələk. Qeysər – Əsli: sezar. Orta əsrlərdə Bizans imperatorlarına Şərqdə verilən ad. Xan – orta əsrlərdə Şərq ölkələrində hökmdar, hakim, sərkərdə. Əvvəllər xaqan olmuşdur (Əsli: kaqan). "Xaqan" termini ilk dəfə 312-ci ilin Çin salnamələrində işlədilmişdir; orta əsrlərdə ən böyük türk sərkərdələrinin daşıdığı titul. Monqol sərkərdələrinə verilən "qaan" titulu da "xan"la bağlıdır. Ali-Saman – Saman sülaləsi; yaxud: Samanilər. Ərəb istilasının nisbətən zəiflədiyi dövrdə İranın şimal-şərqində yaradılmış fars-müsəlman dövlətinin başçıları (875-999). Paytaxtı Buxarı şəhəri olmuşdur. Samanilər öz qədim adət-ənənələrinə ehtiram bəsləmələri ilə məşhurdurlar. Bunun bədii ifadəsini Firdovsinin "Şahnamə" əsərində aydın görmək olur, Tarixi xidmətlərindən biri yeni fars dilini – dəri dilini yaratmalıdır. Yədi – Beyzası Musanın... hərfi mənası: Musanın ağ əli. Dini rəvayətə görə, Musa peyğəmbərin göstərdiyi doqquz möcüzədən biri də əlini qoltuğuna qoyub çıxararkən gümüş kimi ağarıb parıldaması imiş. Puri-dəstan – Dəstanın oğlu. Firdovsi "Şahnamə"sinin əsas qəhrəmanlarından biri olan Rüstəmə verilən ad. Ona bəzən "Rüstəmi-dəstan" da deyilir. "Dastan" Rüs-

təmin atası Zalın ləqəbidir. Lövhi-məhfuz (mühafizə edən lövhə) – Şərq mifologiyasına görə, göyün ən yüksək qatındakı yazılı lövhə; onun üzərində həyat və kainatın sirləri, insanların taleyi, baş vermiş və verəcək bütün hadisələr qeyd olunur.

3. Mehrab – burada: məşuqənin qaşı. Xəlil – Quranın bir çox surələrində adı çəkilən və haqqında danışılan İbrahim peyğəmbər. Din tarixində bütləri sındırması ilə məşhur olan bu peyğəmbərə çox vaxt "Xəlilüllah", yəni "Allahın dostu" da deyirlər. Süleyman – qədim yəhudilərin qüdrətli və müdrik hökmdarı (Bibliyada: Solomon); Məhəmməddən əvvəlki peyğəmbərlərdən biri. Müsəlman əfsanələrinə görə, dünyadakı bütün canlılar ona tabe imişlər. O, bütün heyvanların və quşların dilini bilirmiş. Helm – yumşaqlıq, sakitlik, xeyirxahlıq.

4. Suzan – 1) yanan, odlanan; 2) qəmgin. Mehr – məhəbbət, rəğbət. Çovqan – at üstündə oynanılan top oyununda əldə tutulan ucu əyri xokkey klyuşkasına bənzər ağac. Loğman – əfsanəvi mahir həkim, tibb alimi. Xahan – istəyən arzu edən. Keyvan – Saturn planeti. Bürhan – dəlil. Müəyyən bir dini fikrin düzgünlüyünü göstərmək üçün gətirilən sübut, ehkam.

5. Mübaşir – idarə edən; iri torpaq sahiblərinin mülklərini idarə edən məmur.

6. Bül-Müəmmər – XI əsrdə Gəncədə hökmranlıq etmiş *Əbülhəsən Əli Ləşkərinin* vəziri. Təam – yemək, xörək.

7. Vəhsudan (1054-1067) – Qətran Təbrizinin hamisi, XI əsr Aran hakimi Əmir Əbu Mənsur Bəhsudan. Zubin – Nizəyəbənzər yüngül silah növü, mızraq.

8. Kəşmir – Hindistanın şimalında bir ölkə. Toxuculuq malları ilə məşhurdur. Hazırda Hindistanın tərkibinə daxildir. Keşmər şəklində də işlənir. Sünur. Burada: sərhədlər.

9. Əmir Əbülfəth – Aran hökmdarı. Həyat suyu – Cənnətdəki möhuma bulaq suyuna işarədir. Cəngü cədəl – dava-dalaş; vuruşma. Peykan – ox. Əgər demirsə o "peyğəmbərəm zəmanədə mən", Niyə qılıncı, əli m öcüzə edir elan? *Musa* peyğəmbərin ecazkar əlinə bənzətmədir. Həssan – VII əsrdə yaşayıb-yaratmış ərəb şairi Həssan ibn Sabit (563-674). Məhəmməd peyğəmbərin şəninə yazdığı qəsidələri ilə məşhurdur.

10. Nuh – Quranda haqqında geniş məlumat verilən əfsanəvi peyğəmbər. "Nuhun ömrü" dedikdə Qətran Təbrizi məşhur dini rəvayətə işarə edir. Guya Nuhun yaşadığı dövrdə hamı haqq yoldan çıxdığına görə, Allah qəzəblənib böyük tufan qoparmış, bütün yer üzünü su basmış, yalnız Nuh və onun ailəsi gəmi ilə xilas olmuşlar. Beləliklə, Nuh öz müasirlərinin hamısından çox yaşamışdır.

11. Ərğəvan – tünd qırmızı rəngli çiçək.

12. Bərqi-nisan – Bahar şimşəyi. Xərxiz – Çinin Türküstan hissəsində əla müşkü və toxunma malları ilə məşhur olan yer. Xərxar – Axar su.

Kuhsar – dağlıq, dağ olan yer. Xeyri – Burada: çiçək adı. Barbəd – Sasani hökmdarı Xosrov Pərvizin çalğıçısı və nəğməkarı. Dərbar – Saray qapısı; şah qapısı. Gaviyan bayrağı – Gavə tərəfdarlarının bayrağı. Qurtuluş rəmzi kimi müqəddəs sayılmışdır. Bar günü axça səpilmiş bəzmə oxşar qönçələr – misranın mənası: məhsul yığımı günü qönçələr gümüş pul kimi parıldayar. Pişxidmət – xidmət edən. Nüsrətverən – köməkçi, yardımçı.

13. Rüstəm – Firdovsi "Şahnamə"sinin əsas qəhrəmanlarından Zal oğlu Rüstəm. Zöhrə – 1) Venera planeti. Nahid; 2) qədim yunan mifologiyasında gözəllik və məhəbbət ilahəsi.

14. Tibet – Asiyanın ən yüksək yeri. Çin Xalq Respublikasının cənubi-qərbindədir. Xəllux – gözəllik ilə məşhur qədim Türkistan şəhəri. Pərvin – Ülkər ulduzu. Yusif – Qədim Yəhudi rəvayətləri əsasında əvvəl "Bibliya"-da, sonra isə "Quran"da öz əksini tapmış əfsanənin qəhrəmanı, "Yusif" surəsi Qurandakı hekayətlərin ən gözəli sayılır. Sonralar bu süjetdən dünya ədəbiyyatında (Firdovsi Tomas Mann, Nazim Hikmət) və incəsənətində (Şərq miniatürləri, Rembrandt məktəbi nümayəndələrinin yaradıcılığı) geniş istifadə olunmuşdur. Əsatirə görə, qardaşlarının yaradıcılığı) geniş istifadə olunmuşdur. Əsatirə görə, qardaşları onu quyuya salandan sonra köynəyini qana bulayıb atalarına verməklə "Yusifi qurd yedi" – demişlər. Səlman – Məhəmməd peyğəmbərin yaxın adamlarından və köməkçilərindən biri. İsiyi-Məryəm – xristianların peyğəmbəri, Məryəm oğlu İsa nəzərdə tutulur. Musiyi-İmran – Yəhudilərin peyğəmbəri, İmran oğlu Musa nəzərdə tutulur.

15. Bütxanə – bütlər qoyulan yer, məbəd; bütpərəstlərin ibadətgahı, Rəxş – Rüstəmin əfsanəvi atının adı. Şəbdiz – Şirinin bibisi Məhinbanunun Xosrova (bax: *Pərviz*) bağışladığı qara rəngli atın adı. Pərviz – Sasanilər sülaləsindən İran şahı II Xosrov Pərviz (591-628). Nizaminin "Xosrov və Şirin" poemasının əsas qəhrəmanlarından biri. Neman – Ərəb sərkərdəsi, Sasani hökmdarlarının Yəməndəki canişini Neman ibn Münzir. Tarixi xronikalara görə, V Bəhramın (421-438) müasiri olmuşdur. Suhan – bezdirən, xoşa gəlməyən, İrəc – İranın əfsanəvi hökmdarlarından Fəridunun oğlu. Fəridunun rəhbərliyi altında dəmirçi Gavə zalım Zöhhakı taxtdan salmışdır. Səlm – Fəridunun oğlu, İrəcin qardaşı və qatili. Zal – "Şahnamə" qəhrəmanlarından Rüstəmin atası. Sam – Zalın atası, Rüstəmin babası, Hikmətin mənşuru – ağıllı, hikmətli adamlar haqqında şah fərmanı. İskəndər – e.ə. 356-323-cü illərdə yaşamış Makedoniya hökmdarı. Məşhur yunan filosofu Aristotelin tələbəsi olmuş, 336-cı ildə hakimiyyətə keçmiş, 13 il ərzində Dunay çayından Hindistana qədər nəhəng bir ərazini işğal etmişdir. Dünya ədəbiyyatında çox vaxt qüdrətli, məğlubedilməz, müdrik sərkərdə rəmzi kimi istifadə edilmişdir. Çeşmeyi-heyvan – əbədi dirilik suyu.

16. Məhü sal – ay və il. Mehdi – hərfən: hədiyyə edilmiş, rəhbərlik edilmiş. İslam tarixində müxtəlif sifətlərlə səciyyələndirilən imam. Sünni

məzhəbinə görə Mehdi dünyanın axırıncı, "qiyamət günü"nü xəbər verəcəkdir; o, Məhəmmədin axırıncı davamçısıdır. Şiə məzhəbində Mehdi "qeyb olmuş" imam hesab olunur; guya o, yer üzərindəki bütün müsəlmanları xilas edəcək on ikinci şiə imamıdır. Qətran birinci rəvayəti nəzərdə tutur. Dəccal – mifologiyaya görə, qiyamət gününə bir az qalmış zühur edəcək *Mehdiyə* və dindarlara qarşı mübarizə aparacaq, lakin axırda məğlub olacaq şər qüvvə. "Bibliya"dakı antixrist surəti ilə adekvatdır. Xisal – xasiyyət, davranış, təbiət. Biəmsal – saysız-hesabsız, Fidan – budaq. Nihal – meyvə. Vəbal – burada: əzab, əziyyət.

17. Tərsa – xaçpərəst, xristian.

20. Fərvərdin – İran hicri-şəmsi təqviminin 21 mart – 20 aprelə uyğun gələn ilk ayı. Şəraiq – xoruzgülü. Tibet – bax: bu bölmənin 14-cü şerinə aid izah. Şüştər – İranın cənubunda Xuzistan vilayətində şəhər. Gözəl təbiəti və zəngin musiqi həyatı ilə məşhur olmuşdur.

21. Kanun – Suryani təqvimində ay adı (kanuni – əvvəl: dekabr; kanuni – sani: yanvar). Qarun – əfsanəyə görə çox dövlətli olmuş, Musanın qarğışı nəticəsində xəzinəsi ilə birlikdə yerin təkinə getmişdir; xəzinələrinin açarlarını bir neçə qüvvətli adam güclə gəzdirirmiş. Azər – İbrahim Xəlil peyğəmbərin atası. Guya ağacdan bütlər yonub hazırlayan dülgər imiş. Gənci-badavərd – təsadüfi tapılmış xəzinə, mal-dövlət.

23. Ruz – gün. Peykan – oxun ucundakı iti uclu dəmir.

24. Dəni – alçaq adam.

28. İskəndər onun şahlığını haqlı buyurdu – çox güman ki, İskəndərlə Bərdə hökmdarı Nüşabənin görüşü və İskəndərin onu təqdir etməsi nəzərdə tutulur.

29. Qulam – nökər, qul, kölə. Süpəhdar – ordu başçısı, sərkərdə. Qəmxar – dərdə şərik olan, təsəlli verən, dost. Sən ilə qazandım, ey dost, bu böyük şəhərdə şöhrət – Qətran Təbrizi "ölkə yerinə çox vaxt "şəhər" işlədir. Alicaha – uca rütbəli, yüksək mənsəbli.

32. Xürdü xab – yeyib yatmaq, Mahrüxsar – ayüzlü (gözəl). Tənab – ip, kəndir.

33. Məhliqa – ayüzlü (gözəl).

35. Onun müşk saçan nərgizini yad etsəm Qoşa bu nərgizimin lalə rəngli dürrü axar – Bu misralarda *nərgiz* – göz mənasındadır. Beytin mənası: onun müşk kimi ətir saçan gözlərini yad etsəm, gözlərimdən lalə rəngli (qanlı) dürlər (göz yaşları) axar. Xar – Burada: tikan.

37. Didə – göz. Vüslət – sevənin öz sevgilisi ilə görüşməsi, ona çatması.

38. Türk – Burada: gözəl.

61. Turan – Qədim dövrlərdə və orta əsrlərdə türkdilli xalqların yaşadıqları nəhəng əraziyə verilən ad. Firdovsi "Şahnamə"sinin mifik bölməsində İran pəhləvanlarının əsas rəqabət obyekti olan ölkə.

84. Fəridun – İranın qədim əfsanəvi şahlarından, Firdovsi "Şahnamə"-sinin qəhrəmanlarından biri. Qüdrət, var-dövlət, ehtişam və əzəmət rəmzidir.

C ə m ş i d – Yaxud C ə m. Əfsanəyə görə, birinci İran padşahı olmuşdur. Bir çox mədəni adət-ənənələrin yaradılmasını məhz ona aid edirlər. Guya hakimiyyətinin sonunda lovğalanıb özünü Allah səviyyəsində tutduğu üçün cəzalanmış, zalım *Zöhhak* onu məğlub edərək taxt-tacını əlindən almışdır. F ə z l u n (?-1091, Bağdad) – Bir müddət Gəncədə hakimiyyət sürmüş hökmdar.

95. B ə d ə l – əvəz.

96. B ü t p ə r ə s t – bütlərə sitayiş edən adam.

97. H ə f t x a n – *Rüstəmin* Key-Kavusu azad etmək üçün Mazəndarana gedərkən qarşısına çıxan yeddi maneə. Mifik pəhləvan bu yeddi tilsimin hamısını aradan götürüb, səfərini sağ-salamat başa çatdırmışdı. Digər yeddi qoçaqlığı isə bacılarını əsirlikdən qurtarmaq üçün Turana gedən İsfəndiyar etmişdir.

100. M ə h ş ə r g ü n ü – dini etiqada görə, qiyamət günü; axirətdə insanların toplaşıb "haqq-hesab" verəcəyi gün.

## ŞİHABƏDDİN SÜHRƏVƏRDİ

6. K ə b ə (Ərəbcə: "kub şəkilli") – Məkkədə müsəlmanların müqəddəs məbədi. Şərq tərəfində müsəlmanların məşhur fetişi – Qara daş (həcər) qoyulmuş yer vardır. *Zəmzəm* quyusu da Kəbənin yanındadır. Yer kürəsinin harasında olmasından asılı olmayaraq namaz qılan müsəlman üzünü Kəbəyə tərəf tutmalıdır. M i n a d a ş i k a r ı o v l a m a z l a r. Məkkənin 8 kilometrliyində yerləşən Mina vadisində adətən Həccə gedənlər öz qurbanlarını kəsirlər.

## ƏBÜL-ÜLA GƏNCƏVİ

1. B u Ə l i D ə q q a q – X əsrdə yaşamış məşhur müsəlman alimi Həsən bin Məhəmməd bin Dəqqaq Nişaburi. B u Ə l i S i n a – Əbu Əli Hüseyn ibn Əbdüllah ibn Sina (980-1037; latınca: Avitsenna) – Orta əsrlərin ensiklopedik alimi. 300-ə yaxın əsərinin çoxunu ərəbcə, az hissəsini isə farsca yazmışdır. "Əl-qanun fit-tibb", "Kitab əş-şifa" kimi əsərləri indi də öz elmi əhəmiyyətini itirməmişdir. Ərəb və fars dillərində şeirlər də yaşmışdır. Onlardan ən məşhuru "Qəsidət-ən-nəfs" adlı böyük qəsidədir. Fəlsəfi dünyagörüşünə görə materialist – panteist olduğundan, kafir hesab edilərək təqib olunmuşdur. S ə n a i (Əbül-Məcd Məcdud ibn Adəm 1070-1140) – Qəznədə yaşayıb-yaratmış məşhur sufi şairi. 1113-cü ildə yazdığı "Hədiqətül-həqayiq" ("həqiqətlər bağçası") poeması bir çox şairlərə ilham vermişdir. Nizaminin "Sirlər xəzinəsi" poeması da bu əsərə" cavab vermişdir. Nizaminin "Sirlər xəzinəsi" poeması da bu əsərə cavab şəklində yazılmışdır. N ə d i m – keçmişdə böyük bir şəxsi (adətən sarayda hökmdarı) gözəl sözlərlə, qəribə və gülməli hekayələrlə əyləndirən adam. Ə y y u b – Quranda adı çəkilən, çox əzab-əziyyət görsə də, səbri sayəsində Allahın mərhəmətini qazanmış peyğəmbər. T ö v r a t (Qədim yəhudi dilində: "Qanun") – xristianların və yə-

hudilərin müqəddəs kitabı olan "Bibliya"nın birinci hissəsi, "Əhdi-ətiq"in üç bölməsindən biri. İ n c i l (Əsli: "Yevangeliyon". Yunan dilindən tərcümədə: "Xoş xəbər") – Nisus Xristos (bax: *Məsih*) haqqında ilk xristian rəvayətlərinin məcmusu. Dini ənənəyə görə, Allah tərəfindən yer üzünə göndərilmiş dörd kitabdan biri sayılır və I-II əsrlərdə yarandığı güman edilir. İ b r a h i m – dini əsatirə görə, müstəbid Nimrud İbrahimi tonqala atıb işgəncəylə öldürmək istəmiş, lakin odlar gülzara dönmüş. İbrahim salamat qalmışdır. M e r a c g e c ə s i – dini əsatirə görə, hicri (qəməri) təqvimi ilə rəcəb ayının 27-dən 28-nə keçən gecə *Məhəmməd* Cəbrayılın gətirdiyi əfsanəvi minik heyvanı *Büraqa* minərək göylərə getmiş və Allahla söhbət etmişdir. Z ə m z ə m – Kəbə yaxınlığında dadlı şirin suyu ilə məşhur olan quyu. Guya ilk dəfə onu İbrahim Xəlil peyğəmbər üzə çıxarmış, sonralar isə Məhəmmədin babalarından biri yenidən qazıb təmizləmişdir. M ə h ə m m ə d (570, Məkkə – 632, Mədinə) – bəşəriyyət tarixində son din sayılan islamın banisi. Ayrı-ayrı ərəb qəbilələrini monoteist dini ideologiya altında birləşdirib qüdrətli teokratik dövlət yaratmışdır. 622-ci il sentyabrın 22-də Məkkədən Mədinəyə köçməsi (hicrət) islam təqviminə görə mədəni tarixin başlanğıcı hesab edilir. Y u s i f q u r d u – Qətran Təbrizi bolməsindəki 14-cü şərhə baxmalı. Y ə h y a – İsadan qabaqkı peyğəmbər. Ədalətli və xeyirli sözlərinə görə Bəni-İsrail (yəhudi) padşahı tərəfindən öldürülmüşdür. B ə ş a r ə t – xoş xəbər, müjdə.

3. K e y x o s r o v – Qədim İran əfsanələrinin və Firdovsi "Şahnamə"sinin əsas qəhrəmanlarından biri. Hökmranlığı dövründə İranı böyük imperiyaya çevirmiş, lakin fəaliyyətinin zirvə çağında şahlıqdan imtina edib boranlı və qarlı dağlarda yox olmuşdur. K e y q u b a d – İran *Kəyan* sülaləsinin birinci şahı və bu sülalənin banisi sayılır. Rəvayətə görə, qırx ildən artıq hakimiyyət sürmüşdür. *Rüstəm* onun xidmətində olmuş və *turanlılarla* müharibələrdə böyük qələbələr əldə etmişdir.

## XAQANİ ŞİRVANİ

1. M e r a t ü s - s ə f a – Şadlıq aynası. Xaqaninin bu qəsidəsindəki beytlər orijinalın dilində "şin" (ş) hərfi ilə bitdiyindən "Qəsideyi-şiniyyə" adı ilə məşhur olmuş, bir çox Şərq şairləri ona bənzətmələr yazmışlar. N ə h ə r q ə t r ə o l a r n i s a n , n ə d ə r y a s ə d ə f k a n ı . "Nisan" – yaz yağışı, "kan" – bir şeyin çıxdığı və olduğu yer, bir şeyin bol olan yeri. Misranın mənası: Nə hər qətrə yaz yağışı olar, nə də hər dəryadan sədəf çıxar (sədəfin tək-tək ümmandan çıxdığına işarədir). G ə ş t i – gəmi. C u d i d a ğ ı – Əsatirə görə, dünya tufanı zamanı *Nuh* peyğəmbərin gəmisi Cudi dağının başında sahilə çıxmış, Nuha inanmayanlar isə suda batıb məhv olmuşlar. Xaqani bu beytdə öz dizinin üstünü xilaskar Nuh gəmisinə oxşar bir məktub adlandırır, dizi üstündə qələmindən axıdıb yazdığı dərdlərini də tufan yağışı ilə müqayisə edir. X ı z r – Əsatirə görə, peyğəmbərlərdən biri olmuşdur. Nağıllarda "Xıdır

Nəbi" (peyğəmbər) adlanır. Ədəbiyyatda Xızrın zülmətə getməsi və abihəyatdan (dirilik suyundan) içməsi əfsanəsi bir çox hallarda İskəndərlə bağlanır. T ə v i l – zahiri mənasından savayı başqa bir məna ifadə etmə. A d ə m ü s y a n ı – əsatirə görə, Adəm bəşəriyyətin atası, dünyada ilk insan və ilk peyğəmbərdir. Guya Allah hər cins torpaqdan bir az qarışdıraraq Adəmi yaratmış və sonra onun böyründən Həvvanı çıxartmışdır. Cənnətdə yaşayan Adəm və Həvvaya buğda yemək qadağan edilmişdir. Bir gün şeytan onları aldatmış və buğda yemişlər. Buna görə də cənnətdən qovulmuşlar. Ə b c ə d – Ərəb əlifbasının qədim sırasını göstərən səkkiz sözün, habelə bu sıradakı birinci hərfin şərti adı. Hərfləri mexaniki əzbərləmək üçün işlədilirdi. Ümumiyyətlə, keçmişdə "əlifba" mənasında işlənmişdir. "Əbcəd hesabı" – müəyyən bir tarixi və ya rəqəmi ərəb hərfləri vasitəsilə ifadə etmə üsuludur. T ə c r i d ə b c ə d i n i yazmaq dünya həvəslərindən və nəfsin tələblərindən əl çəkib, guşənişin olmaq deməkdir. Xaqani saray həyatının rəzalətlərinə dözməyərək tək və sərbəst yaşamaq üçün Şirvanşahlar sarayından gizlin çıxıb getmiş və yolda tutulub həbs edilmişdir. Beytin mənası: uşaqlar öz dərslərini rəngli qələmlərlə yazdıqları kimi, mən də "təcrid dərsi"ni qanlı göz yaşlarımla solğun üzümə yazdım (Bax: *Xaqani.* Seçilmiş əsərləri. – Bakı, 1978, s. 289). N e c ə F i r o n d a n M u s a q a ç ı r d ı... Əfsanələrə görə, Musa peyğəmbər Misir fironunun qızı tərəfindən tərbiyə edilmiş, böyüdükdən sonra bir israillini müdafiə edərkən misirlini vurub öldürdüyünə görə Fironun cəzasından qorxub qaçmışdır. Z ə n d A v e s t a – Zərdüştilərin e.ə. VI – IV əsrlərdə yarandığı güman edilən "Avesta" adlı orta fars dilində dini kitabları. Son redaksiyası Sasani hökmdarı II Şapur (310-379) dövründə hazırlanmış və dövlətin rəsmi dini kitabı sayılmışdır. "Avesta"nın mətni VII əsrdə İrandan Hindistana qaçmağa məcbur olmuş zərdüştilərdən – parslardan əldə edilmişdir. F ə l ə k d ə v a r s a d a b i r c ü t ç ö r ə k... Günəş və Ay nəzərdə tutulur. Kömbə kimi yumru və sarı olduqlarından şair onları çörəyə bənzədir. Ə h m ə d i - m ü r s ə l – hərfi mənası: tərifli göndərilmiş. *Məhəmmədə* işarədir. Nun – v ə l q ə l ə m – Quran ayəsinin ilk ifadəsi. Şərhçilərin fikrincə, mürəkkəbqabı və qələm mənasını ifadə edir. A r ı s a n c a r s a d a b ə z ə n... Quranın 16-cı ("Ən-nəhl" – Bal arısı) surəsinə işarədir. B i j ə n – "Şahnamə" qəhrəmanlarından *Rüstəmin* nəvəsi. Guya Turan hökmdarı *Əfrasiyabın* qızı Mənijəyə aşiq olduğu üçün quyuya salınmış, yeddi ildən sonra babası onu azad etmişdir. Ə f r a s i y a b – "Şahnamə" qəhrəmanlarının ənənəvi düşməni, Turan hökmdarı. Mahmud Kaşğarinin verdiyi məlumata görə, türkcə adı Alp ər Tonadır. G a v ü M a h i – öküz və balıq. Əsatirə görə yer balığın və öküzün üzərində dayanırmış. M ə l i k ş a h (1072-1092) – Böyük Səlcuq imperiyasının hökmdarlarından biri. Onun hakimiyyəti Kaşğardan Aralıq dənizinə, Qafqaz və Aral dənizindən İran körfəzinə qədər uzanmışdı. Elm və incəsənətə hamilik edən hökmdar kimi şöhrət qazanmışdır. Q ə d ə r x a n – Səmərqənd hakimi Q ə d ə r x a n (yaxud Q ə d i r x a n) C ə b r a y ı l. 1101-1102-ci ildə 17 yaşlı Soltan Səncərə 100 minlik qoşunla hücum edən Qədər xan ovda ikən *Səncərə*

əsir düşmüş və edam edilmişdir. Səncər (1119-1157) – Böyük Səlcuq imperiyasının son hökmdarı İmperiyanın şərqini idarə etmiş, 1154-cü ildə oğuz qəbilələri ilə vuruşmada məğlub olaraq əsir düşmüşdür. 1156-cı ildə əsirlikdən qaçaraq öz paytaxtı Mərvdə ölmüşdür. Gurxan (Əsli: Qurxan) – erkən orta əsrlərdə bir sıra türk xalqları arasında qəbilə və tayfa ittifaqlarına (qurumuna) başçılıq edən xanın titulu, 8 qəbilənin könüllü birləşməsindən ibarət olan qaraxitayların hökmdarı "Qurxan" titulunu daşımışdır. 1141-1142-ci illərdə Sultan Səncərlə vuruşmada qalib gəlmişdir.

2. Şah Tuğan (998-1015) – Şahinlər şahı (Müqayisə et: Şahmar – İlanlar şahı). Qaraxanilər sülaləsindən olan Orta Asiya hökmdarı. Büraq – Merac gecəsi Məhəmmədin minib göylərə uçduğu əfsanəvi minik heyvanı. Miniatürlərdə o, insan başlı, at bədənli qanadlı varlıq kimi təsvir edilir. Mərdüm-giya – badımcana bənzəyən zəhərli bitki. Misirin əzizi – məşhur "Yusif və Züleyxa" süjetinin qəhrəmanlarından biri, Misir fironunun vəziri, Züleyxanın əri. Guya o, Yusifi satın alaraq Züleyxaya qul edibmiş. Ad qoşunu – Quranda haqqında bəhs edilən əzəmətli, lakin dinsiz bir tayfa. Dini rəvayətə görə, peyğəmbərləri Hudun haqq yola çağırışını qəbul etmədiklərindən. Allah onların nəslini kəsmişdir. Yəcuc tayfası – əfsanəyə görə, dünyanın qurtaracağında yaşayıb dinc əhaliyə tez-tez hücum edən vəhşi, adamyeyən tayfa. İskəndər onları mədəni dünyadan ayırmaq üçün dəmirdən keçilməz hasar çəkibmiş.

4. Mahmud – Orta əsrlərin məşhur hökmdarlarından Sultan Mahmud Qəznəvi (999-1030). Atası Səbük Təkini Qəznə hökmdarı *Alp Təkin* qul kimi satın almış, lakin fövqəladə dərəcədə bacarıqlı olduğunu görüb öz qoşunlarına komandan təyin etmişdir. (Bax: *İslam ensiklopediyası*, 7-ci cild. İstanbul, Maarif nəşriyatı, 1957). Səlcuq – Oğuzların qınıq tayfasının başçısı, Səlcuqilər sülaləsinin (XI-XIV əsrlər) eponimi. Türk sərkərdəsi olmuş, X əsrin sonlarında öz tayfası ilə islam dinini qəbul etmişdir. 100, yaxud 107 yaşında ölmüşdür (Bax: Sədrəddin Əli əl-Hüseyn. *Əxbar əd-dövlət əs-Səlcuqiyyə*. – M., 1980). Bəhmən – İranın Əhəmənilər sülaləsindən olan hökmdar. Daranın atası. Əbu Hənifə (699-767) – Kufədə yaşamış məşhur müsəlman fiqh alimi, Hənəfi məzhəbinin banisi. Şafei (767-820) – Rəvayətə görə, Əbu Hənifə ölən gecənin səhəri anadan olmuş, Şafei məzhəbinin əsasını qoymuşdur.

6. Zünnar – müsəlman dövlətlərində yaşayan yəhudi və xristianların fərqlənmək üçün bağladıqları xüsusi qurşaq. Kövsər – dini əfsanələrə görə, behiştdə axan dörd bulaqdan biri; Quranın 108-ci surəsinin (Əl-Kövsər) adı.

7. Şahi-Mərdan (Mərdlərin şahı) – Şiə imamı Əlinin adlarından biri. Üç pillədən sonra insan yarandığı kimi də, – Üç kitabdan sonra nazil oldu dünyaya Quran. Üç pillə – minerallar, bitkilər və heyvanlar; üç kitab: Tövrat, Zəbur və İncil. Qubad oğlu Nuşirəvan – Bax: *Ənuşirəvan.* Cəbrayıl – Dini əsatirə görə,

Allaha ən yaxın olan mələklərdən biri. Ona çox vaxt *Ruhül-qüds* və *Ruhüləmin* də deyirlər. Güya Quranı Məhəmmədə o çatdırmış, merac gecəsi *Məhəmmədə* minik gətirmiş, İsanın doğulması onun Məryəmin biləyindən üfürməsi nəticəsində baş vermişdir.

8. "Qiyasəddin Məhəmməd ibn Məlikşahın tərifi" qəsidəsi başdan-ayağa "ayinə" rədifi üzərində qurulmuş məcazlar sistemindən ibarətdir. Rəcm – daşqalaq. Həras – qorxu.

9. Mənuçöhr (1120-1160) – Bir çox Şirvan şairlərinin, o cümlədən Xaqaninin də hamisi Şirvanşah III Mənuçöhr. Axsitan (1160-1197) – III Mənuçöhrün oğlu, Şirvanşah I Axsitan. Behiştin dörd çeşməsi – əsatirə görə, behiştdə mömin müsəlmanlar üçün dörd çeşmə (çay) – su, süd, bal və şərab çeşmələri axır.

10. Vəqvaq – donqultu. Namiyə – vegetasiya; qovuşub inkişaf etmə. Bənatünnəş – Böyük Ayı bürcü.

11. Ədən – Cənubi Ərəbistanda (indiki Yəməndə) sahil şəhəri. Əhalisi qədim dövrlərdən dəniz ticarəti ilə, xüsusən dəniz mirvarisi istehsalı ilə məşğul olmuşdur. Klassik poeziyada "Ədən dürrü" məşhur olmuşdur. Zülfiqar (Əsli: *Zülfəqar* – onurğalı) – rəvayətə görə, *Məhəmmədin* Bədr yaxınlığındakı vuruşmada qənimət aldığı, sonralar isə *Əliyə* məxsus olan qılınc. İkiağızlı olduğundan ona Zülfəqar deyirmişlər.

12. Zərdüşt – Zərdüştiliyin banisi. Rəvayətə görə, muğlar sülaləsindən olub e.ə. VII əsrdə doğulmuşdur. Sonralar atəşpərəstlikdə islahat aparmağa cəhd etdiyinə görə təqiblərə məruz qalıb, Şərqi İrana qaçmağa məcbur olmuşdur. "Avesta"nın (bax: *Zənd Avesta*) müəllifi hesab edilir.

13. Deyləm – İranın şimalında Gilan əyalətinin bir hissəsini təşkil edən dağlıq ərazinin adı. Əhalisi IX-X əsrlərin siyasi hadisələrində mühüm rol oynamışdır.

14. İndi söz günəşi aləmdə mənəm; Şairlərdən üç qat ucadır rütbəm. – Şərq astroloji təsəvvürlərinə görə, Günəş yeddi təbəqədən ibarət olan göylərin dördüncü qatında yerləşir. Xaqani özünü söz günəşi adlandırmaqla dördüncü təbəqədə, yəni başqa şairlərdən üç qat yuxarıda durduğunu iddia edir.

17. Tuba – əfsanəyə görə, behiştdə bitən ağac.

18. Qənbər – *Əlinin* ən yaxın və sədaqətli köməkçisi.

19. Məryəm – İsa peyğəmbərin (Bax: *Məsih*) anası. Zəhra (hərfən: gözəl, parlaq) – Məhəmmədin böyük qızı, Əlinin arvadı, Həsən və Hüseynin anası (Fatimeyi-Zəhra). Züleyxa – Yusifin sevgilisi. Əfsanəyə görə, Yusif şöhrətə çatandan sonra qoca qarı olmuş Züleyxa onun yanına gəlir və Allaha yalvarır ki, cavanlaşıb Yusifə qovuşsun. Allah onun xahişini yerinə yetirir. Nəcaşi – Həbəşistan imperatorlarının titulu. Üveys (ərəbcə: qurd) – Məhəmmədin müasiri və tərəfdarı olan Bəni Murad tayfasından Üveys Qərni. Süfyan döyüşündə şiə imamı Əlinin tərəfində vuruşaraq 657-ci ildə öldürülmüşdür (Bax: *Əli Əkbər Dehxuda*. Lüğətnamə, Tehran, 1318, 5-ci cild).

21. Bokrat – Qədim Yunanıstanın tibb alimi Hippokratın ərəbcə adı. E.ə. V əsrdə yaşadığı güman edilir. Əsərləri bütün dünyada məşhurdur. Qaf dağı – Yaxın və Orta Şərq folklorunda, eləcə də islam kosmologiyasında dünyanın ətrafını əhatə edən uca və keçilməz bir dağ. Əfsanəvi Ənqa quşunun da Qaf dağında yaşadığı güman edilirdi. Rəfrəf – Bu söz haqqında şərhlər mübahisəlidir. Şərhçilərin çoxunun fikrinə görə, Məhəmməd *Merac* gecəsi göyə əvvəl *Büraqla*, sonra isə Rəfrəflə getmişdir.

22. Ələm-yəcidkə – Səni tapmadımı? Rəvayətə görə, Məhəmməd uşaqlıqdan yetim qalmış, əmisi Əbu Talib (Əlinin atası) Onu tapıb tərbiyə etmişdir. Vənnas – Quranın axırıncı surəsinin son sözüdür. “Vənnas”a çatmaq – Quranı oxuyub başa çıxmaq deməkdir. Mübərrid (826-898) – Orta əsrlərdə ərəb dili üzrə məşhur alimlərdən biri.

23. Səfidrud çayı – İranda çay adı. Kuhistan İranın dağlıq hissəsi. Xuzistan – İranın şəkər qamışı ilə məşhur olan cənub vilayətlərindən biri. Zöhrak – şahlığı qanunsuz olaraq Cəmşiddən zəbt etmiş mifik İran hökmdarı. Guya iblislə əlaqəyə girdiyinə görə çiynindən çıxmış iki ilana insan beyni yedirirmiş. Min il hökmranlıq etdikdən sonra *Gavə* üsyan edərək onu taxtdan salmış və tacı qanuni varisinə – *Fəriduna* vermişdir.

24. Yarım hilal – dodaq. Yun – xırda pul. Hübab – köpük.

29. “Zər” sözündə var iki hərf, heç qovuşmaz – Ərəb əlifbası ilə “Zər” sözü (زر) bir-birindən ayrı yazılan “z” və “r” hərflərindən ibarətdir. Samiri tiynətliyəm, Musa təbiət olmaram – Quranda Musa ilə bağlı rəvayətlərdən birinə işarədir. Guya samiri tayfası qızıldan bir buzov düzəldib ona Allah kimi səcdə edirmişlər. Kimüxt – maya. Xüftan – pambıqlı arxalıq. Noğala – dəvə üçün yoğrulub hazırlanan yemək. Qara daş – Bax: *Kəbə*. Bu – Ləhəb (hərfən: alovun atası, yəni cəhənnəmlik) – Əsl adı Əbül-Üzza bin Əbdül-Müttəlibdir. *Məhəmmədin* dayısı və düşməni. Quranda axırıncı surələrdən biri Əbu-Ləhəbin qarğışına həsr edilmişdir.

30. Sur – dini əsatirə görə, qiyamət günü İsrafil adlı mələyin çalaraq bütün ölənləri oyadacağı şeypurun adı. Guya Sura bircə dəfə üfürüləcək, Yer üzü parçalanacaq, dağlar yerindən oynayacaq, göylər dağılıb töküləcək, mələklər göyün ətrafında düzüləcəklər. Necə iki əlif durar bir “ətəna” sözündə, “Tən”in o cür dayanmışam arxasında, önündə. “Tən” sözü ərəb əlifbası ilə bu cür (طعن) – “ətəna” sözü isə bu cür (اطعنا) yazılır. Xaqaninin bu beytini M.Ə.Sabir məşhur “Şəkibayi” şerində ustalıqla işlətmişdir: Seylitən öylə təməvvüclə alıb dövrü bərim, Bənzərəm bir qocaman dağa ki, dəryadə durar!.. Durmuşam pişü pəsi-təndə, Sabir, necə kim, o əliflər ki, pəsü pişi-ətənadə durar. Abbasilər – öz köklərini Məhəmmədin dayısı Abbasa bağlayan ərəb müsəlman xəlifələri sülaləsi (750-1258). Sülalənin banisi Əbül-Abbas əs-Səffahdır. Xaqaninin yaşadığı dövrdə xilafətə onlar başçılıq edirdilər. Səlcuqilər – XI-XIV əsrlərdə bir sıra Yaxın və Orta Şərq ölkələrində hökmranlıq etmiş türk sülaləsinin sultanları. Yəhuda, İbn Yəmin – Yusifin qardaşlarından ikisinin adı. Yəhuda ögey, İbn Yəmin

isə doğma qardaşdır. İ u d a – xristian dini əfsanəsinə görə, İsa peyğəmbərin 12 şagirdindən biri – İuda İskariot. Guya 30 gümüşə öz müəllimini satmış, onun gizlincə ələ keçirilməsinə imkan yaratmışdır. Ədəbiyyatda satqın, xain obrazı kimi istifadə olunur. B ə t l i m u s – eramızın II əsrində yaşamış qədim yunan alimi Klavdi Ptolomey. Kainatın quruluşu haqqında təlimi (geosentrik sistem) "Əl-məcisti" adlı riyazi-astronomik əsərində öz əksini tapmışdır.

32. Q u r e y ş i l ə r – Məhəmmədin mənsub olduğu ərəb qəbiləsi. Peyğəmbər Məkkədə yaşayan bu qəbilənin Haşimilər ailəsindən çıxmışdır.

33. C e y h u n – Amu-Dərya çayının ərəbcə adı.

36. İ l a n d a n q a ç d ı f i r o n, m ə n z ö h d ə q i d ə s i n d ə n – dini rəvayətə görə, Musa əlindəki əsanı yerə atarkən əsa əjdahaya (ilana) çevrilmiş və Firon bundan qorxaraq qaçmışdır.

42. Ə b u - C ə h l (hərfən: Avamlığın (cəhalətin) atası – Əsl adı Əbül-Həkəm Əmr bin Hişamdır. *Qureyşilər* qəbiləsindən çıxmış, Məkkədə yaşamışdır. *Məhəmmədin* ən qızğın əleyhdarlarından biri olmuşdur.

47. Ə n a n – cilov.

56. T ə v i z – həmayil, gözmuncuğu. Ş ə r ə f – qığılcım. M ə c ə r – üz örtüsü (qadınlarda).

57. M ə d a i n (hərfən: şəhərlər) – Bağdaddan 30 km Cənubda Dəclə çayının hər iki sahilində salınmış qədim İran şəhəri. *Sasanilərin* qış sarayları burada idi. Orta fars dilində: Ktesifon. D ə n d a n – diş. H ü r m ü z – İran mifologiyasında və zərdüştilərin dini görüşlərində xeyir Allahı Ahura Məzda – Əhrimənin ziddi; Sasani şahlarından *Xosrov Pərvizin* atası. Ə t ş a n – susuz. "K ə m t ə r ə k u" – Quran ayəsi. Tərcüməsi: çox tərk etmişlər. Ş i r i n – Xosrov Pərvizin sevgilisi və arvadı. Nizami Gəncəvinin "Xosrov və Şirin" poemasının qəhrəmanı. C ə m r ə (hərfən: kiçik daş parçası) – ziyarətdən gələn hacılar Məkkə yaxınlığındakı Mina vadisinə daşlar atırlar ki, bunlar yığılıb təpə əmələ gətirdiyi yerlərə *Cəmrə* deyilir. Üç Cəmrə vardır ki, ziyarətçilər bunların hər birinə yeddi daş atmalıdırlar. Ş ə t t – Yaxın Şərqdə çay adı.

61. H ə v a r i y y u n – hamilər, köməkçilər. *Məhəmmədin* Mədinəyə hicrəti zamanı ona tərəfdar çıxan 12 adam. Analoji hal xristianlıqda da müşahidə edilir: İsanın 72 həvarisi olmuşdur. Xaqanidə bu söz m ö m i n x r i s t i a n mənasında işlədilmişdir. Ş ə r ə f a n d i ç ə n i n v a v ı n d a d ı r, b i l – "Vav" (v) hərfi ərəb dilində andın ön hissəciyidir. Məsələn, "Allaha and olsun" ifadəsi bu dildə "vallah" kimi səslənir.

68. F ə r r u x i (?-1038) – Sultan Mahmud Qəznəvinin (bax: *Mahmud*) və oğlanlarının saray şairi.

107. Q a q i m , Q u n d u z – yumşaq xəz dərili heyvanlar. B o l q a r ı s t a n t ü r k ü – VII-XV əsrlərdə Volqa boyunda mövcud olmuş əzəmətli türk-bolqar dövləti və orada yaşayan zahirən gözəl türklər nəzərdə tutulur.

114. Ə r c i ş – Van gölünün və onun kənarındakı şəhərin qədim adı. Hazırda həmin şəhər dağılmış, yerində yalnız bir qəsəbə qalmışdır.

